# Mündəricat

## MÖVZÜ ۴۰ HƏQİQƏT ۴۰

### KİTAB HAQQINDA

Kitabın adı:۴۰ mövzu ۴۰ həqiqət

:Müəllif

Naşir:Şəhriyar

Çap tarixi:۲۰۰۸

Səhifələrin sayı:۱۰۵

Çap növbəsi:Birinci

Tirajı:۳۰۰۰

səh:۱

### QIRX" KƏLMƏSİ HAQQINDA QIRX İNÇƏLİK"

۱- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs qırx gün müddətində əməllərini ixlasla yerinə yetirsə, elm və hikmət çeşmələri onun qəlbindən dilinə cari olar.”(۱)

۲- İmam Baqir (ə) buyurmuşdur: “İnsan qırx gün müddətində imanını Allah üçün xalis etsə, Allah-taala onu dünyaya qarşı rəğbətsiz (zahid) edər, dünyanın dərdini və dərmanını ona tanıtdırar, daha sonra hikməti onun qəlbində möhkəmləndirib, dilini hikmət ilə danışığa gətirər.”(۲)

۳- Fəzl ibni Yəsar deyir: İmam Baqir (ə)-ın belə buyurduğunu eşitdim: “Hər kəs şərab içsə, namazı qırx gün ərzində qəbul olunmaz.”(۳)

۴- İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs mömin qardaşlarından qırx nəfəri dua etdikdən sonra özünü dua etsə, onun hər iki duası qəbul olunar.”(۴)

۵- İmam Sadiq (ə) buyurmuşdur: “Bir mömin şəxs dünyasını dəyişdikdə, qırx nəfər mömin şəxs dəfn mərasimində iştirak edib, onun mömin olduğuna şəhadət versələr, Allah-taala onu bağışlayar.”(۵)

۶- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Bir şəxsin biz Əhli-beytə məhəbbət barədə yaydığı qırx hədis, onun sədəqə verdiyi qırx min dinardan (qızıl puldan) üstündür. Allah-taala ona hər bir hədis üçün bir peyğəmbərin savabını, hədisin hər bir hərfi üçün isə qiyamət günü bir nur verər.”(۶)

۷- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ümmətimdən hər kəs camaatın istifadə etməsi üçün qırx hədis əzbərləyərsə, Allah-taala onu qiyamət günü fəqih və alim halında gətirər.”(۷)

۸- Həzrət Peyğəmbəri-Əkrəm (s) imam Əli (ə)-a vəsiyyət edərək buyurmuşdur: “Ya Əli! Ümmətimdən hər kəs Allahın razılığını və axirət aləminin savabını qazanmaq məqsədilə qırx hədis əzbərləyərsə, Allah-taala onu qiyamət günündə peyğəmbərlər, övliyalar, şəhidlər və layiqli şəxslərlə birgə məhşur edər.”(۸)

۹- İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs halal və haram (işlər) barəsində bizim hədislərimizdən qırx hədisi hifz edərsə, Allah-taala qiyamət günü onu fəqih və alim

halında gətirər və ona əzab verməz.”(۹)

۱۰-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Mənim ümmətimdən hər kəs sünnədən qırx hədis əzbərləyərsə, qiyamət günü ona şəfaət edərəm.”(۱۰)

۱۱-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Vəfatından sonra qırx hədisi (başqalarının istifadə etməsi üçün yazılı şəkildə) qoyub gedən şəxs, cənnətdə mənim dostum olacaqdır.

۱۲--İmam Sadiq (ə) buyurmuşdur: “Şiələrimizdən hər kəs qırx hədisi hifz edərsə, Allah-taala qiyamət günündə onu fəqih və alim halında gətirər və ona əzab verməz.”(۱۱)

۱۳-Asiman imam Hüseyn (ə)-ın matəmində qırx gün ağlamışdır.

۱۴-İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs qırx gün “Əhd” duasını oxusa, imam-Zamanın əsgərlərindən olar. Əgər o həzrət zühur etməmişdən öncə ölsə, Allah-taala onu o həzrətə xidmət etmək üçün qəbirdən qaldırar.”

۱۵-İmam Kazim (ə) buyurmuşdur: “Qırx dəfə həcc əməllərini yerinə yetirən şəxsə (qiyamətdə): “İstədiyin şəxsə şəfaət et!” – deyilər.”(۱۲)

۱۶-İmam Baqir (ə) buyurmuşdur: “Allah-taala Fironun dediyi iki cümləyə görə onu qırx il möhlət verdikdən sonra cəzalandırdı: ۱-Firon dedi: “Sizin ən uca tanrınız mənəm!” ۲-“Mən sizin üçün özümdən başqa heç bir tanrı tanımıram!”(۱۳)

۱۷-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs ardıcıl olaraq qırx cümə günü cümə quslu versə, bədəni qəbirdə çürüməz.”

۱۸-Ana övladının Quran hafizi olması üçün hamiləlik dövründə “Camiə” ziyarətini və ya “Ali-Yasin” duasını qırx dəfə oxusun.

۱۹-Övladınızın Quran hafizi olmasını istəyirsinizsə, hamiləlik dövründə qırx dəfə gecə namazı qılın.

۲۰-Övladınızın Quran hafizi olmasını istəyirsinizsə, hamiləlik dövründə qırx dəfə cümə quslu verib, “Kisa” hədisini oxuyun.

Övladınızın Quran hafizi olması üçün hamiləlik dövründə hər gün qırx dəfə salavat-۲۱
.göndərin

İmam Hüseyn (ə)-ın qırxında (ərbəinində), o həzrəti ziyarət etmək müstəhəbdir. O-۲۲
həzrətin qırxında onu ziyarət edən ilk şəxs Cabir idi. Şiənin əlamətlərindən biri də
.“Ərbəin” ziyarətini oxumaqdır

İmam Sadiq (ə) buyurmuşdur: “Gecə-gündüz ərzində qırx böyük günaha batan-۲۳
(şəxs xeyir görməz.”(۱۴

Hər kəs “Ya Həyyu, ya Qəyyum, ya Mən la ilahə illa əntə birəhmətikə əstəğisu” –-۲۴
zikrini qırx gün müddətində və hər gün qırx dəfə (sübh namazı ilə onun nafiləsinin
.arasında) oxusa, qəlbinə heç vaxt aradan getməyən dirilik gətirər

İmam Sadiq (ə) buyurmuşdur: “Hər kim qırx gün heyva yesə, həmişə hikmətli sözlər-۲۵
”.danışar

İmam Əli (ə) buyurmuşdur: “Sizə qırx gün həlim yeməyi tövsiyə edirəm; çünki-۲۶
”.insanda ibadət ruhiyyəsini gücləndirir

İmam Kazim (ə) buyurmuşdur: “Hər kəs qırx cümə sübh vaxtı acqarına bir ədəd nar-۲۷
”.yesə, qəlbi işıqlanar

Həzrət Peyğəmbər (s) buyurmuşdur: “Hər kim nar yesə, qırx gün Şeytanı öz-۲۸
”.qəlbindən çıxarar

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Allaha və qiyamət gününə imanı olan-۲۹
(hər bir şəxs gərək bədənindəki artıq tükləri təmizləməyi qırx gün tərk etməsin.”(۱۵

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Övladınızı yeddi günlüyündə sünnət-۳۰
(etdirin; çünki yer sünnət olunmamış şəxsin bövlü ilə qırx gün nəcis qalır.”(۱۶

İmam Əli (ə) buyurmuşdur: “Məscidin həddi-hüdudu qırx ziradan(۱۷) ibarətdir və-۳۱
(dörd tərəfindən qırx ev ona qonşu sayılır.”(۱۸

İmam Sadiq (ə) buyurmuşdur: “Həqiqətən, Allah-taala qırx yaşına çatan şəxsi-۳۲

(əzizləyər və səksən yaşına çatan şəxsə əzab verməkdən həya edər."(۱۹

.Hər kəs "Ayətəl-kürsü"nü qırx gün oxusa, onun duaları qəbul olunar-۳۳

Hər kəs "Yasin" surəsini qırx gün ərzində qırx dəfə üzü qibləyə, həm də oturduğu-۳۴ .halda oxusa, onun hacəti qəbul olunar

Hər kəs "Həşr" surəsini qırx gün müddətində hər gün bir dəfə oxusa, onun hacəti-۳۵ .qəbul olunar

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "İki rəhim (bətn) qırx nəslə qədər bir--۳۶ ".birinə çatır

İmam Sadiq (ə) buyurmuşdur: "Elə bir mömin yoxdur ki, qırx gecə keçdikdən sonra,-۳۷ ".(qəflət yuxusundan) ayılmağa səbəb olan ağır bir hadisə ilə üzləşməsin



---

.Səfinətul-bihar", ۲-ci cild, səh. ۶۶۷" [۱] -۱

.Üsuli-kafi", ۳-cü cild, səh. ۲۷" [۲] -۲

.Xisal", ۲-ci cild, səh. ۳۱۱" [۳] -۳

.Yenə orada, səh. ۳۱۵ [۴] -۴

.Yenə orada, səh. ۳۱۷ [۵] -۵

.Camiul-əhadis", səh. ۵۸" [۶] -۶

.Üyuni əxbarir-Riza", ۳۱-ci bölüm, səh. ۳۷, hədis: ۹۹" [۷] -۷

.Xisal", ۲-ci cild, səh. ۳۲۳" [۸] -۸

Yenə də orada "Ərbəin" bölümü səh. ۵۴۲ [۹] -۹

.Yenə orada [۱۰] -۱۰

.Biharul-ənvar", ۲-ci cild, səh. ۱۵۳" [۱۲] -۱۱

.Xisal", ۲-ci cild. səh. ۳۳۰" [۱۳] -۱۲

.Yenə orada, səh. ۳۱۸ [۱۴] -۱۳

.Xisal", ۲-ci cild. səh. ۳۳۰" [۱۵] -۱۴

.Xisal", ۲-ci cild, səh. ۳۱۷" [۱۶] -۱۵

.Yenə orada [۱۷] -۱۶

۱۷- [۱۸] Bir zira təxminən ۴۸ sm-ə bərabər olan uzunluq ölçüsüdür.

۱۸- [۱۹] “Xisal”, ۲-ci cild, səh. ۳۲۷.

۱۹- [۲۰] “Yenə orada, səh. ۳۲۶.

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “(Bir vaxt gələr ki,) Bəni Üməyyə Əliyə-٣٨ lənət göndərərlər, ona görə də Allah-taala mələklərə əmr edər ki, onlara min dəfə artıq lənət göndərsinlər, həzrət Məhdi (ə) qiyam etdiyi zaman qırx il onlara lənət ”.göndərər

Şəriət qanunlarına müvafiq olan hər bir niyyətinizin qəbul olunması üçün qırx dəfə-٣٩ .“Zuha” surəsini oxuyun

Allaha təvəkkül etmək, güclü iradəyə malik olmaq və camaata möhtac olmamaq-٤٠ üçün “Bismillahir-rəhmanir-rəhim! Əlhəmdu lillahi Rəbbil-aləmin. Həsbunəllahu və neməl-vəkil. Təbarəkəllahu əhsənul-xaliqin. Və la həvlə və la quvvətə illa billahil-.əliyyil-əzim” – zikrini qırx dəfə oxuyun

## ELM VƏ ONU ÖYRƏNMƏYİN FƏZİLƏTİ

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Alimlər və elm öyrənənlər savabda-١ (şərikdirlər, sair camaat isə xeyir və səadətdən məhrumdurlar.”(١

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Elm Allahın yer üzündə qoyduğu-٢ əmanət, alimlər isə Allah elminin əmanətdarlarıdır. Hər kəs öz elminə əməl etsə, (həqiqətdə əmanəti layiqincə sahibinə qaytarmışdır.”(٢

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs elmi (məlumatı) olmadığı-٣ şeylərdə xalqa fikir söyləyib, fətva versə, dində etmək istədiyi xidmətdən daha çox (zərbə vurmuş olar.”(٣

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Dünya və axirət xeyri elm ilə-٤ ”.yanaşıdır

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Elm öyrənən şəxs gündüzləri oruc-٥ tutan, gecələri isə səhərə kimi ibadətlə keçirən şəxs kimidir. İnsanın öyrəndiyi bir elm toplusu Əbu Qübeys dağı qədər qızıla, mal-dövlətə malik olub onları Allah yolunda (ehsan etməsindən daha fəzilətlidir.”(٤

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Elmin fəziləti Allah yanında ibadətin-٦

(fəzilətindən daha əzizdir."(۵

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Həqiqətən mömin şəxsin ölümündən-۷ sonra gözəl əməllərinə və yaxşılıqlarına əlavə olunan şeylər – onun öyrənib yığdığı ".elm, qoyub getdiyi saleh əməl, övlad və yadigar qoduğu Qurandır

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "İnsan öldükdən sonra onun əməl-۸ dəftəri bağlanar, yalnız üç yolla ona savab və fayda verilər: ۱-Ümumxalq mənfəəti üçün bir şey düzəldən və ardıcıl sədəqə qoyub gedən. ۲-Cəmiyyət üçün faydalı şagird yetişdirib lazımlı kitablar yazan alim. ۳-İnsanın özündən sonra qoyub getdiyi və onlar (üçün ehsan edən əməlisaleh övlad."(۶

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Hər kəsdən bildiyi bir şey (məsələ)-۹ barəsində soruşsalar və o da öz elmini gizlətsə, (qiyamətdə) ağzına oddan bir cilov vurular."(۷) (Yəni elmsizlik ucbatından sərgərdan qalan və vəzifəsinin nə olduğunu bilməyən cahil şəxslərə yol göstərməyə və onların həyatını səadətə çatdırmağa qadir (.olduğu halda sükut edən elmli bir şəxs böyük bir günaha mürtəkib olmuşdur

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Qurani-kərim bir İlahi ədəb-۱۰ (məktəbidir. Bacardığınız qədər onun ədəb qaydalarını öyrənin."(۸

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Ümmətim içərisində iki dəstə var ki,-۱۱ əgər onlar saleh və düzgün olsalar, ümmətimin hamısının əmməlləri saleh olar və əgər fəsad

səh:۳

---

.Biharul-ənvar", ۲-ci cild, səh. ۲۵" [۲۱] -۱
.Yenə orada, səh. ۳۶ [۲۲] -۲
.Yenə orada, səh. ۱۲۱ [۲۳] -۳
.Yenə orada, ۱-ci cild, səh. ۱۸۴ [۲۴] -۴
.Yenə orada, səh. ۱۶۷ [۲۵] -۵
.İsna-əşəriyyə", səh. ۸۷" [۲۶] -۶
.Yenə orada, səh. ۱۱ [۲۷] -۷

törətsələr, ümmətim də fəsada düşər." Soruşuldu ki, ey Allahın Peyğəmbəri, onlar (hansılardır? Buyurdu: "Fəqihlər (din alimləri) və əmirlər (hökumət işçiləri)."(۱

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Mənim ümmətimdən olan hər bir ağıl-۱۲ və düşüncə sahibinə dörd şey zəruri və lazımdır." Soruşuldu: Ey Allahın elçisi! Onlar nədir? Həzrət buyurdu: "Elmi eşitmək, onu qoruyub saxlamaq, elmi yaymaq və ona (əməl etmək."(۲

İmam Əli (ə) buyurmuşdur: "Hər bir insanın qiyməti onun elminin dəyəri-۱۳ qədərdir."(۳) (Hər bir sənətkarın dəyəri bildiyi peşə və sənət qədər, təbibin dəyəri sağlamlığın əhəmiyyəti qədər, müəllim və ruhaninin dəyəri isə cəmiyyətə elm öyrədib (.düz yol göstərmək qədərdir

İmam Əli (ə) buyurmuşdur: "Elm öyrənmək üçün səy edənlər Allah yolunda cihad-۱۴ (edən şəxslər kimidir."(۴

İmam Əli (ə) buyurmuşdur: "Elm asanlıq və rahatlıq axtarmaqla əldə oluna-۱۵ (bilməz."(۵

İmam Əli (ə) buyurmuşdur: "Həqiqətən, dinin kamalı elm öyrənmək və ona əməl-۱۶ etməkdir. Agah olun ki, elm kəsb etmək həqiqətdə sizin üçün mal-dövlət (qazanmaqdan daha vacibdir."(۶

İmam Əli (ə) buyurmuşdur: "Həqiqətən alimin əcri (savabı) oruc tutan, namaz qılan-۱۷ və Allah yolunda cihad edən şəxsin savabından artıqdır. Bir alim ölən zaman İslama elə ağır xəsarət dəyir ki, bu xəsarəti yalnız onun öz yerinə qoyduğu xələf cübran edə (bilər."(۷

İmam Əli (ə) buyurmuşdur: "Mal-dövlət yığanlar diri ikən ölüdürlər. Alimlər isə-۱۸ dünya durduqca diridir (və bəşəriyyət onların elmi əsərlərindən istifadə edir), cəsədləri (torpaqlara qarışır, özləri isə qəlblərdə yaşayır."(۸

İmam Həsən (ə) buyurmuşdur: "Öz elmini başqalarına öyrət və çalış ki, digərlərinin-۱۹ (də elmini öyrənəsən."(۹

İmam Hüseyn (ə) buyurmuşdur: “Həqiqətən müsəlmanların işləri və səmavi-۲۰ hökmlərin icrası İlahi alimlərin əlindədir. Onlar Allahın halal və haram buyurduğu (işlərdə əmanətdardırlar.”(۱۰

İmam Hüseyn (ə) buyurmuşdur: “Hikmət və bilik mömin bir şəxsin itirdiyidir. Hətta-۲۱ müşrikin yanında olsa da onu axtarın ki, hikmət əhli olub, ona daha çox layiq (olasınız.”(۱۱

İmam Hüseyn (ə) buyurmuşdur: “Elm və bilikdən sənə Allahın əzəmətindən-۲۲ qorxacağın qədər bəsdir, nadanlıqdan da öz elminlə məğrur və xudpəsənd olmağın (qədər kifayətdir.”(۱۲

İmam Hüseyn (ə) buyurmuşdur: “Alimlərdən soruşun, hikmət sahibləri ilə danışın və-۲۳ (yoxsullarla oturub-durun.”(۱۳

İmam Hüseyn (ə) buyurmuşdur: “Elmi bəhs və müzakirələr mərifət toxumudur,-۲۴ (uzun və çoxlu təcrübələr əqlin çoxalmasına səbəb olur.”(۱۴

İmam Hüseyn (ə) buyurmuşdur: “Dünyada zahid o adamdır ki, başqalarına moizə-۲۵ etsin və başqalarının da moizəsini qəbul etsin, elm öyrənsəin və öyrəndiyi elmə əməl (etsin.”(۱۵

İmam Hüseyn (ə) buyurmuşdur: “Elmin üstünlüyü ibadətin üstünlüyündən daha-۲۶ (yaxşıdır, dinin kamilliyi təqva və itaətkarlıqdır.”(۱۶

İmam Hüseyn (ə) buyurmuşdur: “Elm və bilikdən başqa, bir şey üçün yaltaqlıq-۲۷ (etmək və həsəd aparmaq mömin şəxsin əxlaqi sifətlərindən deyildir.”(۱۷



---

.Yenə orada, ۲-ci cild, səh. ۴۹ [۲۹] -۱

.Töhəful-üqul”, səh. ۵۶, hədis: ۱۶۹“ [۳۰] -۲

.Nəhcül-bəlağə”, səh. ۴۸۲“ [۳۱] -۳

.Biharul-ənvar”, ۱-ci cild, səh. ۱۷۹“ [۳۲] -۴

.Qürərul-hikəm”, səh. ۳۴۹“ [۳۳] -۵

۶- [۳۴] “Kafi”, ۱-ci cild, səh. ۳۰.

۷- [۳۵] “Biharul-ənvar”, ۲-ci cild, səh. ۴۳.

۸- [۳۶] “Nəhcül-bəlağə”, “qısa” sözlər”: ۱۴۷.

۹- [۳۷] “Biharul-ənvar”, ۷۸-ci cild, səh. ۱۱۱.

۱۰- [۳۸] “Töhəful-üqul”, səh. ۱۷۲.

۱۱- [۳۹] “Əmali” (Şeyx Tusi), səh. ۳۵.

۱۲- [۴۰] Yenə orada.

۱۳- [۴۱] “Əşəsiyyət”, səh. ۲۳۰.

۱۴- [۴۲] “Cəfəriyyat”, səh. ۱۹۵.

۱۵- [۴۳] Yenə orada, səh. ۲۳۳.

۱۶- [۴۴] Yenə orada, səh. ۱۵۵.

۱۷- [۴۵] “Biharul-ənvar”, ۴۴-cü cild, səh. ۱۶; “Mənaqib”, ۴-cü cild, səh. ۴۵.

İmam Hüseyn (ə) buyurmuşdur: “Bir alimin biliyinin nişanələrindən biri onun öz-۲۸
dediklərinə daha çox diqqət yetirməsi, tənqidlə yanaşması, fikir və münazirə fənlərinin
(həqiqətlərindən xəbərdar olmasıdır.”(۱

İmam Hüseyn (ə) buyurmuşdur: “Biz o şəxslərik ki, Allahın kitabının elmi, bəyanı və-۲۹
dərki bizdədir. Bizdə olan şeylər Allahın yaratdıqlarından heç kəsdə yoxdur, çünki biz –
(Peyğəmbər xanədanı – Allahın sirlərinin əhliyik.”(۲

(İmam Hüseyn (ə) buyurmuşdur: “Elm imanın, helm isə biliyin layiqli vəziridir.”(۳-۳۰

İmam Zeynül-abidin (ə) buyurmuşdur: “Əgər insanlar elm kəsb etməyin necə böyük-۳۱
dəyərə malik olduğunu bilsəydilər, onu hətta qanlarını axıtmaqla, tufanlı və dalğalı
(dənizləri yarmaqla belə, kəsb edərdilər.”(۴

İmam Baqir (ə) buyurmuşdur: “Elm öyrənməkdə çalışın, çünki elm öyrənmək gözəl-۳۲
(əməl, onu axtarmaq isə ibadətdir.”(۵

İmam Baqir (ə) buyurmuşdur: “Əgər alimin hüzurunda otursan, danışmaqdan çox-۳۳
eşitmək üçün həris ol; yaxşı danışmağı öyrəndiyin kimi, yaxşı qulaq asmağı da öyrən
(və heç vaxt danışanın sözünü kəsmə.”(۶

İmam Sadiq (ə) buyurmuşdur: “Diqqət edib baxın, görün ki, öz elminizi kimdən-۳۴
(öyrənirsiniz!”(۷

İmam Sadiq (ə) buyurmuşdur: “Elm kəsb edin və onunla birlikdə elmlə, vüqarla-۳۵
(zinətlənin. Elm öyrətdiyiniz şəxs qarşısında isə təvazökarlıq edin.”(۸

İmam Sadiq (ə) buyurmuşdur: “Öz yazılarınızı qoruyub saxlayın, çünki sonradan-۳۶
(onlara ehtiyac duyacaqsınız.”(۹

İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs Allahın razılığı üçün elm öyrənib ona əməl-۳۷
(etsə və başqalarına öyrətsə, asimanların mələkut aləmində əzəmətlə yad edilər.”(۱۰

Əbdüs-səlam deyir: İmam Rza (ə) buyurdu: “Allah bizim əmrimizi dirçəldən şəxsə-۳۸
rəhmət etsin!” Soruşdum ki, sizin əmriniz necə dirçələr? Buyurdu: “Bizim elmlərimizi
öyrənib onları camaata öyrətməklə; çünki əgər onlar bizim kəlamımızın gözəlliklərini

bilsələr, hökmən bizə tabe olarlar."(۱۱)

۳۹- İmam Rza (ə) buyurmuşdur: "Agah olun və bilin ki, fəqih (din alimi) o şəxsdir ki, xalqa xeyir, fayda versin, onları düşmənlərdən qorusun, Allahın cənnət nemətlərini onlar üçün artırsın, onları düz yola hidayət etməklə onlar üçün Allahın rizvanını kəsb etsin."(۱۲)

۴۰- İmam Həsən Əskəri (ə) buyurmuşdur: "Bizim şiələrimizin alimləri İslam dininin sərhədçiləridir. Bizim ardıcıllarımızdan hər kəs bu vəzifəni öhdəsinə alsa, Rum qoşunları ilə cihada gedən şəxsdən daha fəzilətli olar. Çünki o, bizi sevənlərin din sərhədlərini müdafiə edir."(۱۳)

səh:۵

---

۱- [۴۶] "Biharul-ənvar", ۷۵-ci cild, səh. ۱۱۹.

۲- [۴۷] "Yenə orada", ۴۴-cü cild, səh. ۱۸۴.

۳- [۴۸] "Əl-bəlağət", səh. ۶۸.

۴- [۴۹] "Kafi", ۱-ci cild, səh. ۳۵.

۵- [۵۰] "Biharul-ənvar", ۷۸-ci cild, səh. ۱۸۹.

۶- [۵۱] Yenə orada, ۱-ci cild, səh. ۲۲۲.

۷- [۵۲] Yenə orada, ۲-ci cild, səh. ۹۲.

۸- [۵۳] "Kafi", ۱-ci cild, səh. ۳۶.

۹- [۵۴] Biharul-ənvar", ۲-ci cild, səh. ۱۵۲.

۱۰- [۵۵] "Kafi", ۱-ci cild, səh. ۳۵.

۱۱- [۵۶] "Məaniul-əxbar", səh. ۱۸۰.

۱۲- [۵۷] "Biharul-ənvar", ۲-ci cild, səh. ۵.

۱۳- [۵۸] "Əl-ihticac", ۲-ci cild, səh. ۱۵۵.

## AXİRƏT SƏFƏRİ

Əbuzər demişdir: “Ey camaat! Sizlərdən biriniz səfərə getmək istədikdə, özünüzlə-١ kifayət qədər azuqə və yol ehtiyatı aparırsınız. Lakin bilin ki, axirət səfərinə gedəndə, ”.azuqə aparmaq daha vacibdir

Hər gecə camaat öz yataqlarına getdikləri zaman imam Əli (ə)-ın səsi ucalardı. Belə-٢ ki, qonşuların hamısı o həzrətin səsini eşidərdilər. O həzrət buyurardı: “Hazırlaşın, öz səfər azuqənizi hazırlayın, Allah sizə rəhmət etsin! Həqiqətən ölüm carçısı sizə dünyanı dəyişmək nidasını vermişdir. Dünyadan az yapışın, saleh əməl azuqəsi hazırladığınız halda, axirət səfərinə yola düşün. Siz çətin və ağır mənzillər və hadisələrlə üzləşib, ”.onları ötüb keçməlisiniz

:Axirət səfərinin bir necə mənzili vardır-٣

Birinci mənzil can verməkdir; onun qorxulu və vəhşətli halətləri vardır. Bu zaman çətinliklər can verənə hər tərəfdən üz gətirər. Bir tərəfdən xəstəliyin və bədəndə olan ağrıların şiddətlənib bədənin taqətsiz olması və dilin tutulması, digər tərəfdən də evdən, əhl-əyaldan, ailə-uşaqlardan, qohum-əqrəbadan, mal-dövlətdən ayrılmaq və başqalarının hüquqları haqqında fikirləşmək. Bunlardan əlavə, onun hökmünü oxuyan qəzəb mələklərinin, canını almağa gələn ölüm mələyinin hansı şəkildə gəlməsi .çətinlikləri daha şiddətləndirir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ya Əli! Ölüm mələyi kafiri qəbzi-ruh-۴ edərkən qızmış şişlərlə onun canını çıxarar.” Əmirəl-möminin Əli (ə) ərz etdi ki, ya Rəsuləllah, sizin də ümmətinizdən belə can verənlər olacaqmı? Peyğəmbər (s) buyurdu: “Bəli, müsəlmanlardan da bir neçə dəstə bu sayaq can verərlər: Zalım hakimlər, yetim malını mənimsəyənlər, nahaq yerə şahidlik edənlər, xəbərçilər, həsəd ”.edənlər və şərab içənlər

İnsanın asan can verməsinə səbəb olan əməllər aşağıdakılardan ibarətdir: ١--۵ Qohumluq əlaqələrini kəsməmək. ٢-Ata və anaya yaxşılıq etmək. ٣-Yetmiş dəfə “Ya əsməəs-samiin və ya əsbərən-nazirin və ya əsrəəl-hasibin və ya əhkəməl-hakimin” .demək. ۴-“Zilzal” surəsini oxumaq

İnsanın axır-aqibətinin yaxşı şəkildə sona yetməsi və dünyadan imanlı halda-۶ getməsi üçün aşağıdakı əməlləri yerinə yetirməsi təsirlidir: ۱-Gündəlik vacibi namazları əvvəl vaxtında qılmaq. ۲-“Zil-qədə” ayının bazar günlərində qılınan namazı tərk etməmək. ۳-Həmişə həzrət Fatimeyi-Zəhra (ə)-ın təsbihatını demək. ۴-(“Muhəmmədun nəbiyyullah və Əliyyun vəliyyullah” sözləri yazılmış) əqiq üzük taxmaq. ۵-Cümə günlərində “Muminun” surəsini oxumaq. ۶-Çoxlu salavat çevirmək. ۷-“(Xüsusilə sübh namazından sonra) yeddi dəfə “Bismillahir-rəhmanir-rəhim, la hovlə və la quvvətə illa billahil-əliyyil-əzim” demək. ۸-Rəcəb ayının ۲۲-ci gecəsi səkkiz rükət gecə namazı qılmaq (və hər rükətdə “Həmd” surəsindən sonra əlli dəfə “İxlas” surəsini oxumaq). ۹-“Rəbbəna la tuziğ qulubəna bədə iz hədəytəna və həb ləna min lədunkə .rəhməh, innəkə əntəl-vəhhab” ayəsini çoxlu demək

Axirət səfərinin ikinci mənzili qəbirdir: Yaxşı olar ki, meyyiti qəbrə yaxınlaşdırdıqda,-۷ onu birdən qəbrə qoymasınlar; çünki qəbrin qorxulu və vəhşətli hadisələri vardır. Həzrət Fatimeyi-Zəhra (ə) imam Əli (ə)-a vəsiyyət etmişdi ki, məni qəbrə qoyub, qəbirimin üstünü örtdükdən sonra, mənim başımın üstündə otur, çoxlu Quran və dua oxu. Çünki həmin saat ölünün diri şəxslərlə ünsiyyət tapmağa ehtiyacı vardır. Seyyid ibni Tavus həzrət Peyğəmbər (s)-dən nəql etmişdir ki, meyyitin ən çətin saatı qəbrə .qoyulduğu birinci gecədir

Qəbrin birinci gecəsində öz ölünüzə sədəqə vermək, çoxlu salavat göndərmək,-۸ .Quran oxumaq və vəhşət namazı qılmaqla rəhmət göndərin

Qəbrin birinci gecəsinin qorxusundan nicat tapmaq üçün aşağıdakı əməlləri yerinə-۹ yetirmək faydalıdır: ۱-Namazların rükusunu tam və kamil şəkildə yerinə yetirmək. ۲-Hər gün yüz dəfə “La ilahə illəllahul-məlikul-həqqul-mubin” demək. ۳-Yatmazdan öncə “Yasin” surəsini oxumaq. ۴-( Rəcəb ayında qılınan) “Leylətur-rəğaib” namazını qılmaq. ۵-Xəstələrin görüşünə getmək. ۶-Xoş xasiyyətli olmaq (xüsusilə evdə). ۷-Əhli-beyt (ə)-.a məhəbbət bəsləmək

İmam Sadiq (ə) buyurmuşdur: “Möminin günahlarının kəffarəsi (cəriməsi) qəbir-۱۰ ”.əzabı və sıxıntısıdır

Ondan xilas olmağa səbəb olan əməllər bunlardır: ۱-Hər cümə gecəsi “Nisa” surəsini oxumaq. ۲-“Zuxruf” surəsini çox oxumaq. ۳-Gecə namazı qılmaq. ۴-“Təkasur” surəsini oxumaq. ۵-Nəcəfi-əşrəf şəhərində dəfn olunmaq. ۶-Meyyitin kəfəninə iki yaş çubuq qoymaq. ۷-Qəbrin üstünə su tökmək (qəbrin üstü rütubətli olana qədər, meyyitə əzab verilməz). ۸-Rəcəb ayında dörd, Şəban ayında isə on iki gün oruc tutmaq. ۹-Rəcəb ayının birinci gecəsində on rükət namaz qılmaq (hər rükətdə “Həmd” surəsindən sonra “İxlas” surəsini üç dəfə oxumaq). ۱۰-Rəcəb ayının birinci gecəsində iyirmi rükət namaz qılmaq. ۱۱-“Mülk” surəsini çox oxumaq. Həzrət Peyğəmbəri-Əkrəm (s) bu barədə buyurmuşdur: “Bu surə insanı qəbir əzabından xilas edir.” ۱۲-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Meyyiti dəfn etdikdə üç dəfə “Əllahummə inni əsəlukə bihəqqi Muhəmmədin və Ali-Muhəmmədin ən-la tuəzzibə hazəl-məyyit” desə, Allah-taala əzabı ondan götürər.” ۱۳-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs

cümə axşamı hər rükətdə “Həmd” surəsindən sonra on dörd dəfə “Zilzal” surəsini oxumaqdan ibarət olan iki rükət namaz qılsa, qəbir sıxıntısından amanda qalar.” ۱۴-Rəcəb və Şəban ayının gecələrinə, eləcə də Aşura gecəsinə məxsus olan müstəhəb namazları qılmaq. ۱۵-Sədəqə vermək (xüsusilə yetimə). ۱۶-Xalqa xidmət etmək, .xüsusilə məscid tikmək, körpü salmaq və yol çəkmək

Həmçinin cümə ertəsi gününün qürubundan cümə gününün qürubu arasında ölənlərə (!də qəbir əzabı verilməz. (İnşaallah

Üçüncü mənzil qəbirdə Nəkir və Münkir adlı mələklərin meyyitdən sorğu-sual-۱۱ etməsidir: Rəvayətlərə əsasən, onlar gələrkən ildırım səsi verərlər, gözlərindən od sıçrayar və saçları yerlə sürünər. Onlar Allah, Peyğəmbər, din, imamlar və s. kimi məsələlərdən soruşarlar. Həmin halda bu suallara cavab vermək çətin olduğundan, meyyitə iki dəfə təlqin etmək müstəhəbdir: Birincisi, meyyiti qəbrə qoyanda, ikincisi isə onu dəfn etdikdən və camaat dağılışdıqdan sonra meyyitin vəlisi qəbrin baş tərəfində otursun və uca səslə təlqin desin. Rəvayətdə bəyan olunduğu kimi, meyyitə təlqin deyilsə, Nəkir və Münkir deyərlər: “Gəl qayıdaq, təlqin höccəti tamamladı, artıq sorğu-.suala ehtiyac yoxdur.” Bununla da onlar heç bir sual soruşmadan qayıdarlar

Əbuzərin oğlu vəfat etdikdə, Əbuzər əlini onun qəbrinə sürtüb dedi: “Sən mənə-۱۲ qarşı yaxşılıq etdin, Allah sənə rəhmət etsin! Əgər ölümdən sonrakı çətin və qorxulu hadisələr olmasaydı, qəmgin olmazdım. Mən sənin ölümünə və məndən ayrılığına görə ağlamadım, mənim ağlamağım sənin qəbirdəki vəziyyətinə və sorğu-suallara necə cavab verəcəyinə görədir. Kaş, səndən soruşulan sualları və sənin necə cavab ”!verəcəyini biləydim

Axirət mənzillərindən biri də qiyamətdir; Allah-taala Qurani-kərimdə qiyamətin-۱۳ böyük, əzəmətli, çətin və qorxulu bir gün olduğunu açıqlamışdır. Həzrət İsa (ə) buyurmuşdur: “Cəbrail qiyamətin adını eşidəndə, lərzəyə düşüb, özündən getdi.” Rəvayətə görə, elə bir mələk, insan, cin, yer, göy, külək, dağ və dəniz yoxdur ki, .qiyamət gününün hadisələrindən qorxmasın

:Qiyamətin qorxulu hadisələrindən amanda qalmağa səbəb olan əməllər-۱۴

b) Hər gün, yaxud heç olmazsa vacibi və ya müstəhəbbi namazlarda bir dəfə “Duxan” .surəsini oxumaq

.v) Hər cümə günü və ya cümə axşamı “Əhqaf” surəsini oxumaq

.q) Nafilə namazlarında “Əsr” sursini oxumaq

.s) Məkkə yolunda ölmək

h) Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs Allahın qorxusundan çirkin işlərdən çəkinsə, Allah-taala da onu qiyamət gününün qorxusundan amanda ”.saxlayar

x) Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs camaatı deyil, öz (əmmarə) ”.nəfsini düşmən tutsa, Allah-taala onu qiyamətin qorxusundan amanda saxlayar

.c) Qəzəbi söndürmək

f) Allah-taala Qurani-kərimdə buyurmuşdur: “Qiyamət günündə özü ilə yaxşılıq (yaxşı əməllər) gətirən şəxs bu günün qorxusundan amanda qalar.” İmam Əli (ə) buyurmuşdur: “Bu ayədəki “yaxşılıq”dan məqsəd, vilayət və biz Əhli-beytə məhəbbət ”.bəsləməkdir

m) İmam Sadiq (ə) buyurmuşdur: “Öz mömin qardaşına kömək edən və qəmli günündə ona rahatlıq yaradan şəxs qiyamətin böyük və qorxulu hadisələrindən ”.amanda qalar

e) İmam Rza (ə) buyurmuşdur: “Hər kəs öz (mömin) qardaşının qəbrinin yanına gəlsə və əlini qəbrin üstünə qoyub, yeddi dəfə “Qədr” surəsini oxusa, qəbir əhli qiyamətin ”.qorxusundan amanda qalar

Axirət mənzillərindən biri də qəbirdən baş qaldırmaqdır: Bu, Adəm övladlarının ən-۱۵ .çətin və qorxulu anlarından biridir

:Bir neçə tayfanın qəbirdən baş qaldıranda vəziyyəti-۱۶

a) Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Əli (ə)-ın fəziləti barəsində şəkk-şübhə edən şəxs qiyamət günündə boynunda üç yüz odlu zəncirdən ibarət bir boyunbağı olduğu və hər bir zəncirdə də bir Şeytan oturub, ağız suyunu onun üzünə ”.atdığı halda gələr

b) İmam Sadiq (ə) buyurmuşdur: “Malın haqqını (xums və zəkat) verməyənlər qəbirdən ”.əlləri boyunlarına bağlanmış halda, baş qaldırarlar

v) Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs xəbərçilik etsə, Allah-taala onun qəbrinə od göndərər, onun ətini dörd böyük qara ilanın dişləri ilə qopartdığı ”.halda, qəbirdən qaldırar və elə həmin ilanlarla birlikdə cəhənnəmə göndərər

q) Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Gözlərini naməhrəmə baxmaqla ”.dolduranlar qəbirdən odlu mıxlara taxıldıqları halda baş qaldırarlar

d) Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Şərab içən şəxs qiyamətdə üzü qara, ”.ağzı əyri və dili ağzından çıxmış vəziyyətdə qəbirdən qalxar

s) Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “İkiüzlü olanlar qiyamət günündə ”.alovdan iki dili olduğu halda qəbirdən qalxar

:İnsana qəbirdən qalxan zaman fayda verən əməllər-۱۷

.a) Dəfn mərasimlərində iştirak etmək

.b) Mömin şəxsin qəm-qüssəsini aradan qaldırmaq

.v) Mömin şəxsi sevindirmək

.q) Mömin qardaşı paltarla təmin etmək

d) Şəban ayında min dəfə “La ilahə illəllahu və la nəbudu illa iyyahu muxlisinə ləhud-.dinə və lov kərihəl-muşrikun” demək

.s) Ramazan ayında “Cövşən-kəbir” duasını oxumaq

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Qiyamət günündə ümmətimdən on-۱۸

:dəstə məndən ayrılar və müxtəlif surətlərə düşərlər

.a) Meymun surətində gələnlər söz gəzdirənlərdir

.b) Donuz surətində gələnlər haram mal yeyənlərdir

.v) Başı aşağı gələnlər sələmçilər, faiz yeyənlərdir

.q) Kor halda daxil olanlar, nahaq hökm vermiş zalım hakimlərdir

.d) Məhşərə kar gələnlər xudpəsəndlər və özünü sevənlərdir

.s) Dilini dişləyib, ağzından çirk axanlar əməlsiz alimlərdir

.h) Məhşərə əl-ayağı kəsilmiş vəziyyətdə gələnlər qonşuya əzab-əziyyət verənlərdir

x) Murdardan da iyrənc olanlar zina edənlər, harama, şəhvətə və (haram) ləzzətə .qurşananlardır

səh:۸

ç) Oddan olan budaqlara bağlananlar dünyada padşahlara, ağalara sirr və xəbər aparıb xalqı incidənlərdir.

f) Alovdan paltar geyinənlər təkəbbür edənlərdir.

۱۹-Axirət mənzillərindən biri də qiyamət günündə əməllərin ölçüldüyü gündür: Belə ki, qiyamət başlananda hər kəsin əməlləri ölçülər, yaxşı və ya pis işlərinin miqdarı məlum olar. Əməli yüngül olanlar zərər çəkənlər, yaxşı əməli çox və ağır olanlar isə nicat tapanlardır.

۲۰-Yaxşı əməlin çox və ağır olmasına səbəb olan əməllər:

a) Salavat demək: İmam Baqir (ə) və imam Sadiq (ə) buyurmuşdur: "(Qiyamət günü) əməllər ölçüləndə salavatdan ağır bir əməl olmaz." Həzrət Peyğəmbəri-Əkrəm (s) də buyurmuşdur: "Mənə salavat göndərmək qiyamətdə yaxşı əməllərin çəkisini artırar."

b) Yaxşı əxlaqlı olmaq.

۲۱--Axirətin mənzillərindən biri də qiyamətdə hesab verməkdir: Allah-taala Qurani-kərimdə buyurur: "Camaatın hesab verəcəyi vaxt yaxınlaşdı, lakin onlar qəflətdədir və onun haqqında heç də fikirləşmirlər."

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "(Qiyamətdə) dörd məsələ haqqında soruşular: ۱-Ömür. ۲-Cavanlıq. ۳-Var-dövlətin haradan qazanılması. ۴-Var-dövlətin harada xərclənməsi."

İmam Baqir (ə) da buyurmuşdur: "Qiyamət günündə insandan soruşulan ilk əməl namazdır."(۱)

۲۲-Axirət mənzillərindən biri də əməl dəftərinin verilməsidir: Qurani-kərimdə də bu barədə söz açılmışdır. Belə ki, "Zilzal" surəsinin ۶-cı ayəsində buyurulur: "O gün insanlar əməllərinin özlərinə göstərilməsi üçün (qəbirlərindən məhşərə) dəstə-dəstə çıxacaqlar."

İmam Sadiq (ə) buyurmuşdur: "Möminin əməl dəftəri sağ əlinə veriləcək və hesabı asan olacaq. Başqalarının əməl dəftəri isə sol əlinə veriləcək və onlar ağır hesab

".verənlərdir

İmam Sadiq (ə) yenə buyurmuşdur: "Qiyamət başlananda camaatın əməl dəftəri onlara verilər və onlara deyilər ki, oxu... Sonra onlar deyərlər: Vay olsun bizə! "!Gördüyümüz böyük və kiçik əməllərin hamısı burada yazılmışdır

Axirət mənzillərindən biri də cəhənnəmin üzərindən çəkilən Sirat körpüsüdür:-۲۳ Oradan keçə bilməyən şəxs behiştə daxil olmaz. Bu körpü tükdən nazik, qılıncdan iti və oddan hərarətlidir. Dünyada doğru yolda olan, həqiqət və din yolundan sapmayanlar bu körpüdən sağ-salamat və ildırım sürəti ilə ötüb keçəcəklər. Bəziləri çətinliklə keçib nicat tapacaqlar. Bəziləri sürətli atlar kimi, bəziləri dizi-dizi (iməkləyərək) Siratı adlayacaq, bəziləri də bu körpüdən keçərkən cəhənnəmə düşəcəklər. Bir sözlə, .camaat dünyada din yolunu necə getmişlərsə, Siratı da elə keçəcəklər

Əllamə Məclisi özünün "Həqqul-yəqin" kitabında yazır: Bizim əqidəmizə görə, Sirat-۲۴ körpüsünün hər bir dolamasında insandan Allahın əmr və qadağan etdiyi məsələlərdən soruşulacaq. Əgər həmin məsələ barəsində səhlənkarlıq etmişdirsə, o dolamada min il saxlanılar və ondan həmin məsələ ilə əlaqədar Allahın haqqı tələb olunar. Əgər ona cavab verə bilsə, Allahın rəhmətinə şamil olub, nicat tapar və başqa bir dolamaya çatar. Beləliklə, Sirat körpüsünün hər bir dayanacağında sorğu-sual .olunan halda, onu ötüb keçər

:Sirat körpüsündən sağ-salamat keçməyə səbəb olan əməllər-۲۵

.a) Qohumluq əlaqələrini möhkəmlətmək

.b) Əmanətə sadiq qalmaq

v) Rəcəb ayının ilk onuncu gecəsində (işa namazından sonra) iyirmi rükət namaz .qılmaq

.q) Rəcəb ayında altı gün oruc tutmaq

d) Şəban ayının ۲۹-cu gecəsində on rükət namaz qılmaq və hər rükətində "Həmd" surəsindən sonra bir dəfə "Təkasur", on dəfə "Nas", "Fələq" və "İxlas" surələrini

.oxumaq

.s) İmam Rza (ə)-ı ziyarət etmək

İmam Sadiq (ə) buyurmuşdur: “Günlərin birində Cəbrail qəzəbli və qaş-qabaqlı-۲۶ halda həzrət Peyğəmbər (s)-in yanına gəldi. Peyğəmbər (s) buyurdu: “Nə üçün bu gün belə qəzəblisən?” Cəbrail dedi: “Mələklər cəhənnəm odunu ağartmaq üçün min il, qızartmaq üçün min il, qaraltmaq üçün də min il üfürdülər. İndi də onun odu qaradır. Əgər ondan bir damla dünya sularına düşsə, bütün dünya camaatı onun pis qoxusundan ölərlər.” Bundan sonra həm



---

.Axirət mənzilləri”, Şeyx Abbas Qummi“ [۵۹] -۱

Peyğəmbər (s), həm də Cəbrail ağlamağa başladılar. Bu zaman Allah-taala bir mələk ”.göndərib buyurdu: “Mən sizi bu əzabdan amanda saxladım

İmam Əli (ə) buyurmuşdur: “Dünyanın sonuncu günü çatanda, insan öz var--۲۷ dövlətinə xitab edərək deyər: “Sənə qarşı paxıllıq etdim, indi mənə nə kimi köməklər edə bilərsən?” Cavab verib deyər: “Məndən yalnız öz kəfənini götürə bilərsən.” Sonra üzünü övladlarına tutub deyər: “And olsun Allaha! Mən sizi çox sevirəm, bu gün mənə yardım edə bilərsinizmi?” Cavab verib deyərlər: “Biz səni yalnız dəfn edə bilərik.” Ondan sonra öz əməllərinə deyər: “And olsun Allaha, Mən səni çox istəyirdim, özün buna şahidsən. İndi mənə yardım edə bilərsənmi?” Əməl cavab verib deyər: “Mən qəbirdə və hesab gününə qədər səninlə birgəyəm, sonra bizi Allaha tapşırarlar.” Əgər Allahın xoşuna gəlsə, gözəl surətli, xoş ətirli və qəşəng paltar geyinmiş bir şəxs onun yanına gəlib, behiştə müjdə verər. Əgər vacibi əməlləri bilə-bilə tərk edib günahkarlardan, yaxud kafirlərdən olsa, Allahın qəzəbinə səbəb olar və qorxunc ”.surətli, pis qoxulu bir şəxs gəlib, onun cəhənnəmə gedəcəyini xəbər verər

İnsanın ruhu bədənindən çıxdıqda, can vermənin çətinliyi qurtarar, (qəbrə-۲۸ qoyulmazdan öncə) bir neçə saat rahatlıq və aramlıq hiss edər. Sonra onun gözündən pərdələr götürülər və özünü cənazəsinin üstündə durduğunu, qohum-əqrəbanın isə cənazəsinin ətrafına toplaşıb ağladığını görər və deyər: “Mən artıq sağalmışam, ölməmişəm.” Lakin onun sözünə qulaq asan bir kəs olmaz, sanki heç kəs onu görmür, o isə öz bəsirət gözü ilə dəfn mərasimində iştirak edənlərin müxtəlif surətlərə düşdüyünü – bəzilərini insan, bəzilərini də vəhşi heyvanlar surətində – görüb qorxar. Cənazəni qəbrə yaxınlaşdırdıqda, onu qorxu bürüyər. (Buna görə də cənazənin bir (.dəfəyə deyil, üç dəfəyə qəbrə qoyulması müstəhəbdir

Cənazəni qəbrə qoyanda, onun qorxusu daha da çoxalar, bütün bədəni əsməyə-۲۹ başlayar və camaatdan yardım diləyər, lakin heç kəs ona yardım etməz, hər kəs öz işi ilə məşğul olar: biri ağlayar, biri qəbrin üstünə torpaq tökər və s. Qəflətən bir neçə nəfər gəlib onunla söhbət etməyə başlayar. O, onların kim olduğunu soruşmaq istədikdə, gözdən itərlər. Bundan sonra qəbrin üstünün örtüldüyünü və qaranlıq qəbirdə tək-tənha qaldığını hiss edər, camaatın, xüsusilə əhl-əyalının vəfasız olduğunu fikirləşib qəmgin olar və qorxulu və kimsəsiz halda, ümidini Allaha bağlayıb,

.cənazəsinin üstündə əyləşər

Bu zaman Nəkir və Münkir adlı qorxunc surətli, ağızlarından və burunlarından alov-٣٠ püskürən iki mələk gələr, cənazəni sorğu-suala tutub deyərlər: “Rəbbin kim idi? Peyğəmbərin kim idi? İmamın kim idi? Hansı dində idin? Qiblən haradır?...” Onların surətinin qara olduğu, dodaqlarının dəvə dodağına oxşadığı, əllərində oddan şişlər olduğu üçün, meyyit qorxduğu, taqəti olmadığı halda, cavab verməyə başlayar. Həqiqi əqidəsi olanlar əqidələrini deyib Allahın təkliyinə, həzrət Mühəmməd (s)-in risalətinə və məsum imamların imamətinə şəhadət və digər suallara da düzgün cavab verər. Buna görə də mələklər onunla ədəblə və ehtiramla rəftar edərlər. Əks halda isə, dili .tutular və bu zaman mələklər onun qəbrini odla doldurarlar

İmam Sadiq (ə) buyurmuşdur: “Mömin üçün (qəbrin yuxarı tərəfindən) bir qapı-٣١ açılar, öz yerini behiştdə görər və o qapıdan heç vaxt görmədiyi xoş surətli iki şəxs daxil olar. Bu zaman mömin şəxs deyər: “Ey Allahın bəndəsi! İndiyə qədər səndən də gözəl bir şəxs görməmişəm!” Cavab verib deyər: “Mən sənin doğru əqidən və yaxşı (əməlinəm.”(١)

Həzrət Süleyman (ə) qəbiristanda ölmüş bir şəxslə danışırdı. Ölən şəxs söhbət-٣٢ əsnasında dedi: “Ey Süleyman! Allahın yanında üç əməli böyük gördüm: “Soyuq gecələrdə namaz qılmağı. ٢-İsti günlərdə oruc tutmağı. ٣-Sol əlin xəbəri olmadığı ”.halda, sağ əllə sədəqə verməyi

Həzrət Peyğəmbər (s) Əmirəl-möminin Əli (ə)-a buyurdu: “Meraca getdiyim gecə-٣٣ ümmətimdən bir dəstə qadın görüb ağladım. Başlarının tükünü naməhrəm kişilərdən örtməyən qadınlar saçlarından, dilləri ilə ərinə əziyyət verənlər dillərindən və ərinin icazəsi olmadan evdən çıxanlar ayaqlarından asılmışdılar. Özlərini yad (naməhrəm) kişilər üçün zinətləndirənlər bədənlərinin ətini yeyirdilər. Özünü və paltarlarını pak etməyən, heyz və cənabət quslu verməyən və namazı yüngül sayanların ayaqlarını əllərinə bağlamışdılar. Zinadan övlad dünyaya gətirib, onu yalandan öz ərinə nisbət verənlər kor və kar idilər. Özlərini naməhrəm kişilərə göstərənlər bədəninin ətini maqqaçla qoparırdılar. Söz gəzdirən və yalan danışan qadınların başları donuz, bədənləri isə ulaq şəklində idi. Xanəndəliklə

məşğul olan qadınlar it surətində idilər. Vay olsun öz ərini qəzəbləndirən qadına! Xoş ”!olsun öz ərini razı salan qadına

İmam Baqir (ə) buyurmuşdur: “Qəbir, axirət mənzillərindən biridir. Əgər ondan nicat-٣۴ tapsan, ondan sonra asan olar, əks təqdirdə, daha şiddətli və çətin olar... Bu barədə ”.qəbrə daxil olmamışdan öncə fikirləşmək lazımdır

Hədisi-qüdsi”də buyurulur: “Ölümünə yəqin edən şəxs (qəh-qəhə ilə) gülməz.“-٣۵ Allahın hər bir şeydən xəbərdar olmasını bilən şəxs necə günah edir? Qəbirdə tək-tənha qalıb hesab verəcəyini bilən şəxs başqası ilə necə ünsiyyət yaradır?! (İnasan) yalnız Allah və saleh əməllərlə ünsiyyətdə olmalı, onların yardımçı və nəzarətçi olması ”.haqqında fikirləşməlidir

İmam Sadiq (ə) buyurmuşdur: “Möminlərin ruhları behiştin saraylarında yaşayır,-٣۶ ”.onun təamlarından yeyir və şərablarından içərlər

Allah-taala Qurani-kərimdə bir neçə xüsusiyyətə malik olanlardan başqa, digər-٣٧ insanların zərərdə olduğunu açıqlamışdır. Həmin xüsusiyyətlər bunlardır: ١-İman. ٢-Saleh əməl. ٣-İnsanların bir-birlərinə kömək etməsi. ۴-Haqq əqidələrə yiyələnmək. ۵-.İbadətdə və günah qarşısında səbir etmək

Mötəbər hədislərdə buyurulur: “Bizim şiələrə deyin ki, sizin çətinliyiniz məhz bu-٣٨ dünyadadır. Canınız boğazınıza çatdığı vaxt, rahatlığınızın başlanğıcıdır.” İmam Sadiq (ə) buyurmuşdur: “Can verən halında möminə behiştdəki yeri göstərilər və ölüm mələyi ona deyər: “Ey Allahın dostu! Mən sənə qarşı ata-anandan da mehribanam, gözünü ac və on dörd məsuma bax.” Başqa bir hədisdə buyurulur: “Mələklərin ona göz ”.işlədikcə behişt müjdəsi verməsini görər

İmam Səccad (ə) buyurmuşdur: Həzrət Peyğəmbər (s) Əli (ə)-a buyurdu: “Ya Əli!-٣٩ Sənin şiələrinin yeddi xüsusiyyəti vardır: ١-Asan can vermək. ٢-Qəbirdə ünsiyyətdə olmaq. ٣-Qəbrinin nurlu olması. ۴-Qiyamət günündə amanda qalmaq. ۵-Yaxşı əməllərinin ağır olması. ۶-Sirat körpüsündən (sağ-salamat) keçmək. ٧-Behiştə daxil (olmaq.”(١

Ölüm məhv və puç olmaq deyil, həyatın dəyişməsidir; həqiqətdə yeni bir-۴۰ (həyatdır.(۲

**YEDDİ" HAQQINDA QIRX NÖQTƏ"**

Həzrət Peyğəmbər (s) yeddi şeyi tövsiyə etmişdir: ۱-Müsəlman şəxsin dəfn-۱ mərasimində iştirak etməyi. ۲-Xəstənin görüşünə getməyi. ۳-Asqıran şəxsə afiyət (sağlam ol) deməyi. ۴-Məzluma kömək etməyi. ۵-Salam verməyi. ۶-Dəvəti qəbul (etməyi. ۷-And içənin xahişini yerinə yetirməyi.(۳

Allah-taala yeddi dəstə adama Öz ərşinin sayəsində yer verər: ۱-Ədalətli rəhbərə. ۲--۲ İbadət edən cavana. ۳-Məsciddən çıxıb, sonradan məscidə qayıtmaq fikrində olan şəxsə. ۴-İbadətə görə başqaları ilə dostluq edən şəxsə. ۵-Xəlvətdə (günahların qorxusundan) ağlayan şəxsə. ۶-Gizli şəkildə sədəqə verən şəxsə. ۷-Gözəl bir qadının (zinaya dəvətini qəbul etməyən şəxsə.(۴

Əbuzər deyir: Peyğəmbər (s) mənə yeddi vəsiyyət etdi: ۱-Həmişə özümdən aşağı-۳ səviyyəli şəxslərə diqqət edəm. ۲-(Maddi cəhətdən) məndən yuxarı olan şəxslərə diqqət etməyəm. ۳-Məzlumları sevəm və onlara kömək edəm. ۴-Acı olsa da belə, həmişə haqq söz deyəm. ۵-Məndən üz çevirsələr də belə, qohumlarımla əlaqələrimi kəsməyəm. ۶-Allahın əmr etdiyi işi görməkdə başqasının məzəmmət və danlağından qorxmayam. ۷-Behişt xəzinələrindən sayılan "La hovlə və la quvvətə illa billahil-əliyyil- (əzim" – zikrini tərk etməyəm.(۵



---

.Xisal", ۲-ci cild, səh. ۱۰۷, hədis: ۱۱۲" [۶۱] -۱

Axirət səfəri" haqqında etdiyimiz söhbətlər Əllamə Məclisinin "Həqqul-yəqin"," [۶۲] -۲ Ayətullah Dəstğeybin "Məad" və Ayətullah Qucaninin "Qərb səyahəti" adlı .kitablarından iqtibas edilmişdir

.Xisal", ۲-ci cild, səh. ۴" [۶۳] -۳

.Yenə orada, səh. ۸ [۶۴] -۴

.Yenə orada, səh. ۱۰ [۶۵] -۵

Həzrət Peyğəmbəri-Əkrəm (s) Əli (ə)-a buyurdu: “Ya Əli! Hər kəsdə yeddi xislət olsa,-۴ imanın həqiqətinə nail olmuş və behişt qapıları onun üzünə açılmışdır: ۱-Əhval-ruhiyyə ilə dəstəmaz almaq. ۲-Namazı yaxşı qılmaq. ۳-Malın zəkatını vermək. ۴-Qəzəb odunu söndürmək. ۵-Dili bağlamaq (yəni az danışmaq). ۶-Günahdan tövbə etmək. ۷-Peyğəmbər xanədanına qarşı xeyirxahlıq etmək.”(۱)

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Allah və mən yeddi qrupu-۵ lənətləmişik: ۱-Allahın kitabına hər hansı bir sözü əlavə edəni. ۲-Qəza və qədəri təkzib edəni. ۳-Mənim sünnəmin əksinə çıxanı. ۴-Mənim itrətimlə (Əhli-beytimlə) müxalifət edəni. ۵-Hökuməti zorla ələ keçirib, Allahın əziz bəndələrini xar və bədbəxt edəni. ۶-Müsəlmanların ümumi mallarını öz mənfəətinə xərcləyəni. ۷-Allahın halalını haram və haramını halal edəni.”(۲)

Yəhudilərdən bir qrupu Peyğəmbər (s)-dən soruşdular: “Allahın sənə və ümmətinə-۶ əta etdiyi yeddi xislət hansılardır?” O həzrət buyurdu: ۱-“Həmd” surəsi. ۲-Azan. ۳-Məsciddə və cümə günündə camaat namazı qılmaq. ۴-Meyyit namazı. ۵-Gündəlik namazın üçünü ucadan qılmaq. ۶-Xəstə və səfərdə olduqda ibadətin yüngülləşməsi. ۷-Ümmətimin günahkarlarına şəfaət etmək.”(۳)

Əbdürrəhman ibni Kəsir imam Sadiq (ə)-ın belə buyurduğunu nəql etmişdir: “Ən-۷ böyük günahlar yeddidir: ۱-Allah-taalaya şərik qoşmaq. ۲-Allahın öldürülməsini haram etdiyi şəxsləri öldürmək. ۳-Yetimin malını yemək (mənimsəmək). ۴-Ata-ana ilə pis rəftar etmək (onlara aq olmaq). ۵-İffətli və pak qadınlara töhmət vurmaq. ۶-Müharibədən (cihaddan) qaçmaq. ۷-Bizim haqqımızı inkar etmək.”(۴)

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Məni və mənim Əhli-beytimi sevmək-۸ yeddi yerdə fayda verər: ۱-Ölüm vaxtı. ۲-Qəbirdə. ۳-(Qiyamətdə) diriləndə. ۴-Əməl dəftərini alanda. ۵-Hesab günündə. ۶-Əməllər ölçüləndə. ۷-Sirat körpüsündən keçəndə.”(۵)

Həzrət Peyğəmbəri-Əkrəm (s) Əli (ə)-a buyurdu: “Sən yeddi səbəbə görə-۹ başqalarından üstünsən: ۱-Hamıdan əvvəl iman gətirmisən. ۲-Əhd-peymana hamıdan artıq vəfalısan. ۳-Allahın işində (göstərişlərini yerinə yetirməkdə) dözümlüsən. ۴-Malı bölməkdə hamıdan ədalətlisən. ۵-Vəzifə başında əyləşənlərdən ədalətlisən. ۶-Qəzavət

".işlərinə (hökm etməkdə) hamıdan çox agahsan. ۷-Allahın yanında hörmətlisən

Allah-taala bir ümmətə qəzəblənərkən hələ ağır əzab nazil etmədiyi zaman o-۱۰ ümməti günaha mürtəkib olduqlarına görə yeddi bəlaya düçar edər. Əsbəğ ibni Nəbatə deyir: Əli (ə) buyurdu: Həzrət Peyğəmbəri-Əkrəm (s) belə buyurmuşdur: "Allah-taala bir ümmətə qəzəblənərkən hələ əzab nazil etmədiyi zaman o ümmət içərisində bahalıq yaranar, ömürləri qısalar, tacirləri qazanc əldə etməz, meyvələri təravətli və bol olmaz, suları artmaz, yağış yağmaz, onlara zülmkar şəxslər rəhbərlik (edər."(۶

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurdu: "Cəbrail gəlib dedi: Allah buyurur: Mənimlə-۱۱ sənin ümmətin arasında yeddi müqavilə vardır: ۱-Əgər Mənə itaət etsələr, günahkar olsalar da belə, itaətlərini qəbul edərəm. ۲-Bir daha günah etməməkləri üçün tövbə etsələr, onları anadan təzə doğulan körpə kimi pak-pakizə dünyadan apararam. ۳-Əgər yeddi bədən üzvlərindən (dil, qulaq, göz, əl, ayaq, qarın və cinsiyyət üzvü) biri saleh əməl etsə, digərləri isə günah iş görsə, qalan altı üzvü o bir üzvə görə bağışlayaram. ۴-Əgər bir şəxs günah edib, günahları bağışlayan tək Allahın varlığına inansa, onu bağışlayaram. ۵-cirkin işlərini tərk etmək üçün, onları müxtəlif xəstəliklərə düçar edərəm. ۶-Onlara yayda istilik, qışda isə soyuqluq göndərərəm ki, axirətin soyuqluq və istiliyinə dözsünlər. ۷-Aylara və günlərə savab təyin edərəm ki, həmin ".aylarda və günlərdə ibadət etsələr, günahlarını bağışlayıb, çoxlu savab verərəm

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Yeddi evə rəhmət nazil olmaz: ۱--۱۲ Qadın boşanan evə. ۲-Ərinə itaət etməyən qadın olan evə. ۳-Kişinin əmanətinə xəyanət olunan evə. ۴-Zəkatı verilməyən mal olan evə. ۵-Ölən şəxsin vəsiyyətinə əməl ".olunmayan evə. ۶-Şərab içilən evə. ۷-Ərinin malından oğurlayan qadın olan evə



---

.Yenə orada, səh. ۱۲ [۶۶] -۱

Yenə orada, səh. ۱۸ [۶۷] -۲

.Yenə orada, səh. ۲۶ [۶۸] -۳

.Yenə orada, səh. ۴۰ [۶۹] -۴

İmam Sadiq (ə) buyurmuşdur: “Yeddi dəstə adam öz əməllərini batil edər: ۱-Çoxlu-۱۳ elm sahibi olub məşhur olmayan (öz elmini başqalarına öyrətməyən) səbirli şəxs. ۲-Öz hikmətini ləyaqəti olmayanların ixtiyarında qoyan hikmət sahibi. ۳-Hiyləgər və xain şəxslərə inanan şəxs. ۴-(Ürəyində) rəhmi olmayıb qəzəblənən hörmətli şəxs. ۵-Övladının sirrini gizli saxlamayıb faş edən ana. ۶-Dostlarını danlamağa və məzəmmət (etməyə tələsən şəxs. ۷-Dostu ilə həmişə mübahisə edən şəxs.”(۱

İmam Əli (ə) buyurmuşdur: “İslamın yeddi sütunu vardır: ۱-Dözümün əsası olan ağıl.-۱۴ ۲-Abırlı olmaq və düz danışmaq. ۳-Düzgün və diqqətlə Quran oxumaq. ۴-Allah yolunda dostluq və düşmənçilik etmək. ۵-Həzrət Mühəmməd (s)-in Əhli-beytinin haqqını və vilayətini tanımaq. ۶-Qardaşların özlərini və haqlarını himayə etmək. ۷-Xalq ilə yaxşı (qonşuluq.”(۲

Yeddi əməl ölümdən sonra insana fayda verər: ۱-Ağac əkmək. ۲-Quyu qazıb su-۱۵ çıxarmaq. ۳-Suyun cari olması üçün arx düzəltmək. ۴-Məscid tikmək. ۵-Quranı (üzündən köçürüb) yazmaq. ۶-Yadigar olaraq elm qoymaq. ۷-Ata-anasının .bağışlanmasını diləyən saleh övlad qoyub getmək

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Yeddi yerdə danışmaq məkruhdur-۱۶ (bəyənilmir): ۱-Cənazənin ardınca gedəndə. ۲-Qəbiristanda. ۳-Xəstənin başı üstündə. ”.۴-Elm Məclisində. ۵-Məsciddə. ۶-Müsibət halında. ۷-Cima (cinsi əlaqə) vaxtı

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ya Əli, Cəbrail Adəm övladına olan-۱۷ yeddi gözəl xüsusiyyətə görə insan zümrəsindən olmağı arzu edərdi: ۱-Camaat namazı qılmağı. ۲-Alimlərlə oturub-durmağı. ۳-İki nəfəri barışdırmağı. ۴-Yetimi əzizləyib nəvaziş etməyi. ۵-Xəstələrə baş çəkməyi. ۶-Dəfn mərasimində iştirak etməyi. (۷-Həcc mərasimində susuzlara su verməyi.”(۳

İsmail ibni Əbi Ziyad imam Sadiq (ə)-dan, o da atası imam Baqir (ə)-dan belə nəql-۱۸ etmişdir: “Yeddi nəfər (səfərdə olduqları halda) namazı qəsr qılmamalıdır: ۱-Zəkat yığmaq üçün səfərə gedən məmur. ۲-Sənətinin tələbinə görə səfər edən hakim. ۳-Ticarət məqsədilə (həmişə) bu bazardan başqa bir bazara səfər edən tacir. ۴-Çoban. ۵-Su tapmaq üçün səhralıqda gəzən şəxs. ۶-İstirahət məqsədilə ova gedən şəxs. ۷-(Camaatın yolunu kəsən quldur.”(۴

۱۹-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Allah-taala bizim vücudumuzda yeddi xüsusiyyət qərar vermişdir: ۱-Gözəllik. ۲-Fəsahət (gözəl danışıq). ۳-Şücaət. ۴-Alicənablıq. ۵-Elm. ۶-Qadınlara məhəbbət. ۷-Helm.”

۲۰-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Mənim ümmətimdən yeddi əməl sahibi qiyamətdə peyğəmbərlər, şəhidlər, övliyalar və saleh bəndələrlə birgə gələr: ۱-Bir şəxsi (xərcini verib) həccə göndərən. ۲-Yardım istəyənə kömək edən. ۳-Bir yetimi böyüdüb başa çatdıran. ۴-Azğın şəxsi hidayət edən. ۵-Acı doyuzduran. ۶-Susuz şəxsə su verən. ۷-Qızmar gündə oruc tutan.”

۲۱-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Allah tərəfindən mənə belə vəhy gəldi: “Ey Əhməd! Yeddi sifətə malik olan şəxs abid sayıla bilər: ۱-Onu günahdan saxlayacaq təqvası olan şəxs. ۲-Yersiz və boş sözlər danışmayan. ۳-Ağlamaq gətirən qorxu. ۴-Xəlvətdə həya edib, Məndən xəcalət çəkən. ۵-Ehtiyacını ödəyəcək yeməklə qənaətlənən. ۶-Dünya ilə düşmən olan (ona məftun olmayan). ۷-Saleh şəxsləri sevən şəxs.”

۲۲-Allah-taala yaratdığı yeddi asimana and içmişdir.

۲۳-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs könüllü olaraq və xalis niyyətlə öz malının zəkatını versə, ona yeddi asimanda yeddi ad verilər: Birinci asimanda “səxavətli”, ikinci asimanda “bəxşiş” edən, üçüncü asimanda “hökmdar”, dördüncü asimanda “xoş əxlaqlı”, beşinci asimanda “əta edən”, altıncı asimanda “bərəkətli” və yeddinci asimanda isə “bağışlanmış şəxs” adı verilər.”

۲۴-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs zəkat verməsə, yeddi asimanda ona yeddi təhqiramiz ad verilər: Birinci asimanda “paxıl”, ikinci asimanda “alçaq”, üçüncü asimanda “simic və xəsis”, dördüncü asimanda “qəzəb olunmuş”, beşinci asimanda “eybəcər sifətli”, altıncı asimanda “bərəkətsiz” və yeddinci asimanda isə “namazı qaytarılıb üzünə vurulan” şəxs.”

səh:۱۳

---

۱- [۷۲] Yenə orada, səh. ۱۶.

۲- [۷۳] “Töhəful-üqul”, səh. ۱۹۲.

۳- [۷۴] “İsna-əşəriyyə”, səh. ۲۴۵.

۴- [۷۵] “Xisal”, ۲-ci cild, shə. ۱۰۸.

Süfyan ibni Əbi Leyla deyir: Rum padşahı imam Həsən (ə)-dan anası olmadan-۲۵ dünyaya gələn yeddi varlıq haqqında soruşduqda, Həzrət buyurdu: “Adəm, Həvva, İbrahim (ə)-ın qoçu, Saleh (ə)-ın dəvəsi, (Adəmi aldadan) behiştdəki ilan, (Habil və Qabilin hekayəsində) Allah-taalanın yeri qazmaq (və meyyiti dəfn etmək) üçün (göndərdiyi qarğa və Allahın lənətlədiyi İblis.”(۱

İmam Əli (ə) buyurmuşdur: “Yeddi xassiyyətə malik olan şəxs mömindir: “۱-Halal-۲۷ mal qazanan şəxs. ۲-Əxlaqı yaxşı olan şəxs. ۳-Qəlbi təmiz olan şəxs. ۴-Çoxlu bəxşiş edən şəxs. ۵-Az danışan şəxs. ۶-Camaatın onun əlindən amanda qaldığı şəxs. ۷-(Başqaları ilə insafla davranan şəxs.”(۲

İmam Əli (ə) buyurmuşdur: “۱-Əgər yoldaş istəyirsənsə, Allahı özünə yoldaş seç. ۲--۲۸ Dünya istəyirsənsə, ondan ibrət dərsi al. ۳-Dost istəyirsənsə, (yaxşı) əməl sahibləri ilə dost ol. ۴-Kəsb və ticarət istəyirsənsə, ibadət et. ۵-Ürək yoldaşı istəyirsənsə, Quran oxu. ۶-Nəsihət eşitmək istəyirsənsə, ölümü yad et. ۷-Əgər ölüm kifayət etməsə, ”.cəhənnəm odu kifayət edər

İmam Əli (ə) buyurmuşdur: “۱-Günahsız nemət səmadan ağırdır. ۲-Haqq yerdən-۲۹ geniş və əhatəlidir. ۳-Dənizdən də ehtiyacsız, qane olan kişinin qəlbidir. ۴-Münafiqin qəlbi daşdan möhkəmdir. ۵-Zülmkar padşah atəşdən də hərarətlidir. ۶-Paxıla möhtac ”.olmaq buzdan da soyuqdur. ۷-Zəhərdən də acı səbirdir

İmam Əli (ə) buyurmuşdur: “Elm yeddi səbəbə görə mal-dövlətdən üstündür: ۱-Elm-۳۰ peyğəmbərlərin mirası, mal-dövlət isə fironlar mirasıdır. ۲-Elmi başqasına verməklə azalmaz, mal-dövləti isə başqasına verməklə azalar. ۳-Mal-dövlət qorucuya ehtiyaclıdır, elm isə öz sahibini qoruqçusudur. ۴-Elm kəfənə daxil olur, mal-dövlət isə (qəbirdən çölə) qalır. ۵-Mal-dövlət həm mömin, həm də kafir üçün, elm isə yalnız mömin üçün hasil olur. ۶-Bütün insanlar din işlərində alimə möhtac olur, mal-dövlət sahibinə isə möhtac olmurlar. ۷-Elm Sirat körpüsündə yardımçıdır, mal-dövlət isə ”.(Sirat körpüsündən) keçməyə mane olur

İmam Sadiq (ə) buyurmuşdur: “Möminin sizin üzərinizdə yeddi haqqı vardır: ۱--۳۱ İnsanın özünə istədiyini onun üçün də istəmək. ۲-Onun hacətlərini yerinə yetirməkdə əlindən gələni əsirgəməmək. ۳-Bədən (əl, ayaq və s.) üzvləri ilə ona kömək etmək. ۴-

Onun eyblərini örtmək. ۵-Sən tox, o isə ac olmasın. ۶-Onun işlərinə kömək etmək. ۷-Xəstə olanda görüşünə getmək və dünyasını dəyişəndə dəfn mərasimində iştirak (etmək."(۳

İmam Sadiq (ə) buyurmuşdur: "Allah-taala İslamı yeddi hissəyə bölmüşdür: ۱-Səbr.-۳۲ (۲-Düz danışmaq. ۳-Yəqin. ۴-Ümid. ۵-Vəfa. ۶-Elm. ۷-Helm."(۴

Salman Farsi demişdir: "Paxıl yeddi bəlaya düçar olar: ۱-Ölər və mal-dövləti-۳۳ vərəsələrinə qismət olar. ۲-Zülmkar şəxs onun mal-dövlətini əlindən alar. ۳-Xeyirsiz bir şeyə aşiq olub, bütün mal-dövlətini ona çatmaq üçün xərc edər. ۴-Ev tikmək fikrinə düşdükdə, mal-dövlətini dağıdar. ۵-Boğulmaq, odda yanmaq və oğurluğa ittiham olunmaq kimi bədbəxtliyə düçar olar. ۶-Əlacsız xəstəliyə tutular və mal-dövlətini onun ".yolunda xərcləyər. ۷-Pulunu gizlədər, lakin harada gizlətdiyini unudar

Bir hikmət sahibi demişdir: "Bir neçə qrupa təəccüb edirəm: ۱-Allahı tanıyıb, Ona-۳۴ itaət etməyənə. ۲-Savab qazanmağa ümidi olduğu halda, heç bir iş görməyənə. ۳-Allahın əzabından qorxduğu halda, günahlardan çəkinməyənə. ۴-Elmin fəzilətlərini bilə-bilə, onun ardınca getməyib, savadsız qalana. ۵-Bütün nemətlərdən ayrılacağını bilə-bilə, onu dünyaya



---

.Yenə orada [۷۶] -۱

.Xisal", ۲-ci cild, səh. ۲۰" [۷۸] -۲

.Yenə orada, səh. ۱۸ [۷۹] -۳

.Yenə orada. səh. ۲۴ [۸۰] -۴

sərf edənə. ۶-Axirət aləminə köç edəcəyinə yəqin etdiyi halda, çirkin işlərlə məşğul olub, oranı xarab edənə. ۷-Arzular içərisində qərq olub, ölüm haqqında ”.fikirləşməyənə

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ramazan ayında Allah xatirinə oruc-۳۵ tutan elə bir mömin yoxdur ki, Allah-taala ona yeddi şeyi əta etməsin: ۱-Bədənindəki haram ətlər əriyər. ۲-Allahın rəhmətinə yaxınlaşar. ۳-Babası Adəmin (behiştdə qadağan olunmuş ağacın meyvəsindən yediyi üçün) xatasınının üstünü örtər. ۴-Ölüm anlarının çətinliklərini ona asan edər. ۵-Qiyamətin aclıq və susuzluğundan amanda saxlayar. ۶-Allah-taala ona behiştin pak yeməklərindən yedizdirər. ۷-Allah-taala onu (cəhhənmə əzabından uzaq edər.”(۱

İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs bir gün acqarına yeddi ədəd xurma yesə,-۳۶ ”.Şeytan ona zərər yetirə bilməz

Yatan vaxtı yeddi əməli yerinə yetirmək müstəhəbdir: ۱-Dəstəmaz almaq. ۲-Misvak -۳۷ vurmaq. ۳-Üzü qibləyə yatmaq. ۴-Üç dəfə salavat göndərmək və yaxud “təsbihati-ərbəə” (Subhanəllahi vəl-həmdu lillahi və la ilahə illəllahu vəllahu əkbər) demək. ۵-Həzrət Fatimeyi-Zəhra (ə)-ın təsbihatını demək. ۶-Üç dəfə “İxlas” surəsini oxumaq. .۷-“Yəhkumu ma yuridu bi-izzətihi” zikrini bir dəfə demək

Hər gün sübh və axşam yeddi əməli yaddan çıxarmayın: ۱-Yetmiş dəfə tövbə-۳۸ etməyi. ۲-“Qədr” surəsini iyirmi bir dəfə oxumağı. ۳-On dəfə salavat göndərməyi. ۴-Otuz beş dəfə “La ilahə illəllah” deməyi. ۵-Otuz beş dəfə “Əl-həmdu lillah” deməyi. ۶-.Otuz beş dəfə “Subhanəllah” deməyi. ۷-Yüz dəfə “Allahu-əkbər” deməyi

Ariflərdən biri demişdir: Məqam və vəzifəni elmdə, alicənablığı təqvada, qüdrəti-۳۹ qənaətdə, Allahın mərhəmətini itaətdə, rahatlığı xatakar şəxslərdən uzaq gəzməkdə, təvazökarlığı haqqı qəbul etməkdə və həyatın ləzzətini nəfsin istəklərini tərk etməkdə .gördüm

Evdən çıxıb bir yerə getmək istədikdə, yeddi əməli yerinə yetirin: ۱-Sədəqə verin. ۲--۴۰ On doqquz dəfə “Bismillahir-rəhmanir-rəhim” deyin. ۳-“İxlas” surəsini altı dəfə altı tərəfinizə oxuyun. ۴-“Kafirun” surəsini bir dəfə oxuyun. ۵-“Nas” surəsini bir dəfə

.oxuyun. ۶-“Fələq” surəsini bir dəfə oxuyun. ۷-Bir dəfə “Ayətəl-kürsü”nü oxuyun

səh:۱۵

---

.Yenə orada, səh. ۱۳ [۸۱] -۱

## TƏQVALILARIN VƏ MÖMİNLƏRİN XİSLƏTLƏRİ

Qurani-kərimdə buyurulur: “Agah olun, həqiqətən Allah dostları (təqvalılar) üçün heç-۱ ”.bir nigaranlıq, qorxu, hüzn və qəm-qüssə yoxdur

Onlar: Allah-taalanın vacib buyurduqlarını yerinə yetirər, həzrət Peyğəmbər (s)-in-۲ .sünnəsinə əməl edər və Allahın haram buyurduqlarından uzaq olarlar

Allahdan həqiqi mənada qorxar, düz danışar, təvazökarlıqla yol gedər və çoxlu-۳ .Quran tilavət edərlər

.Gözlərini Allahın haram etdiklərindən saxlayarlar-۴

Həm ağır, həm də xoş günlərdə eyni vəziyyətdə olarlar. (Dünyanın ağır və ya xoş-۵ (.günləri onlara təsir etməz

Əgər Allah-taalanın müəyyən etdiyi əcəl olmasaydı, onların ruhu behişti görmək-۶ .şövqündən və cəhənnəm əzabının qorxusundan bir göz qırpımı belə, aram olmazdı

.Onlar sanki behişt və cəhənnəmi görmüş, orada yaşamışlar-۷

.Qəlbləri qəmgin, istəkləri az və özləri pak-pakizədir-۸

.Qiyamətin əbədi rahatlığını əldə etmək üçün dünyanın qısa günlərində səbir edərlər-۹

Dünya onları aldatmaq istəyər, lakin onlar dünya haqqında əsla fikirləşməzlər;-۱۰ dünya onları əsir etmək istəyər, lakin onlar canlarını qurban verməklə özlərini azad .edərlər

Gecələri oyaq qalıb ibadətlə məşğul olarlar, Quranı təfəkkürlə oxuyar və öz-۱۱ .dərdlərinin dərmanını Qurandan alarlar

.Səbirli alimlər və xalqın xeyrini istəyənlərdir-۱۲

.Onlara baxan şəxs, xəstə olmadıqları halda onların xəstə olduqlarını güman edər-۱۳

.Az əməllərindən razı qalmaz və yaxşı əməllərini çox sanmazlar-۱۴

۱۵-Daim öz nəfslərini danlayar və gördükləri əməllərdən qorxarlar.

۱۶-Onları tərifləyəndə, qorxuya düşərlər.

۱۷-Uzaqgörən, rəftarları mülayim və dindarlıqda güclüdürlər.

۱۸-İmanları yəqinlə birgədir və elm öyrənməyə hərisdirlər.

۱۹-İbadətdə təvazökar, çətinliklərdə və müsibətlərdə səbirlidirlər. Sakit qalanda qəmgin olmaz və ucadan gülməzlər.

۲۰-Pak və halal ruzini öz zəhmətlərilə və Allahın razılığı üçün əldə edərlər.

۲۱-Dünyanın mal-dövlətinə, cah-cəlalına qarşı zahid və rəğbətsiz olar, mal-dövlət yığıb onunla fəxr etməz və əldə etdikləri mal-dövləti Allahın vacib etdiyi istiqamətdə xərcləyərlər.

۲۲-Qürurdan, xudpəsəndlikdən uzaq olar və başqaları ilə əlaqə yaratmaq istədikdə hiylə işlətməzlər.

۲۳-Gündüzlərini şükür etməklə, gecələrini isə Allahı yad etməklə sona çatdırarlar.

۲۴-Gecələri qorxu halında yatıb, sevinclə durarlar; qorxuları qəflətə düçar olacaqlarına, sevincləri isə onlara şamil olan lütf və mərhəmətə görədir.

۲۵-Nəfslərini istədikləri şeydən məhrum edər və tamahkar olmazlar.

۲۶-Səbirləri elmlə, sözləri əməllə birgədir.

۲۷-Arzuları yaxın, səhv, xata və yeməkləri azdır, işləri asan və nəfsləri qanedir.

۲۸-Dinləri qorunmuş, harama olan ehtirasları ölmüş və qəzəbləri sönmüşdür.

۲۹-Camaat onların xeyir işlərinə ümidvar olar, əzab-əziyyətlərindən amanda qalar, onlar hamıya xeyir verər və kimsəyə əzab-əziyyət verməzlər.

۳۰-Əgər qafillərin arasında olsalar, adları Allahı yad edənlər sırasında yazılar; əgər Allahı yad edənlər arasında olsalar, adları qəflətdə olanların sırasında yazılmaz.

.Onlara zülm edən şəxsləri bağışlayar və əmanətə xəyanət etməzlər-۳۱

Pis söz danışmazlar; söhbətləri mülayim, pis işləri gizli və yaxşı işləri aşkar olar,-۳۲
.çətin günlərdə səbir və xoş günlərdə şükr edərlər

Onların əleyhinə şəhadət verilməmişdən öncə, haqqı etiraf edər və onlara-۳۳
.tapşırılanları layiqincə yerinə yetirərlər

Camaatı pis ləqəb və adlarla çağırmaz, başqalarının müsibətlərində şad olmaz,-۳۴
.haqqın mehvərindən çıxmaz və qonşularla gözəl davranarlar

İmam Sadiq (ə) buyurmuşdur: "Yaxşı əməlindən şad, pis əməlindən isə qəmgin olan-۳۵
".şəxs mömindir

səh:۱۶

٣۶- İmam Sadiq (ə) buyurmuşdur: “Möminin üç əlaməti vardır: ١-Allaha mərifəti. ٢-Allahın dostları ilə dost olmaq. ٣-Allahın düşmənləri ilə düşmən olmaq.”

٣٧- İmam Baqir (ə) buyurmuşdur: “Mömin dağdan da möhkəmdir; çünki dağdan bir şey götürmək olar, lakin mömінin dinindən bir şey götürmək olmaz (yəni mömінin dinini əlindən almaq qeyri-mümkündür).”

٣٨- İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs Allah xatirinə (bir kəsi) sevsə, Allah xatirinə (bir kəsə) nifrət etsə və Allah xatirinə (bir şey) əta etsə, onda o, imanı kamil olan şəxslər sırasındadır.”

٣٩- İmam Baqir (ə) buyurmuşdur: “Həqiqətən, Allah-taala bir mömінin xatirinə bir kəndin məhv olmasının qarşısını alar. Həmçinin bir məntəqədə yeddi mömin olsa, o məntəqəyə əzab yetişməz.”

۴٠- İmam Sadiq (ə) buyurmuşdur: “Allah mömini dünyanın bəlalarından qoruyub saxlamaz, lakin dünyaya ürək bağlamaqdan və axirət bədbəxtliyindən amanda saxlayar.”

## İMAM ƏLİ (Ə)–IN FƏZİLƏTLƏRİ

١- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Allah-taala buyurur: “Əlinin vilayəti Mənim möhkəm (və alınmaz) qalamdır; hər kəs Mənim qalama daxil olsa, cəhənnəm odundan amanda qalar.”

٢- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Əlinin vilayəti Allahın vilayətidir; ona məhəbbət bəsləmək Allaha ibadət etmək və ona tabe olmaq isə vacib əməlləri yerinə yetirməkdir.”

٣- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəsdə Əlinin vilayətinin bəratı olmasa, Siratdan keçə bilməz.”

۴- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Əlinin vilayəti mənim vilayətim, mənim vilayətim isə Rəbbimin vilayətidir.”

۵- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Əlinin vilayəti Allahın vilayətidir, onu

”.sevmək ibadətdir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Mən hər kəsin mövlası və-۶
”.rəhbəriyəmsə, Əli də onun mövlası və rəhbəridir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Övladlarınıza Əli ibni Əbi Talib (ə)-a -۷
”.məhəbbət bəsləməyi əmr edin

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Səni (Əlini) sevən şəxs mömin, səninlə-۸
”.düşmən olan şəxs isə münafiqdir

səh:۱۷

۹- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Əli mənim kimidir; hər kəs ona tabe olsa, mənə tabe olmuşdur və hər kəs ondan üz çevirsə, məndən üz çevirmişdir. Mən və Əli Allahın bəndələrinə olan höccətiyik.”

۱۰- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ya Əli! Səninlə mənim münasibətim Harunla Musanın münasibəti kimidir; bu fərqlə ki, məndən sonra heç bir peyğəmbər gəlməyəcəkdir.”

۱۱- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Əli (ə) behiştə gedən ilk şəxsdir.”

۱۲- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Əgər bütün insanlar Əli (ə)-a məhəbbət bəsləsəydilər, Allah-taala cəhənnəm odunu yaratmazdı.”

۱۳- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Öz məclislərinizi Əlini yad etməklə zinətləndirin; çünki onda peyğəmbərlərin yetmiş xisləti vardır.”

۱۴- İmam Sadiq (ə) buyurmuşdur: “Peyğəmbər (s)-in Əli (ə)-ı vilayət məqamına seçdiyi gün müsəlmanların (Qədir) bayramıdır.”

۱۵- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Mənim ümmətimin ən üstün bayramı Qədir bayramıdır. Həmin gündə Allah-taala mənə əmr etdi ki, qardaşım Əlini ümmətimin bayraqdarı (rəhbəri) seçim.”

۱۶- İmam Kazim (ə) buyurmuşdur: “Əli (ə)-ın vilayəti bütün peyğəmbərlərin kitablarında qeyd olunmuşdur. Hər bir peyğəmbər yalnız Mühəmməd (s)-in nübüvvətinə və Əli (ə)-ın imamətinə dair əhd-peyman aldıqdan sonra peyğəmbərliyə seçilmişdir.”

۱۷- İmam Baqir (ə) buyurmuşdur: “Şeytan dörd dəfə nalə etmişdir: ۱-Allahın lənətinə səbəb olduğu gün. ۲-Yer üzünə gəldiyi gün. ۳-Peyğəmbəri-Əkrəm (s)-in peyğəmbərliyə seçildiyi gün. ۴-Qədir bayramı günü.”

۱۸- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ya Əli! Sən mənim canişinim və ümmətimin rəhbərisən. Sənə tabe olan şəxs xoşbəxtdir.”

۱۹- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Əli Allahın kitabının təfsirçisi və (insanları) Allaha doğru dəvət edəndir.”

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Mən və Əli bu ümmətin atasıyıq.-۲۰ Bizim bu ümmət üzərində olan haqqımız onların həqiqi atalarına qarşı olan hüquqlarından artıqdır. Çünki onlar bizə itaət etsələr, biz onları cəhənnəm odundan ((xilas edib) behiştə və səadətə doğru hidayət edərik.”(۱)

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Mən elmin şəhəri, Əli isə onun-۲۱ ”.qapısıdır. Hər kəs elm öyrənmək istəyirsə, mütləq o qapıdan daxil olmalıdır

İmam Əli (ə) buyurmuşdur: “Peyğəmbər (s) mənə min elm babını öyrətdi ki, hər-۲۲ ”.babdan min qapı açılırdı

.Həzrət Peyğəmbər (s) bütün elmləri imam Əli (ə)-a təlim verdi-۲۳

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Məndən sonra ümmətimin ən elmli-۲۴ ”.şəxsi Əlidir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ya Əli! Qiyamətdə mənə əta-۲۵ ”.olunacaq nemətləri sənin üçün də istəyirəm

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Əlinin məsəli Nuhun məsəli kimidir;-۲۶ ”.hər kəs onun gəmisinə minsə, nicat tapar və hər kəs ondan uzaq düşsə, qərq olar

.İmam Əli (ə) Kəbənin damında azan deyən birinci şəxsdir-۲۷

Allah evində (Kəbədə) dünyaya gələn və Allah evində (Kufə məscidində) şəhid olan-۲۸ .şəxs yalnız imam Əli (ə)-dır

İmam Əli (ə) Xeybər müharibəsində Mərhəbə dedi: “Mən anamın Heydər (həmlənin-۲۹ son məqamında olan şir) adlandırdığı şəxsəm ki, ovu ovlamaq üçün pusquda ”.oturmuşam

.İmam Əli (ə)-ın adı Allah-taalanın “Əliyyun Əla” adından götürülmüşdür-۳۰

İmam Əli (ə) dünyaya gələndə, həzrət Peyğəmbər (s) öz dilini (təbərrük olaraq)-۳۱ .imam Əli (ə)-ın ağzına qoydu və o həzrət Peyğəmbər (s)-in dilini sormağa başladı

İmam Əli (ə) Peyğəmbər (s)-ə iman gətirən birinci şəxsdir. Şeyx Salman Bəlxi deyir:-۳۲
".“Peyğəmbər (s)-in peyğəmbərliyə seçildiyi günün sabahı Əli (ə) İslamı qəbul etdi

.İmam Əli (ə) həzrət Peyğəmbər (s)-lə namaz qılan birinci şəxsdir-۳۳

.İmam Əli (ə) Allahın əmri və Peyğəmbərin vasitəsilə evlənən yeganə şəxsdir-۳۴

səh:۱۸

---

.Səfinətul-bihar", ۲-ci cild, səh. ۶۸۸“ [۸۲] -۱

۳۵-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Əli qiyamətdə “Həmd” bayrağını götürən şəxsdir və onun məqamı mənə hamıdan yaxındır.”

۳۶-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Əli “Kövsər” hovuzunun sahibidir.”

۳۷-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Məni sevdiyini deyib, Əlini düşmən tutan şəxs yalan deyir!”

۳۸-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ya Əli! Bir gün Cəbrail mənim yanıma gəlib dedi: “Ey Mühəmməd! Allah sənin səhabələrinə nəzər saldı, Əli (ə)-ın sənin ən yaxşı dostun olduğunu görüb, onu sənin canişinin və sənin tərəfindən xəbərləri çatdıran bir şəxs qərar verdi.”

۳۹-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Əli haqq ilə, haqq da Əli ilədir.”

۴۰-Allah-taala günəşi Əli (ə) üçün geri qaytardı və bu iş, həzrət Peyğəmbər (s)-in ümmətindən heç bir şəxs üçün baş verməmişdir.

## İMAM ƏLİ (Ə)-IN KUMEYLƏ ETDİYİ TÖVSİYƏLƏR

۱-Hər gün Allahın adını çək və Ona təvəkkül et.

۲-Bizi xatırla, adımızı dilinə gətir və bizə salam göndər.

۳-İnsanların yerinə yetirdiyi elə bir əməl yoxdur ki, mən onu görməyim.

۴-Bizdən qeyrisindən (və bizə əsaslanmayan) elm və hədis öyrənmə.

۵-Hər bir işə və hərəkətə qarşı elmin və mərifətin olsun.

۶-Yemək yeyəndə, Allahın adını çək ki, zərər çəkməyəsən.

۷-İnsanlara yaxşılıq et, paxıllıq etmə, Allah-taala bu işə görə sənə çoxlu savab verər.

۸-Yoldaşlarınla gülərüzlə rəftar et və xidmətçilərinin səhvlərini bağışla və onları ittihamlandırma.

۹-Yeməyi qurtarandan sonra Allaha ucadan həmd-səna et ki, başqaları da sənin səsini

.eşidib, Allaha həmd-səna etsinlər, bununla sənin savabın böyük olar

١٠-Doymamışdan bir az öncə, süfrədən çəkil ki, suya və havaya da yer qalsın; bu göstərişə əməl etsən, yemək sənin üçün bərəkətli olar. Bədənin sağlamlığı az yemək və içməkdədir.

١١-Zəkat verən, möminlərə yardım edən, yaxın adamları və qohum-əqrəbası ilə əlaqəsini möhkəmlədən şəxsin mal-dövlətində xeyir-bərəkət olar.

١٢-Yaxın adamlarından olan möminlərə başqalarından artıq yardım et, fəqirlərə sədəqə ver; çünki sədəqə bəlaları dəf edir.

١٣-Sənə tərəf əl uzadan şəxsi əli boş qaytarma, hətta bir xurmanın yarısı qədər verəməklə olsa belə.

١۴-Möminin ən gözəl zinəti təvazökarlığıdır.

١۵-Möminin gözəlliyi iffətindədir.

١۶-Möminin şərəfi və başıucalığı boş-boş danışmağı tərk etməsindədir.

١٧-Alçaq adamlarla mübahisə etmə, hətta sənə nalayiq sözlər desələr də belə. Səbirli ol və Allah-taalanın “cahil adam onunla mübahisə etdikdə, o cavabında salam verər” – deyə buyurduğu şəxslərdən ol!

١٨-Həmişə haqq söz de!

١٩-Pərhizkarlarla dostluq et və fasiqlərdən uzaq gəz!

٢٠-Münafiqlər və xainlərlə əlaqə yaratma.

٢١-Zülmkarların qapısını döymə və onlarla kəsb-ticarət etmə. Məbada, onlara baş əyib, ehtiram göstərəsən!

٢٢-Yoxsulluğunu camaata açıqlama, izzətlə yaşa və fəqirlik müqabilində səbir et.

٢٣-Səni çətinliklərdə yalqız qoymayan və müsibət üz verdikdə yardım göstərmək üçün əlindən gələnini əsirgəməyən şəxs sənin qardaşın sayılır.

Mömin möminin aynasıdır, onlar bir-birlərilə qardaşdırlar və qardaşa qardaşdan-۲۴
.əziz bir şəxs olmaz

Əgər bir şəxs sənə bir söz deyib, onun sirr olaraq saxlamasını səndən istəsə, onu-۲۵
.faş etməkdən həzər et, əks halda tövbən də qəbul olunmaz

Çətinliklərdən amanda qalmaq üçün "La hovlə və la quvvətə illa billahil-əliyyil-əzim!"-۲۶
.zikrini yaddan çıxartma

!Sənə hər bir nemət əta olunduqda, onun artması üçün "Əl-həmdu lillah" de-۲۷

Ruzin təxirə düşdükdə, tövbə et və Allahdan bağışlanmağını dilə ki, işlərin öz-۲۸
.qaydasına düşsün

.Vacib olan əməllərin tərk olunmasına qəti icazə verilməmişdir-۲۹

Allahın sənə əta etdiyi minlərlə nemətin müqabilində, Ona təşəkkür etməyi və Onu-۳۰
.yad etməyi unutma

.Allahı yad etməyənlərdən olma-۳۱

İstifadə etdiyin yeməklər halal olmasa, Allah-taala sənin şükrünü və zikrini qəbul-۳۲
.etməz

.Hər bir şəxsin əmanətini – kimliyindən asılı olmayaraq, – özünə qaytar-۳۳

Allah-taala bizi Öz əxlaqına doğru yönəltmiş, onu öyrənməyi və insanları ona-۳۴
.rəğbətləndirməyi bizə əmr etmişdir

Allaha and olsun, camaatın mənim əmrimə tabe olması üçün, onlara heç vaxt-۳۵
!yalvarmaram

Bəziləri bu fani və yalan dünyadan ləzzət aldılar, biz isə əbədi axirət aləmindən-۳۶
.fadalanıb ləzzət alacağıq

Bizi yaxşı əməllərə sövq edən Allahın təqvalılara əta etdiyi behiştin yüksək-۳۷
.mərtəbəsidir

۳۸-Behişt fikrində olmayanları ağır və əbədi əzabla müjdələ.

۳۹-Namaz qılmaq, oruc tutmaq və sədəqə vermək (təklikdə) mühüm deyildir, əhəmiyyət kəsb edən məsələ təmiz qəlbə, doğru niyyətə və xalis əmələ malik olmaqdır.

۴۰-Mən Allaha hər bir halda itaət və sitayiş edirəm. (Sən də həmişə Allaha itaət və sitayiş et!)

səh:۲۰

## İMAM ƏLİ (Ə)–IN QIRX SƏHABƏSİ

:Abdullah ibni Abbas-١

O, Peyğəmbər (s)-in əmisi oğlu, imam Əli (ə)-ın səfiri, nümayəndəsi və İslam ordusunun sərkərdəsi idi. İmam Əli (ə) uşaqlıq çağlarından ona İslam maarifini öyrətməyə başladı. O, fiqh, təfsir və təvil elmlərində, hətta ənsab elmində başqalarından tam şəkildə fərqlənirdi. Peyğəmbər (s) onun haqqında belə dua etmişdi: "İlahi! Onu din alimi et və Quranın təvilini ona öyrət." Cəməl, Siffeyn və Nəhrəvan müharibələrində imam Əli (ə)-ın ordusunda iştirak edərək şücaətlə döyüşürdü. O, Siffeyn müharibəsində imam Əli (ə)-ın ordusunun sol cinahının sərkərdəsi idi, imam Həsən (ə) və imam Hüseyn (ə) da onun ordusunda döyüşürdülər. İbni Abbas imam Əli (ə)-ın tərəfindən Bəsrənin valisi təyin edildi, və o həzrətin şəhadətindən sonra imam Həsən (ə)-ın hüzurunda idi. Abdullah ibni Zübeyr onu Taifə sürgün etdi. Ömrünün axırlarında gözləri tutuldu, amma yenə də İslam maarifini yaymaqdan əl çəkmədi, .nəhayət yetmiş bir yaşında ikən Taifdə vəfat etdi

:Əbuzər Qəffari-٢

Əbuzər adı ilə məşhur olan Cündəb İslamı qəbul edən ilk şəxslərdəndir (dördüncü, yaxud beşinci müsəlmandır). Məkkədə həzrət Peyğəmbər (s)-in hüzuruna gəlib İslamı qəbul etmiş, sonra öz tayfasının yanına qayıtmışdı. O, Ühüd, Bədr və Xəndək .müharibələrində iştirak etmiş və Xəndək müharibəsindən sonra Mədinəyə köçmüşdür

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Allah Əbuzəri bağışlasın! O, tək-tənha yaşayar, tək-tənha ölər və məhşərə də tək-tənha gələr." Həmçinin buyurmuşdur: "Hər ".kəs İsa ibni Məryəmin təvazökarlığına baxmaq istəyirsə, Əbuzərə baxsın

Osman onu Rəbəzəyə sürgün etmiş və hicrətin ٣١-ci (yaxud ٣٢-ci) ilində elə orada .vəfat etdi

:Bilal Həbəşi-٣

O, həzrət Peyğəmbər (s)-in səhabələrindən və İslamı qəbul edən ilk şəxslərdəndir, qara dərili bir qul olmuş və Bəni-Cəm qəbiləsində yaşamışdır. O, İslamı qəbul etdikdən

sonra Peyğəmbər (s)-in qatı düşmənlərindən olan Üməyyə ibni Xələf göstəriş verdi ki, onu Məkkənin yandırıçı qumları üstündə uzadıb, sinəsinin üstünə ağır daş qoyaraq ondan Allahı inkar etməsini istəsinlər. Lakin Bilal yeni qəbul etdiyi dinində sabitqədəm olmuşdur. Həzrət Peyğəmbər (s)-in göstərişi ilə Əbu Bəkr onu alıb, azad etmişdir. Bilal Peyğəmbər (s)-in apardığı müharibələrdə iştirak etmiş və o həzrətin azançısı və Mədinədə də azan deyən ilk şəxs olmuşdur. Peyğəmbər (s)-in vəfatından sonra bir dəfədən artıq azan deməmişdir, o da xanım Fatimeyi-Zəhra (ə)-ın göstərişi ilə olmuşdur. Bəzi tarixçilərin nəzərinə görə, "Həyyə əla xəyril-əməl" (xeyirli əməllərə tələsin) cümləsi azandan çıxarıldıqda, artıq o, azan deməyi tərk etmişdir. O, Əbu Bəkrlə beyət etməmiş və Ömərə demişdir: "Peyğəmbər (s)-in canişin və rəhbər təyin etmədiyi şəxsə beyət etmərəm!" Buna görə də Ömərin göstərişi ilə Mədinədən .Dəməşqə sürgün edildi və orada da altmış, yaxud yetmiş yaşında ikən vəfat etdi

:Cabir ibni Abdullah Ənsari-۴

O, Bədr müharibəsində iştirak etmişdir. Atası Abdullah da Ühüd müharibəsində şəhid olmuşdu. Onun vəsfində çoxlu rəvayətlər nəql olunmuşdur. İmam Baqir (ə)-ın dövrünə qədər yaşamış və Peyğəmbər (s)-in salamını o həzrətə çatdırmışdı. Cabir Peyğəmbər (s)-in apardığı bir çox müharibələrdə iştirak etmiş, imam Əli (ə)-ın vəfalı səhabəsi olmuş və Siffeyn müharibəsində şücaətlə döyüşmüşdü. İmam Hüseyn (ə)-ın qırxında o həzrətin qəbrini ziyarət edən ilk şəxs idi. Ömrünün axırlarında gözləri tutulmuş və .doxsan yaşında ikən vəfat etmişdir

:Şəhid İbrahim Əştər-۵

Malik Əştərin oğlu İbrahim şiə tarixinin şücaətli qəhrəmanlarından və imam Əli (ə), imam Həsən (ə) və imam Hüseyn (ə)-ın səhabələrindən biridir. O, Siffeyn müharibəsində atası ilə birgə Müaviyənin əleyhinə vuruşmuş və Muxtarla birlikdə Kərbəla şəhidlərinin intiqamını almaq üçün qiyam etmişdi. İbrahim ۶۷-ci hicri qəməri ilində Mosulda Übeydullah ibni Ziyad və Həsin ibni Nümeyri ələ keçirib, hər ikisini qətlə yetirdi. Muxtar məğlubiyyətə uğradıqdan sonra Əbdül-məliklə beyət etmədi, Şam və Müsəb orduları arasında baş verən

müharibədə öldürüldü. Onun başını kəsib Əbdül-məlikin yanına apardılar, bədənini isə yandırdılar.

۶-Şəhid Üveys Qərəni:

۷-Şəhid Əbu İshaq Bəsii:

O, Abdullahın oğlu və Yezid ibni Həsinin bacısı oğlu idi. İmam Əli (ə), İbni Abbas və digər səhabələri görmüşdü. Şiə və sünnü alimlərinin nəzərinə görə o, hədis elmində etimadlı şəxslərdən biridir. Əbu İshaq qırx il işa namazının dəstəmazı ilə sübh namazını (gecəni səhərə kimi oyaq qalıb) qılmışdı. Doxsan yaşında ikən Kərbəlada şəhadətə çatdı.

۸-Şəhid Əbul-buxtəri Tayi:

O, imam Əli (ə)-ın xüsusi səhabələrindəndir. Yəmən əhlindən olub, Kufədə yaşamış, şiə alimlərindən, hədisçilərindən olan tabeindir, əmanətdar və etimadlı şəxslərdən olmuşdur. Allah yolunda cihad etmiş, Həccac ibni Yusifin əleyhinə Məhəmməd ibni Əşəsin etdiyi qiyamda iştirak edib, şəhid olmuşdur.

۹-Əbu Tufeyl Kənani:

O, imam Əli (ə)-ın xüsusi səhabəsi, Cəməl, Siffeyn və Nəhrəvan mühаrbələrində o həzrətin bayraqdarı olmuşdur. Siffeyn müharibəsində şücaətlə döyüşmüş və Müaviyənin ordusunu məğlub etməkdə böyük rəşadət göstərmişdir. Buna görə də imam Əli (ə) ona təşəkkür etmişdir. O, Ühüd müharibəsi günlərində dünyaya gəldiyinə görə Peyğəmbər (s)-in səhabələrindən sayılırdı. O, Peyğəmbər (s)-in səhabələri arasında vəfat edən sonuncu şəxs olmuşdur.

۱۰-Şəhid Əbu Heysəm ibni Teyhan:

O, İslam dinindən qabaq Allahpərəst, ənsar arasında İslam dinini qəbul edən ilk şəxs idi və İslam dinini yaymaqda ciddiyyətlə çalışmışdır. Siffeyn mühаrbəsində iraqlı əsgərləri döyüşə təşviq etdi və elə bu müharibədə Əmmardan sonra şəhadətə nail oldu.

:Əbu Əyyub Ənsari-۱۱

O, Peyğəmbər (s) və imam Əli (ə)-ın səhabəsi olmuşdur. Həzrət Peyğəmbər (s) onun atasının gözlərinə şəfa vermiş və Mədinəyə hicrət edəndə, Mədinə məscidi tikilib qurtarana qədər onun evində məskunlaşmışdı. Əbu Əyyub Peyğəmbər (s)-in apardığı bütün müharibələrdə iştirak etmişdi. O həzrətin vəfatından sonra imam Əli (ə)-ın haqqını müdafiə etmiş, Osmanın qətlindən sonra imam Əli (ə)-la beyət edən ilk şəxs olmuş, Cəməl, Siffeyn və Nəhrəvan müharibələrində döyüşmüş və imam Əli (ə) .tərəfindən Mədinəyə vali seçilmişdir

:Şəhid Əbu Səmamə-۱۲

O, imam Əli (ə), imam Həsən (ə) və imam Hüseyn (ə)-ın səhabələrindən olmuş, Siffeyn müharibəsində iştirak və imam Həsən (s)-la beyət etmişdir. İmam Həsən (ə) şəhid olduqdan sonra Kufədə camaatı imam Hüseyn (ə)-a beyətə dəvət edirdi. Süleyman ibni Sürədin evində toplaşanlarla birlikdə imam Hüseyn (ə)-a bir məktub yazaraq o həzrəti Kufəyə dəvət etdilər. O, Kufədə həzrət Müslümlə birgə İbni Ziyadın əsgərlərilə döyüşdü. Gecə ikən Kufədən çıxıb, imam Hüseyn (ə)-a qoşularaq Kərbəlaya getdi və Aşura günü günortadan sonra şəhadətə çatdı. Onun qəbri imam Hüseyn (ə)-ın .hərəmində "şəhidlər məqbərəsi"ndə yerləşir

:Şəhid Əbu Düçaçə-۱۳

O, Peyğəmbər (s)-in səhabələrindən olmuş və o həzrətin vəfatından sonra imam Əli (ə)-la beyət etmişdir. Onun Yəmamə müharibəsində göstərdiyi şücaət və apardığı qəhrəmancasına döyüşlər məşhurdur. Bir nəzərə görə bu müharibədə, başqa bir nəzərə görə isə Siffeyn müharibəsində şəhid olmuşdur. İmam Sadiq (ə) onun haqqında buyurmuşdur: "Məhdi (ə) zühur edəndə Əbu Düçaçə onun səhabələrindən ".olacaqdır

:Əbu Rafe-۱۴

O, Abbas tərəfindən Peyğəmbər (s)-ə hədiyyə edilən bir qul idi, Cəfərlə birlikdə Həbəşistana getdi. Həzrət Peyğəmbər (s) onu Səlma ilə evləndirdi. O, Mədinəyə hicrət etdikdən sonra bütün müharibələrdə iştirak etmişdi. Peyğəmbər (s) onun barəsində buyurmuşdur: “Hər bir peyğəmbərin amanı vardır, mənim də amanım Əbu Rafedir.” Peyğəmbər (s) vəfat etdikdən sonra o, imam Əli (ə)-la beyət etmiş və o həzrətin vəfalı dostlarından biri olmuşdur. O, fiqh elmində “Əs-sünənu vəl-əhkamu vəl-qəzaya” adlı .ilk kitabı yazmışdır

:Səd ibni Malik-۱۵

O, ənsarın alimlərindən, həzrət Peyğəmbər (s) və imam Əli (ə)-ın böyük səhabələrindən və imam Əli (ə)-a beyət edən ilk şəxslərdəndir. Sədin atası Malik Bədr müharibəsində şəhadət məqamına çatmışdı, özü isə on üç yaşında ikən Ühüd müharibəsində iştirak etmiş, lakin yaşının az olmasına görə, ona cihad icazəsi verilməmişdi. Sonra Xəndək və digər müharibələrdə həzrət Peyğəmbər (s)-lə birgə .olmuşdur

O, Peyğəmbər (s)-dən min yüz yetmiş hədis rəvayət etmişdir. Hicrətin ۶۴-cü ilində yetmiş beş yaşında ikən Mədinədə vəfat etmiş və Bəqi qəbiristanlığında torpağa .tapşırılmışdır

:Əbu Səhər ibni Əbrəqə-۱۶

O, imam Əli (ə)-ın səhabələrindən idi, Siffeyn müharibəsində Şam əhalisindən olan bir qrupla birlikdə Müaviyənin ordusundan ayrılmış və imam Əli (ə)-ın ordusuna .qoşulmuşdur

:Əmr ibni Əl-həməq Xüzai-۱۷

O, imam Əli (ə)-ın səhabələrindən biridir, pak bir insan olmuş və o həzrətin hüzurunda İslam elmlərinə yiyələnərək yüksək məqamlara nail olmuşdu. Əmr Cəməl, Siffeyn və Nəhrəvan müharibələrində döyüşmüşdür. İmam Əli (ə) şəhadətə çatdıqdan sonra Hücr ibni Ədiyə kömək edir və Bəni Üməyyənin imam Əli (ə) haqqında nalayiq sözlər

deməsinə mane olurdu. Buna görə də İbni Ziyad Əmri tutmaq əmrini verdi. Əmr Mosula qaçıb bir mağarada gizləndi. Həmin mağarada onu bir ilan sancdı və o, dünyasını dəyişdi. Əmri təqib edənlər, onun cəsədini tapıb, başını bədənindən ayırıb İbni Ziyadın yanına gətirdilər. O da Əmrin başını Müaviyəyə göndərdi. Müaviyə isə .kəsik başı nizəyə keçirtdi. Bu işi İslam tarixində ilk dəfə Müaviyə görmüşdü

:Əbu Ümrə-١٨

O, imam Əli (ə)-ın xüsusi səhabələrindəndir. Həzrət onun qulağına "İsmi-əzəmi" (Allahın ən böyük adlarını) oxumuş və bunun sayəsində Quran hafizi olmuşdur. O deyir: "Mənim gözəl səsim var idi, ona görə də şer oxuyurdum. İmam Əli (ə) mənə buyurdu: "Nə üçün Quran oxumursan?!" Dedim: Quran oxuya bilmirəm. Həzrət buyurdu: "İrəli gəl." Mən o həzrətin yanına getdim, qulağıma bir söz dedi, lakin onun nə dediyini başa düşmədim, sonra ağzının mübarək suyunu mənim ağzıma atdı. Bundan sonra Quranı əzbərlədim." İmam Baqir (ə) bu barədə buyurmuşdur: "Əli (ə) Əbu Ümrənin qulağına ".Allahın ən böyük adını oxudu

:Əbu Qütadə Ənsari-١٩

Onun əsl adı Haris ibni Rəbidir. Peyğəmbər (s) və imam Əli (ə)-ın səhabəsi və mahir süvari olmuşdur. Buna görə də onu "Peyğəmbər (s)-in farisi" (at sürəni) adlandırırdılar. O, Ühüd və ondan sonrakı müharibələrdə iştirak etmiş və Peyğəmbər (s)-dən sonra Xalidin ordusunda olmuşdur. Lakin Xalidin çirkin və yaramaz əməllərindən xəbərdar olduqda, ondan ayrılıb, Mədinəyə qayıtdı və and içdi ki, heç vaxt Xalidin bayrağı altında olmayacaq. İmam Əli (ə)-ın dövründə öz şücaətini göstərmiş, o həzrətin bütün müharibələrində iştirak etmiş, nəhayət Kufədə dünyadan getmişdir. Vəfat edəndə ona .imam Əli (ə) namaz qıldı

:Şəhid Ümeyy ibni Qeys-٢٠

O, imam Əli (ə)-ın səhabəsi olmuş və Siffeyn müharibəsində şəhadətə çatmışdı. Onun etimadlı şəxs olmasını sünnülər də qəbul etmişlər. Bir gün qardaşı Əlqəmə onu yuxuda görüb axirət aləmi barədə soruşdu. O, cavabında dedi: "Biz müxaliflərimizlə bir yerə ".toplaşıb mübahisə etdik və güclü dəlillərlə müxaliflərə qalib olduq

:Übeyy ibni Kəb-۲۱

O, həzrət Peyğəmbər (s) və imam Əli (ə)-ın səhabəsi olmuş, Bədr müharibəsində iştirak etmiş və vəhyi yazanlardan olmuşdur. Həzrət Peyğəmbər (s) onunla Səid ibni Zeyd arasında

səh:۲۳

qardaşlıq əqdi oxumuşdu. O, Quran təfsirçisi və qabaqcıl qarilərdən olmuşdur. İmam Sadiq (ə) onun haqqında buyurmuşdur: “Biz Quranı onun qiraəti ilə oxuyuruq. O, Əbu ”.Bəkrin xilafətini qəbul etməyən on iki nəfərdən biridir

:Şəhid Asim Əzdi Kufi-٢٢

O, həzrət Peyğəmbər (s) və imam Əli (ə)-ın səhabəsi olmuş, imam Əli (ə)-ın apardığı müharibələrdə iştirak etmiş və nəticədə ayağına bir ox dəyərək onun axsamasına səbəb olmuşdur. O, Aşura hadisəsində Kufədən məxfi şəkildə çıxıb Kərbəlada imam Hüseyn (ə)-a qoşulmuş və Aşura günü sübh çağı İbni Sədin ilk hücumunda qəhrəmancasına döyüşərək şəhadət məqamına nail olmuşdur. Onun qəbri Kərbəlada .imam Hüseyn (ə)-ın hərəmində “şəhidlər məqbərəsi”ndə yerləşir

:Şəhid Əşrəs ibni Həssan Bəkri-٢٣

O, imam Əli (ə)-ın vəfalı səhabəsi olmuş, Siffeyn müharibəsindən sonra “həkəmiyyət” hadisəsində xəvariclə döyüşmüşdür. O, imam Əli (ə) tərəfindən Ənbar şəhərinin valisi təyin edilmişdir. Müaviyə öz qoşunu ilə həmin şəhərə hücum etdikdə, Həssan şücaətlə .vuruşmuş, nəhayət şəhadətə çatmışdır

:Şəhid Əyən ibni Zəbiə-٢۴

O, imam Əli (ə)-ın səhabələrindən olmuş və o həzrətin apardığı müharibələrdə iştirak etmişdir. Müaviyə Abdullah ibni Amiri Bəsrəyə göndərdi ki, Osmanın tərəfdarlarını Əli (ə)-ın əleyhinə döyüşə dəvət etsin. Digər tərəfdən də, imam Əli (ə) Əyəni Bəsrəyə göndərdi ki, orada öz qəbiləsi ilə söhbət edib, onları Abdullah ibni Amirin əleyhinə qiyama qaldırsın. Lakin onun söhbətləri heç bir təsir göstərmədi, geri qayıtmaq .istədikdə, xəvaricdən bir qrupu onu şəhadətə yetirdilər

:Şəhid Üməyyə Tai Kufi-٢۵

O, imam Əli (ə)-ın səhabələrindən, Kufədəki mübariz şiələrdən olmuş və həmişə Həzrətin apardığı müharibələrdə iştirak etmişdir. Onun Siffeyn müharibəsində göstərdiyi şücaət misilsiz idi. O, imam Hüseyn (ə)-ın Kərbəlaya daxil olmasını eşitdikdə, bir qrup şiə ilə birlikdə Kufədən məxfi şəkildə çıxıb Məhərrəm ayının ٨-də o həzrətə

qoşuldu. Aşura günü sübh vaxtı İbni Sədin qoşununun ilk hücumu nəticəsində şəhadət məqamına nail oldu. Onun qəbri Kərbəlada imam Hüseyn (ə)-ın pak hərəminin .“şəhidlər məqbərəsi”ndə yerləşir

:Şəhid Ənəs Kahili Əsədi-۲۶

O, həzrət Peyğəmbər (s) və Əhli-beyt (ə)-ın səhabələrindən olmuşdur. İmam Hüseyn (ə)-ın İraqa doğru hərkət etməsini eşitdikdə, (yaşlı olmasına baxmayaraq,) imam Hüseyn (ə)-a kömək etmək üçün Kufədən məxfi şəkildə çıxıb, Kərbəlaya getmişdir. İmam Hüseyn (ə) onun barəsində buyurmuşdur: “Ey şeyx! Allaha şükürlər olsun ki, sənin köməyini mənə nəsib etdi.” Ənəs düşməndən on səkkiz nəfərini qətlə yetirdikdən sonra şəhadətə çatdı. Onun qəbri imam Hüseyn (ə)-ın hərəminin “şəhidlər .məqbərəsi”ndə yerləşir

:Şəhid Sabit ibni Bünani Ənsari-۲۷

O, həzrət Peyğəmbər (s)-in və imam Əli (ə)-ın vəfalı səhabələrindən olmuş, Bədr və digər müharibələrdə iştirak etmişdir. Mərhum Əllamə Əmini onu Qədir-Xum hədisini nəql edən ravilərdən biri saymışdır. Peyğəmbər (s) onun şəhid olacağını ona xəbər .vermişdi. O, Siffeyn müharibəsində şəhadət məqamına nail oldu

:Şəhid Sabit ibni Übeyd Ənsari-۲۸

O, həzrət Peyğəmbər (s)-in böyük səhabəsi olmuş və adı da Bədr səhabələri sırasında yazılmışdır. O həzrətdən sonra imam Əli (ə)-a vəfalı qalmış və Siffeyn müharibəsində .şəhadətə çatmışdır

:Şəhid Cüveyriyyə-۲۹

O, imam Əli (ə)-ın vəfalı və etimadlı səhabələrindən biri idi. O həzrət həmişə onu görməyi arzu edir və ona buyururdu: “Hər dəfə səni görəndə xoşhal oluram.” Cüveyriyyə o həzrətin hədislərini nəql edən şəxslərdən olmuşdur. Nəhayət, Müaviyənin dövründə Əhli-beyt (ə)-a məhəbbət bəslədiyi üçün ayağını kəsdilər və .ağacdan asaraq faciəli şəkildə şəhid etdilər

:Şəhid Həbib ibni Məzahir-۳۰

O, imam Əli (ə), imam Həsən və imam Hüseyn (ə)-ın xüsusi və vəfalı səhabələrindən, habelə elmdə, zahidlikdə, təvazökarlıqda məşhur və Quran hafizi idi, çoxlu Quran tilavət edirdi. Kərbəlada yaşlı olmasına baxmayaraq, canla-başla döyüşüb, küfr .ordusundan altmış iki nəfəri öldürdükdən sonra şəhadətə çatdı

:Şəhid Hüçr ibni Ədiy-۳۱

O, həzrət Peyğəmbər (s)-in yaxın səhabələrindən olmuş, o həzrətin apardığı müharibələrdə iştirak etmiş və təqvası dillər əzbəri olmuşdu. Həmişə dəstəmazlı olar, gecələri ibadətlə keçirərdi. İmam Əli (ə)-ın da vəfalı səhabələrindən olmuş, Siffeyn, Çəməl və Nəhrəvan müharibələrində şüçaətlə döyüşmüş və Siffeyn müharibəsində imam Əli (ə)-ın ordusunun sərkərdəsi olmuşdur. Hücr o həzrətin şəhadətindən sonra Kufədə Müaviyənin əleyhinə çoxlu təbliğat apardı, nəhayət onun əleyhinə qiyam etdi. Ziyadla onun qoşunu arasında döyüş baş verib, onun özü və dostlarının şəhadətə .çatması ilə nəticələndi

:Şəhid Həkim ibni Cəbələ Əbdi-۳۲

O, həzrət Peyğəmbər (s) və imam Əli (ə)-ın səhabəsi olmuşdur. İmam Əli (ə)-ı sevməkdə məşhur idi. İmam Əli (ə) onun barəsində buyurmuşdur: "Həkim xalqı haqqa dəvət etdi və bu dəvətilə yüksək məqama nail oldu." Cəməl müharibəsi başlamazdan və imam Əli (ə) müharibə meydanına gəlməzdən öncə o həzrətin düşmənlərilə .döyüşüb üç qardaşı və bir neçə dostu ilə birgə şəhadət məqamına nail oldu

:Şəhid Rüşeyd Hücri-۳۳

O, imam Əli (ə)-ın şagirdi, sirdaşı və məxsus səhabəsi olmuşdur. Günlərin birində imam Əli (ə) öz səhabələri ilə birlikdə xurma bağına gedib, bir xurma ağacının altında oturdular. Həzrət buyurdu ki, həmin ağacdan xurma dərsinlər. Onlar da xurma dərib, yedilər. Bu zaman Rüşeyd Hücri dedi: "Ya Əmirəl-möminin, bu nə gözəl xurmadır!" Həzrət buyurdu: "Ey Rüşeyd! Səni bu xurma ağacından asacaqlar." Bundan sonra Rüşeyd həmişə o ağacın yanına gəlib, ona su verərdi. Nəhayət, bir gün o, həmin ağacın budaqlarının kəsildiyini gördü və öz-özünə dedi: "Deyəsən, mənim əcəlim yaxınlaşıb." Bir neçə gündən sonra İbni Ziyad məmur göndərib, onu çağırtdırdı və Əli (ə)-a tərəfdarlıq etməməsini tələb etdi. Lakin o, bu işdən imtina etdikdə, onun əl-ayağını və .dilini kəsdirib, həmin ağacdan asdırdı

:Şəhid Əmmar Yasir-۳۴

O, həzrət Peyğəmbər (s) və imam Əli (ə)-ın səhabələrindən idi. Anası Süməyyə İslam yolunda ağır əzab-əziyyətlər, dözülməz işkəncələrə məruz qaldıqdan sonra şəhadətə çatmışdı. Həzrət Peyğəmbər (s) hər dəfə onu gördükdə, buyurardı: "İlahi, Yasirin ailəsini (Əmmarın anasını) bağışla! Əlbəttə ki, Allah onu bağışlamışdır." Əmmar Peyğəmbər (s)-dən sonra Əbu Bəkrin xilafət kürsüsündə əyləşməsinə etiraz edən on iki nəfərdən biri idi və Siffeyn müharibəsində şəhadətə çatdı. İmam Əli (ə) onun şəhadətindən sonra buyurdu: "Əmmarın matəminə qəmgin olmayan şəxsin müsəlmanlıqdan nəsibi yoxdur. Həqiqətən, Əmmarın yeri behişt, qatilinin yeri isə .cəhənnəmdir!" Sonra Həzrət ona namaz qılıb, Siffeyndə torpağa tapşırdı

:Şəhid Kumeyl ibni Ziyad Nəxəi-۳۵

O, imam Əli (ə)-ın ən yaxın dostlarından olmuşdur və səhabələrin arasında böyük ehtirama malik idi. O, imam Əli (ə) tərəfindən Heyət məntəqəsinə vali təyin edilmişdi və ariflər onu o həzrətin sirlərinin sahibi kimi tanıyırdılar. İmam Hüseyn (ə)-ın da səhabəsi olmuşdur. Həccac İraqın valisi olduqdan sonra onun qətlinə hökm verdi. Kumeyl bu xəbəri eşitdikdə, qaçıb gizləndi. Həccac onu tapa bilmədiyi üçün Kumeylin qohum-əqrəbasının (beytül-maldan olan) hüquqlarını kəsdi. Kumeyl bu vəziyyətdən xəbərdar olduqda, qayıdıb özünü Həccaca təslim etdi və ona dedi: "Allah-taala qiyamət günündə mənimlə sənin aranda hökm edəcəkdir! Əli (ə) mənə xəbər vermişdir ki, məni sən öldürəcəksən." Həccac əmr etdi ki, onun başını bədənindən ayırsınlar. O, doxsan yaşında şəhadətə çatdı. Qəbri Kufə ilə Nəcəf arasında yerləşən .Səviyyədədir

:Şəhid Malik ibni Əştər-۳۶

O, imam Əli (ə)-ın ordusunun sərkərdəsi, o həzrətin ən yaxın dostu və səhabəsi, güclü, şücaətli, zahid, təvazökar, hörmətli və şan-şöhrətli bir şəxs idi. Malik öz mövlasının məktəbində insaniyyət dərsini öyrənmiş və öz qüdrət və gücünü yalnız haqq-ədalət yolunda sərf etmişdir. Siffeyn müharibəsində xəvaricin həkəmiyyət məsələsi ilə .əlaqədar israrları olmasaydı, artıq o, Müaviyənin və onun dostlarının kökünü kəsmişdi

İmam Əli (ə) ۳۸-ci hicri-qəməri ilində onu Misrə hakim təyin edib, onun üçün hökumət işləri və dünyanın bütün hökmdarları ilə əlaqədar olan nəsihətli və hikmətli bir

yazdı. Müaviyə bir casus göndərib, onu Əriş məntəqəsində zəhərlənmiş bal ilə şəhid etdi. İmam Əli (ə) onun şəhadətindən sonra buyurdu: "Mən Peyğəmbər üçün neçə idimsə, Malik də mənim üçün elə idi. Kaş, sizin içərinizdə onun kimi iki nəfər dostum "!olaydı

:Şəhid Məhəmməd ibni Əbu Bəkr-٣٧

O, imam Əli (ə)-ın xüsusi səhabələrindən, şiə aləminin ən böyük və yüksək məqama malik olan şəxsiyyətlərindən biridir. Məhəmməd o həzrətin xüsusi səhabəsi olmaqdan əlavə, həm də onu övladı sayılırdı. Onun anası Əsma, Cəfər ibni Əbi Talibin həyat yoldaşı idi. Cəfər şəhid olduqdan sonra, Əbu Bəkrə ərə getdi və Məhəmməd bu izdivacdan dünyaya gəldi. Əsma Əbu Bəkrin ölümündən sonra imam Əli (ə)-a ərə getdi və bununla da Məhəmməd o həzrətin evində tərbiyə olundu. İmam Əli (ə) Malik Əştərin şəhadətindən sonra Məhəmməd ibni Əbu Bəkri Misrə hakim təyin etdi. Müaviyə Əmr Asın başçılığı ilə Misrə bir qoşun göndərdi və onlarla Məhəmməd ibni Əbi Bəkrin arasında müharibə baş verdi. Əmr As Osmanın tərəfdarları ilə əlbir olub, Məhəmməd ibni Əbu Bəkri məğlub etdi və onun boynunu vuraraq cəsədini yandırdı. .Onun qəbri Misirdədir

:Miqdad-٣٨

O, həzrət Peyğəmbər (s)-in səhabələrindən və İslamı qəbul edən ilk müsəlmanlardandır. Peyğəmbər (s)-dən sonra "Əli (ə) şiəsi" adı ilə məşhur olan birinci şəxs idi. Həzrət Peyğəmbəri-Əkrəm (s) onun barəsində belə buyurmuşdur: "Allah-taala mənə əmr etmişdir ki, dörd nəfərə – Əliyə, Miqdada, Salmana və Əbuzərə məhəbbət bəsləyim." İmam Baqir (ə) buyurmuşdur: "Üç nəfər kafir olmadı: Salman, Əbuzər və Miqdad." O, hicrətin ٣٣-cü ilində Mədinənin yaxınlığında vəfat etdi. Qəbri .Bəqidə yerləşir

:Şəhid Meysəm ibni Yəhya Təmmar-٣٩

O, imam Əli (ə)-ın xüsusi səhabəsi, yaxın tərəfdarı, ardıcılı olmuş və o həzrətin məktəbində təlim-tərbiyə görmüşdü. Həzrət ona gizli sirləri və qeybi xəbərləri öyrətmişdi. Bəzən gələcəkdə baş verəcək işlər haqqında xəbər verirdi. Quran

təfsirində və fiqh elmində yüksək məqama çatmışdı. O, Bəni Əsəd qəbiləsindən olan bir qadının qulamı idi ki, imam Əli (ə) onu alıb, adını Meysəm qoymuşdu. Meysəm ismət və ədalət arasında olan bir məqama malik idi. Quran elmlərini o həzrətdən əxz etmiş, o da şəhadətindən öncə İbni Abbasa öyrətmişdi. Nəhayət, Übeydullah ibni Ziyad onu .tutub dar ağacından asdı

:Hani ibni Ürvə-۴۰

Hani imam Əli (ə)-ın səhabəsi idi, Fəhd qəbiləsində öz şücaəti ilə məşhur olmuş və Siffeyn müharibəsində iştirak edib, şücaətlə döyüşmüşdü. Bu müharibədə Şam ordusundan Yəmur ibni Üseyd adlı bir nəfər meydana çıxıb, imam Əli (ə)-ın ordusundakı döyüşçüləri mübarizəyə dəvət etdikdə, Hani demişdi: "Sübhanəllah! Nə üçün onunla mübarizə aparmaq üçün tələsmirsiniz?!" O, xəstə və yorğun olduğu halda, .meydana gedib, ağır mübarizə apardıqdan sonra, onu qətlə yetirmişdi

## PEYĞƏMBƏR (S)–İN ABDULLAH İBNİ MƏSUDA NƏSİHƏTLƏRİ

Abdullah ibni Məsud deyir: Günlərin birində səhabələrdən beş nəfərlə – şiddətli qıtlığa düçar olduğumuz halda, – həzrət Peyğəmbər (s)-in hüzuruna gedib, ərz etdik: "Ya :Rəsuləllah! Bu qıtlıq nə vaxta qədər davam edəcəkdir?" Həzrət buyurdu

Diri olduğumuz vaxta qədər! Həmişə Allaha şükür etmək lazımdır; çünki mən səmavi-١ kitabları oxumuşam, lakin orada səbir edənlərdən başqa bir kimsənin behiştə daxil .olacağını görməmişəm

Onlar Allaha itaət etmək və günahdan çəkinmək müqabilində səbir edir, halal mal-٢ qazanır, mötədilliklə xərc edir və öz xərclərinin çoxunu Allah yolunda sərf edirlər, nicat !tapanlar və əməli saleh olan şəxslər, məhz onlardır

Onlar vüqar və düşüncə sahibi, mülayimliklə rəftar edənlər, ibrət götürənlər,-٣ təqvalılar, (insanlara) yaxşılıq edənlər, İslam düşmənləri ilə Allah xatirinə düşmənçilik edənlər, əmanətə xəyanət etməyənlər, haqq yardımçıları və (onlara) pislik edənləri .bağışlayanlardır

Onlar bəlaya (və müsibətə) düçar olduqda dözümlü olur, nemət əldə etdikləri zaman-٤ şükür edir, düz danışır və verdikləri vədə xilaf çıxmırlar. Onlardan bir səhv və xata baş verdikdə, dərhal tövbə edir, yaxşı bir əməl yerinə yetirdikdə isə sevinirlər. Gecələri öz Rəbblərinə itaət etmək üçün namaza qalxıb, səcdə edirlər. Allaha and olsun ki, nicat !tapanlar, məhz onlardır

İndi isə) Allahın buyuruğuna qulaq as: "Əgər insanların hamısı eyni səviyyədə)-٥ olsaydılar, kafirlərin evlərini ləl-cəvahir, qızıl və gümüşlə bəzəyər, evləri üçün müxtəlif qapılar qərar verərdim... Lakin bunların hamısı dünya malıdır və Allah yanında olan axirət aləmi təqvalılar üçündür... Hər kəs axirəti abad etmək əzmində olub, onun üçün ".çalışsa və imanlı olsa, onun səyi və çalışması təqdirəlayiqdir

Behşit arzusunda olanlar yaxşı əməllər yerinə yetirmək üçün tələsir, cəhənnəm-٦ əzabından qoxur, ehtirası və nəfsin istəklərini tərk edir, maddi ləzzətlərdən üz çevirir .və ölümün intizarında olurlar. Zahidlər üçün dünya müsibətləri asan olur

Musa Allah ilə həmsöhbət seçiləndə, arıqlıqdan qarnı belinə yapışmışdı. O, Mədyən-٧ şəhərinin arxasında bir divarın kölgəsinə sığındığı zaman Allahdan yalnız aclığını qaldıracaq miqdarda yemək istədi. Əgər Davud peyğəmbərdən söhbət etməyimi istəyirsənsə, bil ki, o, Allahın yer üzündəki xəlifəsi idi. Onun paltarı yundan, yeməyi isə .təkcə arpa çörəyindən ibarət idi

Əgər Nuh peyğəmbərdən danışmağımı istəyirsənsə, bil ki, o, doqquz yüz əlli il-۸
ərzində camaatı Allaha doğru çağırdı, sübh yaşamağa, gecə isə sübh etməsinə ümidi yox idi. Paltarı yundan, yeməyi arpa çörəyindən ibarət idi. Süleyman peyğəmbərin hökmranlıq etməsinə baxmayaraq, özü arpa çörəyi yeyir, camaata isə ağ buğda çörəyi verirdi. Gecələri Allahla raz-niyaz və münacatla keçirir, əllərini boynuna .bağlayıb, sübhə qədər ibadət edirdi

İbrahim peyğəmbərin də paltarı yundan, çörəyi isə arpadan idi. Yəhya peyğəmbərin-۹
paltarı xurma lifindən toxunmuşdur, yeməyi isə ağac yarpaqlarından idi. İsa ibni Məryəmin həyatı isə qəribə idi. O, belə demişdir: “Göyərti yeməyim, paltarım yundandır, gecə vaxtları çırağım isə ayın işığıdır. Günlər ötüb keçir, lakin dünya ”.malından heç bir şeyim olmayan halda, yer üzündə məndən ehtiyacsız kimsə yoxdur

Peyğəmbərlər Allahın düşməni ilə düşmən idilər; Onun bəyənmədiyi şeyləri-۱۰
bəyənmir, onlara qarşı rəğbət bəsləmir və Allahın kiçik saydığı şeylərə də kiçik gözlə .baxırdılar

Allah-taala onları Öz kitabında tərifləmiş və Nuh peyğəmbər barəsində-۱۱
buyurmuşdur: “O, şükür edən bir bəndə idi.” İbrahim (ə) haqqında buyurulur: “Allah İbrahimi Özünə dost seçdi.” Davud (ə) barəsində buyurmuşdur: “Səni yer üzündə Öz xəlifəm qərar verdim.” Musa (ə) barəsində buyurmuşdur: “Allah Musa ilə söhbət etdi.” Həmçinin buyurmuşdur: “Mən onu insanlar arasından seçib, Özümə yaxın etdim.” Yəhya (ə) barəsində buyurmuşdur: “Ona uşaqlıqda hökm (hikmət) verdik.” İsa (ə) haqqında buyurmuşdur: “Ey İsa! Sənə və anana verdiyim neməti yada sal, o zaman ki, sənə Ruhul-qudusun vasitəsilə kömək etdim, beşikdə ikən insanlarla danışdın. Sən Mənim iznimlə palçıqdan bir quş surəti düzəldib, öz nəfəsini ona üfürürdün və o da quş ”.olurdu

Allah-taala buyurur: “Peyğəmbərlər yaxşılıqlara doğru tələsdilər. Onlar ürəklərində həm qorxu, həm də ümid olduqları halda Bizi çağırır və Bizim müqabilimizdə ”.təvazökarlıqla itaət edirdilər

Günah əməllərə qurşanan şəxsləri cəhənnəm odu, haram və günah işləri tərk-۱۲
edənləri isə behişt gözləyir. Sənə zahid olmağı (dünya malına məftun olmamağı) və

dünyanı tərk etməyi tövsiyə edirəm, çünki Allah-taala onun vasitəsilə mələklərə fəxr edir və onların vasitəsilə sənə nəzər edib, salam göndərir. Məndən sonra elə insanlar gələr ki, ləzzətli

yeməklər yeyər, sürətli miniklərə minər, özlərini, qadınların ərləri üçün bəzəndikləri şeylərlə bəzəyər, şərab içər, qumar oynayar, nəfsi istəklərə, maddi ləzzətlərə çulğalaşar, camaat namazını tərk edər, gündəlik və gecə namazlarının vaxtında yatar və gecələri dünyəvi ləzzətlər ardınca gedərlər. Allah-taala buyurur: "Özlərindən sonra namazlarını zay edən və nəfsani istəklər (ehtiraslar) ardınca düşən bir nəsil qoyub ".getdilər. Onlar azğın və əzaba düçar olan şəxslərdir

Dünyada maddi ləzzətlər və nemətlər içərisində yaşayıb nəfsin istəklərinə-۱۳ uyanların – axirət aləmində əbədi cəhənnəm odunda yanacaqları halda – onlardan bu dünyada bəhrələnməklərinin nə xeyri vardır?! Onlar böyük evlər və saraylar tikər, məscidləri zinət kimi saxlayar, qarın və qadın düşgünü olarlar, dünya malından başqa heç nə fikirləşməz, yediklərinin halal, yoxsa haram olmasına fikir verməzlər. Onlar məhz zəlalətdə olanlardır. İslam zühur edən ilk çağlarda qərib idi, gələcəkdə də qərib .olacaqdır. Buna əsasən, behişt və əbədi səadət qərib olanlar üçündür

Allahdan başqa heç kimdən, heç bir şeydən qorxma. Allah-taala buyurur: "Hər-۱۴ yerdə – (hətta) möhkəm və uca qalalarda olsanız belə, ölüm sorağınıza gələcəkdir. Hər kəs elmi dünya məqsədlərinə çatmaq üçün öyrənib, dünya məhəbbətini və zinətlərini ondan üstün tutsa, Allahın qəzəbinə düçar olar." Buna görə də onların yeri cəhənnəmin .ən aşağı mərtəbəsindədir

Allah-taala elmi öyrənib, ona əməl etməyənləri qiyamətə kor halda gətirər. Bu-۱۵ dünyada da onların ruzisinin xeyir-bərəkətini alar, özbaşına buraxar, nəhayət həlak olarlar. Allahla görüşə ümidvar olanlar saleh əməllər yerinə yetirməli və ibadətdə heç .bir kəsi Allaha şərik qoşmamalıdır

Pak, zahid və əməli saleh olan şəxslərlə yoldaşlıq et; çünki Allah-taala buyurur:-۱۶ "Pərhizkarlar müstəsna olmaqla, bu dünya dostları axirətdə bir-birlərinin ".düşmənləridir

Allahdan qorxmağı və təqvalı olmağı sənə tövsiyə edirəm! Allah-taala (həqiqi-۱۷ möminlər və təqvalılar barədə) buyurur: "Allah onlardan, onlar da Allahdan razıdırlar." .Bu məqama çatanlar yalnız Allahdan qorxub təqvalı olanlardır

۱۹-Haram yeməkdən, dünya və onun cah-cəlalından, ləzzət və şəhvətlərindən uzaq ol!

۲۰-Quran oxuyan zaman əmr və nəhy edən ayələrə çatdıqda, onun haqqında diqqətlə fikirləşib, ibrət dərsi al. Quranın nəhyi səni günahı tərk etməyə, əmri isə yaxşı əməllər görməyə dəvət edir.

۲۱-Heç bir günahı kiçik sayma və böyük günahları tərk et. İnsan qiyamətdə günahlarına baxanda, gözündən yaş əvəzinə qan və çirk gələr.

۲۲-Sənə “Allahdan qorx!” – deyiləndə qəzəblənmə. Arzularını azalt, qəlbini yalnız Allaha bağla; çünki Allah, Onunla görüşü arzulayanları çox sevir və görüşü məkruh olan (bəyənilməyən) şəxslərin görüşünə getməyi bəyənmir.

۲۳-Böyük saraylar, qəsrlər tikmək və bağ-bostan əldə etmək fikrində olma, çünki Allah-taala buyurur: “(Ey qafil insanlar! Mal-dövlət, oğul-uşaq və qohum-əqrəba) çoxluğu ilə öyünmək sizi (Allaha ibadət etməkdən, axirət üçün çalışmaqdan) yayındırdı.”(۱)

۲۴-Malına sələm qatanın günahı anası ilə zina edən şəxsin günahından böyükdür. Allah yanında şərab içən şəxs (istər az içsin, istərsə də çox) sələm yeyəndən pisdir və şərab bütün günahların açarıdır.

۲۵-Yaxşı əməl sahiblərinə zülm edib, çirkin işlərlə məşğul olanlara yardım edən, haqqı batil, batili isə haqq kimi qələmə verənlərin məqsədləri məhz dünyadır. Onlar özlərinin əyri yolda olduqlarını yaxşı bilirlər, lakin Şeytan onların pis əməllərini gözlərində zinətləndirmiş və nəticədə haqq yoldan azdırmışdır. Onların yeri cəhənnəmdir!

۲۶-Günaha batmaqdan həzər et. Günahın ləzzəti şərabın ləzzətinə bənzəyir, hətta ondan da pisdir.

۲۷-Əməlləri Allaha xatir və ixlasla yerinə yetir; çünki Allah-taala ixlasla yerinə yetirilməyən heç bir əməli qəbul etməz.

səh:۲۸

Dünyanın nemət və ləzzətlərindən, alçaq və ucalıqlarından əl çək, onlardan-۲۸ qorunub saxlanmaq üçün hazırlaş; çünki onların hamısından sorğu-sual olunacaqsan. Allah-taala bu barədə buyurur: “O gündə (qiyamətdə) nemətlərdən hökmən sorğu-”.sual olunacaq

Oruc tutmadığın və gecə namazı qılmadığın halda, camaat səni (bu xüsusiyyətlərlə)-۲۹ təriflədikdə xoşhal olma. Dünya və onun ləzzətləri səni axirət aləmi haqqında .fikirləşməkdən saxlamasın. Onları özün üçün oyun-oyuncaq qərar vermə

Çoxlu yaxşı və saleh əməllər yerinə yetir, günaha və ona mürtəkib olmağa doğru-۳۰ .tələsmə, tövbəni təxirə salma

Aldadıcı qanunlar çıxarma; çünki belə bir iş görən hər bir şəxs həm özünə, həm də-۳۱ başqalarına zərər yetirmiş olar. Dünyaya bel bağlama; çünki ondan tez bir zamanda .ayrılacaqsan

Aşkarda böyük və kiçik günah etməkdən çəkin, çünki harada olsan da, Allah-taala-۳۲ səni görür. Heç bir yerdə Allahı yaddan çıxarma və Ondan (Onunla müxalifət !etməkdən) qorx

Şeytanı özünə düşmən tut, haram mal yemə, haram paltar geyinmə və günah-۳۳ .etmə

Sənə tapşırılan mal-dövlətə və əmanətə xəyanət etmə. Ruzi əldə etmək üçün-۳۴ .qüssələnmə, çünki Allah-taala yer üzündə yaşayan heç bir varlığı ruzisiz qoymaz

Məni peyğəmbərliyə göndərən Allaha and olsun, dünya malını buraxıb, axirət-۳۵ !ticarətinə üz gətirən şəxsə Allah xüsusi nəzər yetirər

”?İbni Məsud dedi: “Ya Rəsuləllah! Axirət ticarəti necədir

Həzrət buyurdu: “Dilini Allahı yad etməkdən saxlama və həmişə “Sübhanəllahi vəl-həmdu lillahi və la ilahə illəllahu vəllahu əkbər” – de! Heç bir şeyi Allahı zikr etməkdən !üstün tutma

Saleh əməl sahiblərini sev, çünki insan qiyamətdə sevdiyi şeylə məhşur olacaqdır.-۳۶

.Əgər yaxşı işlər görməyə gücün çatmırsa, (heç olmazsa,) alimlərə məhəbbət göstər

Allahı yad etmək hər bir şeydən üstündür. Allah-taala buyurur: “Ən böyük ibadət-٣٧ Allahı yad etməkdir.” Başqa bir yerdə isə belə buyurur: “Məni yad edin ki, Mən də sizi ”!yad edim

Vüqarlı ol, qəlbinin aramlığını qoru, işlərində həddindən artıq tələbkar olma,-٣٨ insanları bağışla, onlarla mülayim davran, onlara ürək yandır. İbadət et, düz danış, əməllərini ixlasla yerinə yetir, ağıllı, imanlı, dözümlü, pak-pakizə ol, dünyanı tərk et və .sağlamlığını qoru

Əhl-əyalına məhəbbət bəsləməyin səni günaha və haram işlərə sövq etməsin.-٣٩ Çünki Allah-taala buyurur: “Qiyamət günündə pak qəlblə (Allahın hüzuruna) gələnlərdən başqa, övlad və mal-dövlət heç bir fayda verməyəcək.” Sənə Allahı yad etməyi və saleh əməl yerinə yetirməyi tövsiyə edirəm. Dilini qoru, çünki Allah-taala buyurur: “Qiyamət günündə ağızlarınızı möhürləyəcəyik, (onun yerinə) əl və ayaqlar ”.Bizimlə danışacaq və pis işlərinizə şəhadət verəcəklər

Sənə düz danışmağı tövsiyə edirəm; heç vaxt yalan danışma və insanlarla insafla-٤٠ rəftar et (zərərinə tamam olsa da, haqq söz deməkdən çəkinmə). Yaxşılıq et, camaatı da yaxşı işlərə dəvət et. Qohumluq əlaqələrini kəsmə, xalqı aldatma və əhd-peymana vəfalı ol. Camaata çətinlik törədən şəxslərdən olma, onların rahatlığı üçün səy et. Hər bir işi fikirləşəndən sonra yerinə yetir. Camaata deyil, yalnız Allaha baş əy və ”.günahlara israr etmə

səh:٢٩

## ƏXLAQ USTADIMIZIN NƏSİHƏTLƏRİ

.Bütün işlər sənə asan olsun deyə, ölümü həmişə yad et-١

Qeybət etmə, töhmət vurma, həsəd və paxıllıq etmə, çox danışma, gözü-٢ naməhrəmə baxmaqdan saxla, haqq sözlərə qulaq as, gecə namazını yaddan .çıxartma, hər an zikrlə məşğul ol, təfəkkür et və hər gün özündən hesab çək

Şeytan həmişə insanın sorağına gəlib, onu azğınlığa dəvət edir. Allah-taalanı yad-٣ .etməyi unutma; çünki Şeytan damardakı qana bənzəyir. Çoxlu tövbə edin

Öz taleyindən şikayətlənən şəxs kiçik ruha malikdir. Başqalarının tərifi ilə xoşhal olan-٤ .şəxs özünə inanmır

Zikrlərin ən gözəli Quran oxumaq, tövbə etmək ("Əstəğfirullah" demək), "La ilahə-٥ illəllah" kəlməsini və salvatı demək, dua etmək, imam Zaman (ə) tərəfindən sədəqə verməkdir. Hər vaxt dua etmək ruhiyyəsinə malik olmadınızsa, təklikdə Allahı yad .etməyi unutmayın

Həyatınızda proqram üzrə hərəkət etməyə səy edin, belə ki, səkkiz saat işə və-٦ dərsə, səkkiz saat istirahət və yatmağa, səkkiz saat ibadət, dua və mütəal Allahla raz-niyaza sərf edin. Heç vaxt bekar qalmayın, hətta faydasız iş tənbəllikdən və işsizlikdən .yaxşıdır

cismimiz xəstələndikdə təbibə müraciə edib, bəzi yeməklərdən pəhriz etdiyimiz-٧ halda, nə üçün ruhumuz xəstələndikdə (hər kəs imanının zəifliyi qədər ruhi xəstəliyə düçardır), qadağan olunmuş əməllərdən çəkinmirik?! Hər bir sözü danışır, hər bir şeyə nəzər salırıq; dilimizi, gözümüzü, qulağımızı haram şeylərdən saxlamır və əməlimizi .ixlasla yerinə yetirmirik

Həm mal-dövlət, həm də sair şeylər qəbrə qədər, elm və əməl isə qiyamət gününə-٨ qədər bizimlədir. Belə isə, saleh əməllər yerinə yetir, mal-dövlət yığma. İnsanlarla .deyil, mütəal Allahla ünsiyyətdə ol, bil ki, bu dünyada bir müsafir kimisən

Ölülərdən ibrət, keçmişdə yaşayanlardan isə nəsihət al; heç kəsin qəlbini sındırma,-٩

seyidlərə ehtiram göstər, xalqın əlində olanlara göz dikmə, dünya əyləncələri, oyun-oyuncaqları ilə məşğul olma; çünki ölüm səni qəfildən haqlayacaq. Dünya ləzzətlərinə ürək bağlayan şəxsləri ağıllı hesab etmə, ruzi barəsində qüssələnmə, nə qədər ki, .ömür var, ruzi də var

Məcburi dostlarınla (atan, anan, həyat yoldaşın, qonşuların və s. kimi şəxslərlə)-۱۰ .mehriban ol və onların ağrı-acılarına döz

Hədəf, fəaliyyət və müqavimət insanın müvəffəqiyyət rəmzidir. Sənin həyatdakı-۱۱ .hədəfin, yalnız Allah olmalıdır. Yaxşı əxlaqlı ol ki, bəsirət gözün açılsın

Keçmişin haqqında fikirləşmə, çünki o, artıq ötüb keçmişdir, hətta günəş də ona-۱۲ çata bilməz. Gələcək üçün də qüssələnmə, çünki sənin Allahın vardır. Allaha təvəkkül et və yalnız hazırkı vəziyyət haqqında fikirləş. Əgər yaxşı əməl yerinə yetirsən, həm .dünyada, həm də axirətdə səadətli və başıuca olarsan

Heç vaxt yalan danışma, çünki yalan danışan şəxs Allahın düşmənidir. Yalan-۱۳ danışmaqla bir xatanın üstünü örtmək, parcanın ləkələrini onu deşməklə aradan .aparmaq kimidir

Şücaət bədənin, səxavət isə mal-dövlətin bəxşişidir. Şücaətli ol və günahlarından-۱۴ .tövbə et, çünki bu iş insanı yüngülləşdirib Allaha doğru yönəldir

.Odu su ilə söndürdüyün kimi, şər işi də xeyir əməl yerinə yetirməklə söndürün-۱۵

Comərd şəxslər yandırıçı olan və dünyanı öz nuru ilə işıqlandıran axan ulduza-۱۶ .(meteroidə) bənzəyir

Şirinliklərin tamını dadmaq istəyirsinizsə, çətinliklərdə və müsibətlərdə dözümlü-۱۷ olun. Nəfslə mübarizə aparmaq acı dərmana bənzəyir və onu qəbul etməyin yaxşı .təsirləri vardır

.Allahı həmişə yad edənləri sən də yad et-۱۸

Sakit və asudə həyat sürmək istəyirsinizsə, kimsəyə özünüzdən danışmayın-۱۹ (sirrinizi başqasına verməyin). Sirr sizin əsirinizdir, lakin ağzından çıxsa, siz onun əsiri

.olarsınız

İnsanın nəfsi istəkləri içərisində heç bir şey tənbəllik qədər təhlükəli deyildir. Öz-۲۰
.vaxtında fürsətdən istifadə edin

səh:۳۰

Ölülərinizi yad edin; xüsusilə cümə günündə sədəqə vermək, salavat göndərmək,-۲۱
.namaz qılmaq və Quran oxumaqla onları yad edin

Səxavətli və əliaçıq ol, lakin mal-dövlətini xərcləməkdə ifrata varma (israf etmə),-۲۲
.onu hesab-kitab üzrə xərclə, lakin çox tələbkar olma

Nə qədər ki, günahların bağışlanmayıb, başqalarının eybini axtarma! Nə qədər ki,-۲۳
İlahi xəzinə vardır, qüssələnmə! Nə qədər ki, Allah vardır, başqasına ümidvar olma! Nə
!qədər ki, Şeytan vardır ki, onun məkr və hiyləsindən qafil olma

Heç vaxt yersiz xəyallar, puç və uzun-uzadı arzularla yaşama, himmət sahibi ol.-۲۴
Çünki himmət sahibi olan heç bir şəxs həyatın ağrı-acılarında ümidsizliklə üzləşməz,
.məyus olmaz

.Bütün ömrünü Allahı yad etməyə sərf et-۲۵

Nəfslə mübarizənin ilk şərti xəyallara dalmamaqdır. Çünki xəyal yüksəkliklərdə-۲۶
ucan bir quşa bənzəyir və insanın bədbəxt olmasına səbəb olur. Xəyal Şeytanın məkr
və hiyləsindən biridir və insanı bədbəxt edir. Belə isə, xəyalın hər yerə uçmasına icazə
.verməyin

Gecə namazı qılmaq məqsədilə yuxudan oyanmaq üçün yatanda dəstəmaz alıb,-۲۷
dişlərinizi fırça ilə yuduğunuz və üzü qibləyə oturduğunuz halda, ya üç dəfə "İxlas"
surəsini, ya "Kəhf" surəsinin axırıncı ayəsini oxuyun, ya xanım Fatimeyi-Zəhra (ə)-ın
.təsbihatını, ya da yüz dəfə "La ilahə illəllah" zikrini deyin

Hər ay heç olmazsa, üç gün oruc tutun, ayın birinci gününün (müstəhəb) namazını-۲۸
və quslunu yaddan çıxarmayın. Hər gün sübh və axşam, xüsusilə cümə və ayın birinci
.günündə sədəqə verin

Gecə və gündüzün müstəhəb (və otuz dörd rükətdən ibarət) olan nafilə namazlarını-۲۹
qılın, əgər vaxtında qıla bilməsəniz, onların (xüsusilə gecə namazının və sübh
.namazının nafiləsinin) qəzasını qılın

İmam Zaman (ə)-ın və digər imamların namazlarını qılmağı, xüsusilə Əhli-beyt (ə)--۳۰

a, ölülərə, şəhidlərə, alimlərə və qohum-əqrəbaya namaz qılıb hədiyyə etməyi unutmayın. Heç olmazsa, hər gün bir dəfə imamzadələrin, yaxud qəbir əhlinin ziyarətinə gedib, qəbiristan əhlinin ziyarət duasını oxuyun. Həftədə bir dəfə xəstələrin .görüşünə gedin, ölümü və başqalarının çətinliklərini yad edin

Evinizdə tərcüməli bir Quran və bir "Məfatihul-cinan" kitabı olsun, vaxtınız olduqda,-۳۱ .onları oxuyun

Başqaları ilə az əhd-peyman bağlayın; əgər əhd-peyman bağlasanız da, hökmən-۳۲ .ona əməl edin

Sirrinizi, xəstəliyinizi və yoxsulluğunuzu başqalarından gizli saxlamağa səy edin,-۳۳ !çətinliyinizi dərhal dilə gətirməyin; bilin ki, çətinlikləri həll edən yalnız Allahdır

.Həmişə zikr etməyə və evdən çölə çıxdıqda, dilinizi qorumağa səy göstərin-۳۴

Həyatında Allah-taalanın göstərişlərinə əməl edən şəxsin yaxşı yaşamasına, axır--۳۵ aqibətinin yaxşılıqla sona yetməsinə və hər iki dünyada başıuca olmasına zəmanət .verilmişdir

.Həmişə dəstəmazlı olun; çünki dəstəmaz nurdur-۳۶

.Əgər Allah-taalanın buyuruqlarına əməl etsəniz, Allah da sizin istədiyinizi əta edər-۳۷

Heç olmazsa, həftədə bir dəfə "Camieyi-kəbirə", "Aşura", "Ərbəin", "Əminullah"-۳۸ ziyarətini, "Əhd", "Səmat", "Ali-Yasin", "Əşərat", "Kumeyl", "Nüdbə", "Təvəssül" .dualarını oxuyun, "Cəfəri Təyyar" və "Tövbə" namazlarını qılın

Allahın ən böyük adları olan surə və ayələri – "Həmd", "İxlas" və "Qədr" surələrini,-۳۹ eləcə də "Bəqərə" surəsinin ۱۴۸ və ۲۷۴-cü, "Ali-İmran" surəsinin ۱۶, ۱۷, ۱۸, ۲۶ və ۲۷-ci, "Əraf" surəsinin ۵۲-۵۶-cı, "Həşr" surəsinin ۱۹-cu ayəsindən axıra kimi və "Hud" .surəsinin ۹۰-۹۱-ci ayələrini çox oxuyun

Əhli-beyt (ə)-a məhəbbət bəsləməyi, onların (xüsusilə imam Hüseyn (ə)-ın) matəm-۴۰ !Məclisində iştirak etməyi unutmayın

## SALAVAT VƏ ONUN FƏZİLƏTİ

١- Allah-taala Qurani-kərimdə buyurur: “Həqiqətən, Allah və onun mələkləri Peyğəmbərə salavat göndərirlər. Ey iman gətirənlər! (Siz də) Peyğəmbərə salavat göndərin, salam deyin və (onun əmrinə) tabe olun!”(١)

٢- İmam Sadiq (ə) buyurmuşdur: “Qiyamət günündə ən fəzilətli əməl Məhəmməd və onun Əhli-beytinə salavat göndərməkdir.”(٢)

٣- İmam Sadiq (ə) buyurmuşdur: “Həzrət Mühəmməd (s)-in adı çəkiləndə o həzrətə çoxlu salavat göndərin; çünki hər kəs o həzrətə bir salavat göndərsə, Allah-taala min mələklə birgə ona min salavat göndərər. Belə bir savabı qazanmaq məqsədində olmayan şəxs nadandır, Allah, Peyğəmbər və onun Əhli-beyti ondan qəzəblidir.”

٤- İmam Sadiq (ə) həzrət Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu nəql etmişir: “Mənə və Əhli-beytimə salavat göndərmək nifaq və ikiüzlülüyü aradan aparır.”(٣)

٥- İmam Sadiq (ə) buyurur: Peyğəmbər (s) buyurmuşdur: “Mənə uca səslə salavat göndərin; çünki (bu iş) nifaqı aradan aparır.”(٤)

٦- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs mənə salavat göndərsə, amma Əhli-beytimə salavat göndərməsə, behiştin iyindən məhrum olar.”(٥)

٧- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Qiyamət günündə mənə ən yaxın şəxs mənə çoxlu salavat göndərən şəxsdir.”(٦)

٨- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurur: Cəbraildən “ən sevimli əməl hansıdır?” – deyə soruşduqda, o cavab verdi: “Sənə salam-salavat göndərmək və Əli ibni Əbi Talibə məhəbbət bəsləmək.”(٧)

٩- Ravi deyir: Peyğəmbər (s) sübh namazından sonra üzünü camaata tutub buyurdu: Ötən gecə əmim Həmzəni və qardaşım Cəfər Təyyarı yuxuda görüb, onlardan soruşdum: “Ən fəzilətli əməl hansıdır?” Cavab verib dedilər: “Sənə salavat göndərməkdən, (susuzlara) su verməkdən və Əli ibni Əbi Talib (ə)-ı sevməkdən fəzilətli bir əməl görmədik.”(٨)

Salavat – Peyğəmbər (s) və onun Əhli-beyti üçün rəhmət diləməkdir və hər kəs-۱۰
.onlara salavat göndərsə, sanki özünə rəhmət diləmişdir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs cümə günü sübh-۱۱
namazından sonra “Kafirun” surəsini on dəfə oxuyub, yüz dəfə “Əllahummə səlli ələn-
nəbiyyil-ummiyyi Muhəmmədin və alihi və səlləm!” – ibarəsi ilə salavat göndərsə,
”.məqsədinə nail olar

Hər kəs borcunu ödəmək, şəfa tapmaq, çətinliyini aradan qaldırmaq, Əhli-beytin-۱۲
şəfaətinə nail olmaq və çətin can verməkdən nicat tapmaq istəyirsə, on dörd min dəfə
“Əllahummə səlli əla Muhəmmədin və Ali-Muhəmmədin və əccil fərəcəhum və əhlik
.ədaəhum!” – desin

İmam Rza (ə) buyurmuşdur: “Mühəmməd və onun Əhli-beytinə salavat göndərmək-۱۳
təsbih (Subhanəllah), təhlil (Əl-həmdu lillah) və təkbir (Əllahu-əkbər) deməyin savabı
(ilə bərabərdir.”(۹

Hər kəs əsr namazından sonra Peyğəmbər və onun Əhli-beytinə yüz dəfə salavat-۱۴
göndərsə, imanı möhkəmlənər, heç vaxt borclu olmaz və qiyamət günündə ondan
.sorğu-sual edilməz

.Peyğəmbər və onun Əhli-beytinə salavat göndərmək Allahın razılığına səbəb olur-۱۵

Peyğəmbər və onun Əhli-beytinə salavat göndərmək günahların bağışlanmasına-۱۶
.səbəb olur

səh:۳۲

---

.Əhzab” surəsi, ۵۶-cı ayə“ [۸۴] -۱
.Vəsailuş-şiə”, ۴-cü cild, səh. səh. ۲۸“ [۸۵] -۲
.Yenə orada, ۲-ci cild, səh. ۱۲۱۱ [۸۶] -۳
.Miratul-üqul”, Əllamə Məclisi, ۱۲-ci cild“ [۸۷] -۴
.Yenə orada, ۱۲-ci cild, səh. ۹۶ [۸۸] -۵
.Kənzül-ümmal”, ۱-ci cild, səh. ۲۱۴۵“ [۸۹] -۶

٧- [٩٠] “Pərvərişi-ruh”, ٢-ci cild, səh. ٣۴٠.

٨- [٩١] Yenə orada, səh. ٣٣٩.

٩- [٩٢] “Əmali”, (Şeyx Səduq), səh. ٧٣, hədis: ۴.

Peyğəmbər və onun Əhli-beytinə salavat göndərmək asan can verməyə səbəb-۱۷
.olur

Peyğəmbər və onun Əhli-beytinə salavat göndərmək dünya əzab-əziyyətindən-۱۸
.xilas olmağa səbəb olur

Peyğəmbər və onun Əhli-beytinə salavat göndərmək axirət yolunun işıqlanmasına-۱۹
.səbəb olur

Peyğəmbər və onun Əhli-beytinə salavat göndərmək behiştə daxil olmağa səbəb-۲۰
.olur

Peyğəmbər və onun Əhli-beytinə salavat göndərmək Peyğəmbər (s)-in şəfaətinə-۲۱
.səbəb olur

Peyğəmbər və onun Əhli-beytinə salavat göndərmək onlarla birgə məhşur olmağa-۲۲
.səbəb olur

Peyğəmbər və onun Əhli-beytinə salavat göndərmək mələklərin sevinməsinə-۲۳
.səbəb olur

Peyğəmbər və onun Əhli-beytinə salavat göndərmək, Peyğəmbərin, salavat-۲۴
.göndərən şəxsə salam verməsinə səbəb olur

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Allahın adı və mənə salavatla-۲۵
(başlanmayan söhbətin heç bir xeyir-bərəkəti olmaz.”(۱

Bir gün həzrət Peyğəmbər (s) imam Əli (ə)-a buyurdu: “Sənə müjdə verməyimmi?!”-۲۶ Əli (ə) dedi: “Atam-anam sənə fəda olsun, sən həmişə bütün yaxşılıqlara müjdə verən olmusan.” Həzrət buyurdu: “Elə indicə Cəbrail mənə təəccüblü bir xəbər verdi.” Əli (ə) soruşdu: “Ey Allahın elçisi! O hansı xəbərdir?” Həzrət buyurdu: “Cəbrail mənə xəbər verdi ki, ümmətimdən bir nəfər mənə salavat göndərərək (onun ardınca) Əhli-beytimə də salavat göndərərsə, göylərin qapıları onun üzünə açılar və mələklər ona yeddi yüz dəfə salavat göndərər. O şəxs xatakar və günahkar olarsa, yarpaqlar (payızda) ağacdan (qopub) tökülən kimi, günahları tökülər və Allah-taala buyurar: “Ləbbeyk və

sədeyk, ey Mənim bəndəm (yəni hər nə istəsən, əta edər və istəklərini yerinə yetirərəm)!” Həmçinin Allah-taala mələklərinə buyurar: “Ey mələklərim! Siz bu bəndəm üçün yetmiş salavat göndərin, Mən isə ona yeddi yüz salavat göndərirəm.” Amma ümmətimdən bir kəs mənə salavat göndərərkən Əhli-beytimə salavat göndərməsə, onunla asiman arasında yetmiş hicab yaranar və Allah-taala buyurar: “La ləbbeyk və la sədeyk (yəni istədiyinizi yerinə yetirmərəm)! Ey mələklərim! (Bu bəndə) Peyğəmbərlə birlikdə onun Əhli-beytinə salavat göndərməyincə, onun duasını yuxarı aparmayın.” Beləliklə, Əhli-beytimi (salavatda) mənə qovuşdurmayınca, bu hicab və (manea də aradan getməz.”(٢

İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs Mühəmməd və Ali-Mühəmməd (s)-ə-٢٧ ”.salavat göndərsə, Allah-taala ona min salavat göndərər

Həzrət Adəm (ə) oğlu Şeysi çağırıb, onu özündən sonrakı xəlifə təyin edərək belə bir-٢٨ vəsiyyət etdi: “Oğlum! Həmişə Allaha itaət, insanlara isə yaxşılıq et. Mühəmməd (s)-in adını çəkməyi, ona salam göndərməyi yaddan çıxarma; çünki mən onun adının ərşə yazıldığını gördüm, səmalarda onun yad edildiyini və adının çəkildiyini eşitdim.” Şeys dedi: “Bu qədər izzət, şərəf və hörmətlə yad edilən Mühəmməd kimdir?” Həzrət Adəm (ə) buyurdu: “O, peyğəmbərlərin sonuncusu və onların içərisində behiştə daxil olan ”.birinci şəxsdir

İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs yüz dəfə “Ya Rəbbi səlli əla Muhəmmədin-٢٩ ”.və Ali-Muhəmməd” – desə, onun yüz hacəti qəbul olunar

İmam Sadiq (ə) Misbah ibni Bəsabəyə buyurdu: “Sənə bir şey öyrədimmi ki, onu-٣٠ deməklə Allah-taala səni cəhənnəm odundan qoruyub saxlasın?” Dedi: “Bəli!” O həzrət buyurdu: “Hər gün sübh çağı yüz dəfə “Əllahummə səlli əla Muhəmmədin və Ali- ”!Muhəmməd” de

İmam Sadiq (ə) buyurmuşdur: “Cümə gecəsi gəlib çatanda, mələklər əllərində qızıl-٣١ qələm və gümüş kağız olduğu halda asimandan nazil olar və cümə gününün qürubuna qədər, yalnız salavat göndərənlərə savab yazarlar.” Deməli, cümə günü və cümə .axşamı Peyğəmbər və onun Əhli-beytinə min salavat göndərmək müstəhəbdir

۳۲- İmam Baqir (ə) buyurmuşdur: “Cümə gecəsi heç bir əməl salavat qədər fəzilətli deyildir.”

səh:۳۳

---

۱- [۹۳] “Pərvərişi-ruh”, ۲-ci cild, səh. ۳۴۳.

۲- [۹۴] “Əmali”, Şeyx Səduq, səh. ۴۶۴, hədis: ۱۸.

İmam Rza (ə) buyurmuşdur: “Günahlarının kəffarəsini verə bilməyən şəxs-۳۳ Məhəmməd və onun Əhli-beytinə çoxlu salavat göndərsin; çünki salavat günahları (məhv edir.”(۱

İmam Hadi (ə) buyurmuşdur: “Allah-taalanın İbrahim (ə)-ı Özünə dost seçməsinin-۳۴ (səbəbi, onun Məhəmməd və Ali-Məhəmmədə salavat göndərməsi idi.”(۲

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Mənim adım çəkilən zaman salavat-۳۵ (deməyən şəxs paxıldır.”(۳

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Mənə salavat göndərməyi unudan-۳۶ (şəxs behişt yolunu itirmişdir.”(۴

Malik Cəhəni deyir: İmam Sadiq (ə)-a bir gül dəstəsi verdim. Həzrət gülü alıb, öpdü-۳۷ və gözünə qoydu. Sonra buyurdu: “Hər kəs gülü iyləyib gözünə qoysa, Məhəmməd və Ali-Məhəmmədə salavat göndərsin; çünki həmin şəxs nə qədər ki, gülü əlindən yerə (qoymayıb, Allah onu bağışlayar.”(۵

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Əməllərin zəkatı mənə salavat-۳۸ ”.göndərməkdir

İmam Sadiq (ə) buyurmuşdur: “(Qiyamət günü) əməllər ölçüləndə, Məhəmməd və-۳۹ (onun Əhli-beytinə salavat göndərməkdən ağır bir əməl olmaz.”(۶

İmam Sadiq (ə) buyurmuşdur: “Allaha edilən heç bir dua Məhəmməd və onun Əhli--۴۰ ”.beytinə salavat göndərməyincə, qəbul olunmaz

## YALAN DANIŞMAQ

Yalan danışmaq böyük günahlardandır. Allah-taalanın Qurani-kərimdə lənət etdiyi-۱ şəxslərdən biri də yalançıdır. Belə ki, “Nur” surəsinin ۷-ci ayəsində buyurulur: “Əgər ”!yalan deyirsə, Allah ona lənət etsin

(İmam Rza (ə) buyurmuşdur: “Düz danışın və yalandan uzaq olun.”(۷-۲

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Əgər mömin üzürsüz olaraq yalan-۳

danışarsa, yetmiş min mələk onu lənətləyər. Onun qəlbindən çıxan üfunətli iy ərşə (qalxar. Bu zaman ərşin gözətçiləri ona lənət yağdırar.”(۸

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Həqiqətən, ən böyük günah dilin-۴ (yalana adət etməsidir.”(۹

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Sizə ən böyük günahlardan xəbər-۵ verimmi?! Ən böyük günah Allaha şərik qoşmaq, ata-anaya qarşı pis rəftar etmək və (yalan danışmaqdır.”(۱۰

(Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Yalan insanın üzünü qara edir.”(۱۱-۶

səh:۳۴

---

.Vəsailuş-şiə”, ۴-cü cild, səh. ۱۲۱۲“ [۹۵] -۱

.Yenə orada [۹۶] -۲

.Kənzül-ümmal”, ۱-ci cild, hədis: ۲۱۴۲“ [۹۷] -۳

.Yenə orada, səh. ۲۱۶۰ [۹۸] -۴

.Ləaliul-əxbar”, ۲-ci cild, səh. ۱۵۷“ [۹۹] -۵

.Biharul-ənvar”, ۷۱-ci cild, səh. ۳۷۳“ [۱۰۰] -۶

.Biharul-ənvar”, ۷۸-ci cild, səh. ۳۴۷“ [۱۰۱] -۷

.Səfinətul-bihar”, ۲-ci cild, səh. ۴۷۴“ [۱۰۲] -۸

.Müstədrəkül-vəsail”, ۲-ci cild, səh. ۱۰۰“ [۱۰۳] -۹

.Cameus-səadət”, ۲-ci cild, səh. ۳۲۲“ [۱۰۴] -۱۰

.Müstədrəkül-vəsail”, ۲-ci cild, səh. ۱۰۰“ [۱۰۵] -۱۱

۷- Qurani-kərimdə yalan Allaha şərik qoşma sırasında vurğulanmışdır. Ayədə buyurulur: "...Murdar bütlərdən qaçın, yalan sözlərdən də çəkinin."(۱)

۸- İmam Baqir (ə) buyurur ki, Əli ibni Hüseyn (ə) öz övladlarına belə nəsihət edirdi: "Yalandan çəkinin, istər kiçik olsun, istərsə də böyük. Çünki kiçik yalan insanı böyük yalanı danışmağa cürətləndirir. Məgər bilmirsiniz ki, Allahın Rəsulu (ə): "Bəndə həmişə doğru danışarsa, Allah onu doğru danışanların cərgəsində, yox əgər ömrü boyu yalan danışarsa, onun adını yalançıların sırasına yazar" – deyə buyurub?!"(۲)

۹- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Yalan kiçik olsa belə, əməl dəftərində qeyd olunur."(۳)

۱۰- Yalan münafiqlik əlamətidir. Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Hətta oruc tutub namaz qılsa və özünü müsəlman bilsə də, üç xislətə malik olan şəxs münafiqdir: Əmanətə xəyanət etmək, yalan danışmaq və vədəyə xilaf çıxmaq."(۴)

۱۱- Yalançının imanı yoxdur və onlar İlahi ayələrə qarşı kafir olanlar və onları inkar edənlər cərgəsində hesab edilir. Allah-taala buyurur: "Yalanı ancaq Allahın ayələrinə inanmayanlar uydururlar. Onlar əsl yalançılardır!"(۵)

۱۲- İmam Əli (ə) buyurmuşdur: "Yalan danışmağı – istər zarafat, istərsə də ciddi olsun, – tərk etməyən bəndə imanın ləzzətini dada bilməz."(۶)

۱۳- İmam Baqir (ə) buyurmuşdur: "Həqiqətən, yalan imanı məhv edir."(۷)

۱۴- İmam Rza (ə) nəql edir ki, Peyğəmbər (s)-dən sual olundu: "İmanlı adam qorxaq olarmı? Buyurdu: "Bəli." Soruşuldu: "İmanlı adam simic olarmı?" Buyurdu: "Bəli." Dedilər: "Bəs yalan necə? İmanlı adam yalan danışarmı?" Buyurdu: "Xeyr."(۸)

۱۵- Həsən ibni Məhbub deyir ki, imam Sadiq (ə)-dan soruşdum: "Mömin simiclik edərmi?" Buyurdu: "Bəli." Soruşdum: "Mömin qorxaq olarmı? Buyurdu: "Bəli." Soruşdum: "Mömin kəzzab (çox yalan danışan) olarmı?" Buyurdu: "Xeyr." Sonra İmam buyurdu: "Mömin xəyanət və yalandan başqa hər şeyə adət edə bilər."(۹)

۱۷- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Sələmlərin ən pisi yalandır. (Çünki

(iqtisadi sələmdə şəxsin var-dövləti əlindən çıxır, yalanda isə imanın kökü kəsilir.)"(١٠

İmam Əli (ə) buyurmuşdur: "Yalan istər zarafatca olsun, istərsə də ciddi, nalayiq bir-١٨ hərəkətdir. Məsləhət deyildir ki, bir kəs öz övladına vədə versin, amma sonradan vədəsinə əməl etməsin. Çünki yalan insanı boşboğazlığa və məsuliyyətsizliyə tərəf (çəkir. Onun da nəticəsi cəhənnəmdir."(١١

Həzrət Peyğəmbəri-Əkrəm (s) Əbuzərə etdiyi nəsihətlərində buyurur: "Ey Əbuzər!-١٩ Vay olsun o adamın halına ki, camaatı güldürmək üçün yalan danışır. Vay olsun ona! (Vay olsun ona!"(١٢

Yalançı İlahi hidayətdən məhrum olar. Allah-taala buyurur: "Allah yalançı və nankor-٢٠ (olan kimsəni doğru yola müvəffəq etməz."(١٣

Qurani-kərimin başqa bir ayəsində buyurulur: "Şübhəsiz ki, Allah həddi aşanı və-٢١ (yalançını hidayət etməz."(١۴



---

.Həcc" surəsi, ٣٠-cu ayə" [١٠۶]-١

.Üsuli-kafi", ٢-ci cild, səh. ٣٣٨" [١٠٧]-٢

.Vəsailuş-şiə", ٨-ci cild, səh. ۵٧٧" [١٠٨]-٣

.Yenə orada, ١١-ci cild, səh. ٢۶٩ [١٠٩]-۴

.Nəhl" surəsi, ١٠۵-ci ayə [١١٠]-۵

.Üsuli-kafi", ٢-ci cild, səh. ٣۴, hədis: ١١" [١١١]-۶

.Biharul-ənvar", ۶٩-cu cild, səh. ٢۴٧" [١١٢]-٧

.Vəsailuş-şiə", ٨-ci cild, səh. ۵٧٣" [١١٣]-٨

.Yenə orada [١١۴]-٩

.Səfinətul-bihar", ٢-ci cild, səh. ۴٧٣" [١١۶]-١٠

.Vəsailuş-şiə", ٨-ci cild, səh. ۵٧٧" [١١٧]-١١

.Biharul-ənvar", ٧۴-cü cild, səh. ٨٨" [١١٨]-١٢

.Zümər" surəsi, ٣-cü ayə" [١١٩]-١٣

.Mömin" surəsi, ٢٨-ci ayə [١٢٠]-١۴

٢٢-İmam Həsən Əskəri (ə) buyurmuşdur: “Allah-taala şər və bəd əməllər üçün müxtəlif qıfıllar təyin etmişdir. O qıfılların açarı şərabdır. Yalan isə şərabdan da pisdir.”(١)

٢٣-İmam Həsən Əskəri (ə) buyurmuşdur: “Bütün çirkin əməllər bir evə yığışsa, o evin açarı yalan olar.”(٢)

٢٤-İmam Əli (ə) buyurmuşdur: “Yalan ən pis xəstəlikdir.”(٣)

٢٥-Yalanın psixoloji səbəbi alçaqlıq və özünə hörmətsizlikdir. Bu mətləb əxlaqi psixologiyada diqqət mərkəzində olmalıdır. Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Yalanın əsas səbəbi alçaqlıq və şəxsiyyətsizlikdən başqa bir şey deyildir.”(۴)

٢۶-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Yalan ruzini azaldır.”(۵)

٢٧-İmam Əli (ə) buyurmuşdur: “Söz gəzdirmək, qeybət etmək və yalan danışmaq qəbir əzabına səbəb olur.”

٢٨-İmam Sadiq (ə) buyurmuşdur: “Allah-taala huşsuzluğu yalançılara hakim kəsər.”(۶)

٢٩-İmam Sadiq (ə)-dan nəql olunmuşdur ki, həzrət Əli (ə) dəfələrlə minbərdə buyurardı: “Yaxşı olardı ki, müsəlman olan şəxs üç nəfərlə dostluq və yoldaşlıq etməkdən çəkinsin: Həyasız, axmaq və yalançı şəxsdən.”(٧)

٣٠-İmam Əli (ə) yalançı şəxs barəsində buyurmuşdur: “Yalançı ilə yaşamaq sənə yaraşmaz; çünki sənin sözlərini başqalarına, başqalarının sözlərini də sənə danışar. Birini qurtaran kimi o birini üstünə artırar. İş o yerə çatar ki, əgər düz danışsa belə, heç kəs inanmaz. Yalançı camaat arasında düşmənçilik və ədavət yaradaraq, ürəklərə kin-küdurət toxumu səpər. Belə isə, Allahdan qorxun və təqvalı olmağa adət edin, ehtiyatlı olun, görün kimlərlə dostluq edirsiniz.”(٨)

٣١-İmam Baqir (ə) buyurmuşdur: “Dörd nəfərlə dostluq etmə və onlardan uzaqlaş: Axmaqla, xəsislə, qorxaqla və yalançı ilə!”(٩)

٣٢-İmam Baqir (ə) buyurmuşdur: “Yalançı doğru danışarsa belə, heç kim ona inana bilmir.”(١٠)

33- Həzrət Əli (ə) bir hədisdə imam Həsən (ə)-a buyurdu: “Yalançı ilə dostluq etmə; çünki o, ilğım kimi sənə uzağı yaxın, yaxını isə uzaq göstərir.”(11)

Yalanın rəva görülən halları:

a) Zəruri hal və çarəsizlik zamanı:

34- İmam Sadiq (ə) buyurmuşdur: “Əgər insan çarəsiz qalıb təqiyyə halında yalandan and içərsə, heç bir eybi yoxdur.” Sonra belə buyurdu: “Hər bir haram zəruri hallarda halal olur.”(12)

b) İnsanlar arasında sülh və barışıq yaratmaq məqsədilə:

35- Həzrət Peyğəmbər (s) imam Əli (ə)-a vəsiyyət edərkən belə buyurdu: “Ey Əli! Allahın sülh və barışıq yaradan yalandan xoşu gəlir. Fitnə-fəsad salan doğru sözdən isə narazıdır.”(13) (Necə deyərlər, xeyirli yalan zərərli doğrudan yaxşıdır.)

36- Müaviyə ibni Əmmar imam Sadiq (ə)-dan belə nəql etmişdir: “Hər kim sülh və barışıq yaratmaq üçün yalan danışarsa, yalançı deyildir.”(14)

37- İsa ibni Həssan imam Sadiq (ə)-dan belə nəql etmişdir: “Bir gün gələr ki, insan hər bir yalan danışığa görə cavab verməli olar, yalnız üç nəfərdən başqa. Onlardan biri də iki nəfər arasında sülh və barışıq yaratmaq istəyən şəxsdir. Həmin şəxs onları barışdırmaq məqsədilə birinin yanında bir söz, digərinin yanında isə tam başqa bir söz deyir.”(15)

v) Döyüşdə hiylə işlədən və həyat yoldaşına vədə verən zaman:



---

1- [121] “Üsuli-kafi”, 2-ci cild, səh. 339, hədis: 3.

2- [122] “Biharul-ənvar”, 69-cu cild, səh. 236.

3- [123] “Müstədrəkül-vəsail”, 2-ci cild, səh. 100.

4- [124] Yenə orada.

5- [125] “Cameus-səadət”, 2-ci cild, səh. 322.

۶- [۱۲۶] “Biharul-ənvar”, ۶۹-cu cild, səh. ۲۵۱.

۷- [۱۲۷] “Üsuli-kafi”, ۲-ci cild, səh. ۶۳۹, hədis: ۱.

۸- [۱۲۸] Yenə orada.

۹- [۱۲۹] “Xisal”, ۱-ci cild, səh. ۲۲۶, hədis: ۸۹.

۱۰- [۱۳۰] Yenə orada.

۱۱- [۱۳۱] “Nəhcül-bəlağə”, “qısa sözlər” bölümü, hədis: ۳۸.

۱۲- [۱۳۲] “Vəsailuş-şiə”, ۱۶-cı cild, səh. ۱۳۷, hədis: ۱۸.

۱۳- [۱۳۳] Yenə orada, ۸-ci cild, səh. ۵۷۸.

۱۴- [۱۳۴] Yenə orada.

۱۵- [۱۳۵] Yenə orada.

Həzrət Peyğəmbəri-Əkrəm (s) imam Əli (ə)-a etdiyi vəsiyyətlərinin birində belə-۳۸ buyurur: “Ey Əli! Üç yerdə yalan danışmaq olar: Döyüşdə hiylə işlədərkən, kişi öz həyat (yoldaşına vədə verərkən və camaat arasında mehribanlıq yaradarkən.”(۱)

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ən böyük yalan üç növdür: Mənim-۳۹ demədiyim sözü mənə nisbət vermək, görmədiyi yuxunu yalandan demək və bir şəxsi (atasından başqasına nisbət vermək.”(۲)

İmam Sadiq (ə) buyurmuşdur: “Cəhənnəmə daxil olmağın səbəblərindən biri-۴۰ müsəlmanların haqqını mənimsəmək və mal-dövlətini həbs etmək (saxlayıb (verməmək) üçün yalandan and içməkdir.”(۳)

## İMAM HÜSEYN (Ə)–IN TÜRBƏTİ VƏ AŞURA ZİYARƏTİNİ OXUMAQ

Allah-taala Öz pak və müqəddəs zatına and içmişdir ki, hər kəs imam Hüseyn (ə)-ı-۱ Aşura ziyarətini – istər yaxından, istərsə də uzaqdan – oxumaqla ziyarət etsə, onun .ziyarətini qəbul edəcəkdir

.Hər kəs onu (İmamın haqqına arif olan halda) oxusa, behiştə daxil olar-۲

İmam Sadiq (ə) Səfvana buyurmuşdur: “Hər kəs bu ziyarəti oxusa, hacətləri rəva-۳ ”.olunar

Hər kəs bu ziyarəti, onun fəzilətli vaxtında – sübh namazından sonra və gün-۴ çıxmamışdan qabaq – oxusa, ona həm axirətdə savab verilər, həm də bu dünyadakı .hacətləri qəbul olunar

.Hər kəs onu oxusa, qiyamət günündə istədiyi şəxsi şəfaət edər-۵

İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs bir xəstəliyə tutulsa və əcəli yaxınlaşmadığı-۶ ”.halda, imam Hüseyn (ə)-ın türbətindən istifadə etsə, şəfa tapar



---

.Biharul-ənvar”, ۷۴-cü cild, səh. ۵۱“ [۱۳۶] -۱

.Yenə orada, ۱۵-ci cild, səh. ۴۲ [۱۳۷] -۲

۷-İnsan “Aşura” ziyarətini oxumaqla şiə olmasını isbat etmiş olur.

۸-Aşura ziyarətinin savabı bütün ziyarətlərdən üstündür.

۹-İmam Zaman (ə) onun oxunmasına təkid etmişdir.

۱۰-Bu ziyarət ruzini çoxaldır.

۱۱-Borcun ödənməsinə səbəb olur.

۱۲-Oğurlanmış malın tapılması üçün faydalıdır.

۱۳-Aşura ziyarətini oxumaq evlənməyi asan edir.

۱۴-İmam Sadiq (ə) buyurmuşdur: “İmam Hüseyn (ə)-ın türbətindən düzəldilmiş təsbehlə tövbə etmək (və yaxud başqa bir zikr demək) başqa bir torpaqla düzəldilmiş təsbehlə tövbə və zikr etməkdən fəzilətlidir.”

۱۵-Sonsuz qadının övlada sahib olmasına səbəb olar.

۱۶-Bu ziyarəti oxuyan şəxsin salamı imam Hüseyn (ə)-a çatır və hacəti qəbul olunur.

۱۷-Bu ziyarəti oxumaqla insanın qəm-qüssəsi aradan gedir.

۱۸-İnsanı can vermənin çətinliklərindən nicat verir.

۱۹-Qəbiristan əhlindən əzab götürülür.

۲۰-Aşura ziyarətini oxumaqla imam Hüseyn (ə) qəbiristana gəlib, orada uyuşanlara kömək edər.

۲۱-İmam Hüseyn (ə)-ın hərəmi – dörd fərsəxdən dörd fərsəxə qədər – behişt torpağından sayılır və qiyamət günündə behiştə əlavə olunar.

۲۲-Həzrət Fatimeyi-Zəhra (ə) Aşura ziyarəti oxunan məclislərdə iştirak edirdi.

۲۳-İmam Baqir (ə) və imam Sadiq (ə) hər il Aşura günündə “Aşura ziyarəti”ni oxuyurdular.

۲۴- Kərbəla torpağından başqa hər bir torpağı yemək haramdır, lakin onun az miqdarda yeyilməsinə tövsiyə edilmişdir; çünki hər bir dərdin dərmanıdır.

۲۵- İmam Hüseyn (ə)-ın türbəti selin gəlməsinin və zərərin qarşısını alır.

۲۶- Kərbəla torpağı Kəbənin və həzrət Peyğəmbər (s)-in hərəminin torpağından fəzilətlidir.

۲۷- İmam Baqir (ə) buyurmuşdur: “Hər kəs bu ziyarəti oxusa, Allah-taala onun məqamını yüz min dəfə artırar və (adını) imam Hüseyn (ə)-la birgə şəhid olanlar sırasında yazar.”

۲۸- İmam Hüseyn (ə)-ın türbətini üstündə saxlamağın həm savabı vardır, həm də insanı bəlalardan qoruyub saxlayır.

۲۹- İmam Hüseyn (ə)-ın türbətinə səcdə etmək yeddi hicabı aradan götürür, yəni namazın qəbul olunmasına səbəb olur.

۳۰- O həzrətin türbətinə qılınan namaz qəbul olur və savabı çoxdur.

۳۱- O həzrətin türbəti meyyitlə yanaşı qəbrə qoyulsa, o, qəbrin qorxusundan amanda qalar.

۳۲- İmam Zaman (ə)-ın Seyyid Əhməd Rəştiyə belə buyurduğu nəql olunmuşdur: “Siz nə üçün Aşura ziyarətini oxumursunuz? Aşura! Aşura! Aşura!”

۳۳- Mötəbər hədislərdə bəyan olunduğu kimi, imam Hüseyn (ə)-ın qəbrinin torpağı hər bir dərdin dərmanıdır, ən böyük dərman məhz budur!

۳۴- Bu ziyarət Allah tərəfindən təlim verilmişdir.

۳۵- Bir hədisdə göstəriş verilir ki, körpə doğulan zaman ağzına qoyduğunuz ilk şey imam Hüseyn (ə)-ın türbəti olsun ki, bu, onu bəlalardan amanda saxlayar.

۳۶- İmam Sadiq (ə) hər kəsə hədiyyə olaraq bir miqdar mal-dövlət göndərsəydi, onun içinə imam Hüseyn (ə)-ın türbətindən qoyardı və onun bərəkəti sayəsində həmin mal

.oğrunun əlindən amanda qalardı

Rəvayətdə deyilir ki, hər kəs imam Hüseyn (ə)-ın türbətindən yemək istəsə,-۳۷ əvvəlcə onu öpüb, gözlərinə sürtsün, sonra on doqquz dəfə “Bismillahir-rəhmanir-rəhim” deyib, “qul” (de) ifadəsilə başlanan dörd surəni oxusun. Ondan bir noxud miqdarından artıq meyl etməsin; çünki hər kəs ondan artıq yesə, sanki bizim ətimizi və .qanımızı yemişdir

İmam Kazim (ə)-dan nəql olunmuşdur ki, meyyiti dəfn edəndə onun üzünün altına-۳۸ .imam Hüseyn (ə)-ın qəbrinin torpağından qoyun

Alimlərdən biri demişdir: Ayətullah Bürucerdi hər gün iki dəfə Aşura ziyarətini (o-۳۹ həzrətin qatilinə və düşmənlərinə) yüz dəfə lənət və (İmamın özünə) yüz dəfə salam .göndərməklə oxuyurdu

.Hər kəs o həzrətin türbətini gözlərinə sürtsə, gözləri nurlu olar-۴۰

## QOHUMLUQ ƏLAQƏLƏRİ

:Qohumluq iki növdür-۱

;(a) Nəsəbi (soy, nəsil

.b) Səbəbi

Qan qohumluğuna nəsəbi qohumluq deyilir, məsələn ata, ana, bacı, qardaş, əmi, dayı, bibi, xala, baba, nənə və onların övladları nəsəbi qohumlardır. Səbəbi qohumluq isə evlənmək, süd vermək və s. vasitələrlə yaranır, məsələn, ərlə-arvad arasında hər iki .tərəfin qohumluğu

Allah-taala Qurani-kərimdə buyurmuşdur: “Xeyirxah insanlar mal-dövləti çox-۲ sevmələrinə baxmayaraq, qohum-əqrəbaya, yetimlərə, yoxsullara, (pulu qurtarıb (yolda qalan) müsafirlərə, dilənçilərə və qulların azad olunmasına sərf edənlərdir...”(۱

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hal-hazırkı ümmətimə, burada-۳ olanlara və olmayanlara, hələ dünyaya gəlməyən gələcək nəsillərə tövsiyə edirəm ki, bir illik məsafəni ötüb keçsə belə, yenə də qohumluq əlaqələrini kəsməsinlər. Çünki (qohumluq əlaqələri dinin bir hissəsidir.”(۲

İmam Əli (ə) buyurmuşdur: “Din əhlinin əlamətlərindən biri də qohumluq əlaqələrini-۴ (bərqərar etməkdir.”(۳

Allah-taala buyurmuşdur: “...(Adı ilə) bir-birinizdən (cürbəcür şeylər) istədiyiniz-۵ Allahdan, eləcə də qohumluq əlaqələrini kəsməkdən həzər edin. Şübhəsiz ki, Allah sizin (üzərinizdə nəzarətçidir.”(۴

Cəmil ibni Dərrac adlı bir şəxs deyir: İmam Sadiq (ə)-dan “Nisa” surəsinin ۱-ci-۶ ayəsindəki “ərham” (qohumlar) sözünün mənasını soruşdum. Həzrət buyurdu: “Burada “qohumlar” sözü “insanlar” mənasında işlənmişdir. Allah-taala insanlarla əlaqə yaratmağı əmr etmiş və bunu yüksək qiymətləndirmişdir. Məgər Allah-taalanın bu (sözü Öz adı ilə bir sırada yerləşdirdiyini görmürsənmi?!”(۵

səh:۳۹

١- [١٣٩] “Bəqərə” surəsi, ١٧٧-ci ayə.

٢- [١٤٠] “Biharul-ənvar”, ٧١-ci cild, səh. ١٠٥.

٣- [١٤١] “Vəsailuş-şiə”, ١١-ci cild, səh. ١٤٨.

٤- [١٤٢] “Nisa” surəsi, ١-ci ayə.

٥- [١٤٣] “Təfsiri-burhan”, ١-ci cild, səh. ٣٨٨, hədis: ١.

۷- Allah-taala buyurmuşdur: “Allaha ibadət edin və Ona heç bir şeyi şərik qoşmayın! Ata-anaya, qohum-əqrəbaya, yetimlərə, yoxsullara, yaxın və uzaq qonşuya, yaxın dosta, (pulu qurtarıb yolda qalan) müsafirə, sahib olduğunuza (qul və kənizlərə) yaxşılıq edin! Həqiqətən, Allah özünü bəyənənləri, təkəbbür edənləri sevməz!”(۱)

۸- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Bir içim su ilə də olsa, qohumlarını yada sal. Qohum-əqrəbana və yaxınlarına qarşı ən gözəl yaxşılıq odur ki, onlara əziyyət verməyəsən və narahat etməyəsən.”(۲)

۹- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Salam verməklə də olsa, özünüzlə qohumlarınız arasında mehribanlıq yaradın.”(۳)

۱۰- İmam Əli (ə) buyurmuşdur: “Salam verməklə də olsa, qohum-əqrəbalarınızı yad edin.”

۱۱- Allah-taala buyurmuşdur: “Yadınıza salın o zamanı ki, Biz İsrail övladlarından: “Allahdan qeyrisinə ibadət etməyin, valideynlərinizə, yaxın qohumlarınıza, yetimlərə və yoxsullara yaxşılıq edin, insanlarla xoş danışın, namaz qılın və zəkat verin!” – deyə əhd-peyman aldıq.”(۴)

۱۲- Bir nəfər həzrət Peyğəmbər (s)-dən “Allah dərgahında ən pis əməl hansıdır?” – deyə soruşduqda, Həzrət buyurdu: “Allaha şərik qoşmaq.” Dedi: “Bundan sonra hansıdır?” Həzrət buyurdu: “Qohumluq əlaqələrini kəsmək.”(۵)

۱۳- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Üç dəstə behiştə daxil olmayacaqdır: Şərab içənlər, sehrbazlar və qohumluq əlaqələrini kəsənlər.”(۶)

۱۴- Şübhəsiz, qohumluq əlaqələrinin kəsilməsi böyük günahlardan olub axirət əzabına səbəb olur. Allah-taala Qurani-kərimdə qohumluq əlaqələrini kəsənlərə lənət edərək buyurmuşdur: “Əgər (Mühəmməd (s)-dən) üz döndərsəniz, sizdən yer üzündə fitnə-fəsad törətmək və qohumluq əlaqələrini qırmaq gözlənilməzmi?! Onlar Allahın lənət etdiyi, (qulaqlarını) kar və (gözlərini) kor etdiyi kimsələrdir.”(۷)

۱۵- Qurani-kərimin başqa bir ayəsində belə buyurulur: “Allahla əhd bağladıqdan sonra onu pozanlar, Allahın birləşdirilməsini əmr etdiyi şeyləri (qohumluq əlaqələrini)

qıranlar, yer üzündə fitnə-fəsad salanlar isə lənətə düçar olacaqlar. Onları axirətin pis (aqibəti (cəhənnəm) gözləyir!”(۸

Həmçinin başqa bir ayədə buyurulur: “O kəslər ki, Allahla əhd-peyman bağladıqdan-۱۶ sonra onu pozur, Allahın birləşdirilməsini buyurduğu şeyləri parçalayır (möminlərlə dostluğu, qohum-əqrəba ilə əlaqələri kəsir) və yer üzündə fitnə-fəsad törədirlər. Məhz (belələri ziyana uğrayanlardır!”(۹

İmam Səccad (ə) oğlu imam Baqir (ə)-a etdiyi vəsiyyətlərinin birində belə-۱۷ buyurmuşdur: “(Övladım!) Öz qohumları ilə əlaqəsini kəsən və onlarla pis rəftar edən şəxslə dostluq etmə! Çünki onlar Quranın üç yerində lənətlənmişlər.” Sonra “Mühəmməd” surəsinin ۲۲-۲۳-cü, “Rəd” surəsinin ۲۵-ci və “Bəqərə” surəsinin ۲۷-ci (ayələrini oxudu.(۱۰

Həzrət Peyğəmbəri-Əkrəm (s) Mədinəyə daxil olan kimi, camaata belə bir göstəriş-۱۸ verdi: “Ey camaat! Sağ-salamat behiştə daxil olmaq istəyirsinizsə, bir-birinizə ucadan salam verin, qohumluq əlaqələrinizi möhkəmlədin, bir-birinizə əl tutun və hamının (yatdığı bir vaxtda gecə namazı qılın.”(۱۱

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Sədəqə verməyin savabı on, borc-۱۹ verməyin savabı on səkkiz, dostlara hədiyyə verməyin savabı iyirmi və qohumluq (əlaqələrini davam etdirməyin savabı isə iyirmi dörd bərabərdir.”(۱۲

səh:۴۰

---

.İsra” surəsi, ۳۶-cı ayə“ [۱۴۴] -۱

.Biharul-ənvar”, ۷۱-ci cild, səh. ۸۸“ [۱۴۵] -۲

.Əl-məcazatun-nəbəviyyə”, səh. ۸۰“ [۱۴۶] -۳

.Bəqərə” surəsi, ۸۳-cü ayə“ [۱۴۷] -۴

.Üsuli-kafi”, ۲-ci cild, səh. ۶۴۱, hədis: ۷“ [۱۴۸] -۵

.Yenə orada [۱۴۹] -۶

.Mühəmməd” surəsi, ۲۲-۲۳-cü ayələr“ [۱۵۰] -۷

.Rəd” surəsi, ۲۵-ci ayə“ [۱۵۱] -۸

.Bəqərə” surəsi, ۲۷-ci ayə“ [۱۵۲] -۹

.Üsuli-kafi", ۲-ci cild, səh. ۶۴۱"[۱۵۳] -۱۰

.Pərvərişi-ruh", ۲-ci cild, səh. ۲۳۹" [۱۵۴] -۱۱

.Yenə orada [۱۵۵] -۱۲

Həzrət Peyğəmbər (s)-dən “savabı çox olan sədəqə hansıdır?” – deyə-۲۰
(soruşulduqda, o həzrət buyurdu: “Pislik edən qohuma verilən sədəqə.”(۱

Həzrət Peyğəmbər (s)-dən soruşdular: “Ən fəzilətli sədəqə hansıdır?” Həzrət-۲۱
buyurdu: “Yaxın adamlarından ehtiyaclı olan şəxsə verilən sədəqə. (Sonra buyurdu:) Yaxın adamları ehtiyaclı olduğu halda, başqalarına yardım edən şəxsin yardımı (Allah
(dərgahında) qəbul olunmaz.”(۲

Həzrət İsa Məsih (ə) öz dostlarına buyurdu: “Eşitməmisinizmi ki, Tövratda: “Öz-۲۲
qohumlarınızla qohumluq əlaqəsi yaradın, onların əlindən tutun” – deyə buyurulmuşdur? Lakin mən deyirəm ki, sizdən ayrılan şəxslərlə əlaqə yaradın, sizə əl uzatmayan şəxslərə bəxşiş, pislik edən şəxslərə yaxşılıq edin, sizi söyən şəxslərə salam verin, düşmənlərinizlə insafla davranın, başqlarının sizin pisliklərinizi
(bağışlamasını istədiyiniz kimi, sizdə (sizə) zülm edənləri bağışlayın...”(۳

Həzrət Peyğəmbəri-Əkrəm (s) imam Əli (ə)-a buyurdu: “Əxlaq baxımından mənə-۲۳
oxşayan şəxsdən xəbər verimmi?” Əli (ə) “Bəli!” – deyə cavab verdi. Həzrət buyurdu: “Ən gözəl əxlaqa, böyük helmə və səbrə malik olan, qohum-əqrəbasına yaxşılıq edən
(və özündən artıq başqalarına qarşı insaflı olan şəxs.”(۴

Əbuzər deyir: Peyğəmbər (s)-dən eşitdim ki, o həzrət belə buyurdu: “Qiyamət günü-۲۴
Sirat körpüsünü keçən zaman ən çox əhəmiyyət kəsb edən məsələ əmanət və qohumluq əlaqələridir. Belə ki, əmanətə vəfalı olan və qohumluq əlaqələrini davam etdirən şəxs Sirat körpüsündən keçəcəkdir, əks təqdirdə oradan cəhənnəmə
(düşəcəkdir.”(۵

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Allah-taala qohum-əqrəbasına-۲۵
maddi cəhətdən kömək edən, yaxud onlarla qohumluq əlaqəsi yaradan şəxsə yüz şəhidin savabını verər, bu yolda götürdüyü hər bir qədəminə görə qırx min savab qazanar, qırx min günahı bağışlanar və o qədər də mərtəbəsi artar, sanki səbr etdiyi
(halda, Allaha yüz il ibadət etmişdir.”(۶

İmam Sadiq (ə) buyurmuşdur: Bir kişi Peyğəmbər (s)-in hüzuruna gəlib dedi: “Ya-۲۶
Rəsuləllah! Qohumlarım məndən uzaq gəzdikləri üçün, mən də onlarla qohumluq

əlaqələrimi kəsimmi?” Həzrət buyurdu: “Əgər belə bir iş tutsan, onda Allah-taala sizin hamınızı öz başınıza buraxar.” O kişi dedi: “Bəs nə edim?” Buyurdu: “Səndən uzaq gəzən şəxslə qohumluq əlaqəsi yarat, səndən üz çevirən şəxsə bəxşiş et, başqalarının (sənə etdiyi) zülmü bağışla. Əgər bu işi görsən, Allah tərəfindən sənin üçün bir xəzinə ayrılacaqdır.”(٧)

٢٧- Qohumluq əlaqələrini davam etdirməyin müsbət təsirlərindən biri də ömrün uzun olmasıdır. İmam Rza (ə) bu barədə buyurmuşdur: “Ömrünün tamam olmasına üç il qalmış insan qohumluq əlaqələrini möhkəmlətdiyinə görə Allah-taala onun ömrünü otuz il uzadar. Allah istədiyini edər!”(٨)

٢٨- İmam Rza (ə) buyurmuşdur: “Biz ömrün uzun olması üçün qohumluq əlaqələrindən başqa bir vasitə tanımırıq. Qohumluq əlaqələri uzunömürlü olmaqda o qədər təsirlidir ki, ömrün tamam olmasına üç il qalmış şəxsin ömrünü qohumluq əlaqələrini davam etdirdiyi üçün, Allah-taala otuz il artırır. Belə ki, qalan ömrü otuz üç il olur. Ömrünün tamam olmasına otuz üç il qalmış şəxsin ömrünü isə qohumluq əlaqələrini kəsdiyinə görə otuz il azaldıb üç il edər.”(٩)

٢٩- İmam Baqir (ə), yaxud imam Sadiq (ə) Müyəssər adlı bir şəxsə buyurdu: “Deyəsən, qohum-əqrəbana qarşı mehriban və səmimisən, onlara həmişə yaxşılıq edirsən?” Ərz etdi: “Bəli, mən cavanlıqda bazarda bir nəfər üçün işləyirdim. O, mənə iki dirhəm əmək haqqı verirdi. Bu iki dirhəmin birini bibimə, digərini isə xalama verirdim.” Sonra İmam buyurdu: “Allaha and olsun! Əcəlin iki dəfə yaxınlaşmışdı, lakin qohumlarına yaxşılıq etdiyin üçün təxirə salındı.”(١٠)



---

١- [١٥۶] Yenə orada. səh. ٢۴٠.

٢- [١٥٧] “Ləaliul-əxbar”, səh. ٩.

٣- [١٥٨] “Mizanul-hikmə”, ١٠-cu cild, səh. ۵۴٧.

۴- [١٥٩] “Pərvərişi-ruh”, ٢-ci cild, səh. ٢۴١.

٥- [١۶٠] “Üsuli-kafi”, ٢-ci cild, səh. ١٥٢.

۶- [١۶١] “Səfinətul-bihar”, “rəhm” maddəsi.

٧- [١۶٢] “Ləaliul-əxbar”, ٣-cü cild, səh. ١٠.

٨- [١۶٣] “Üsuli-kafi”, ٢-ci cild, səh. ١۵٠, hədis: ٣.

٩- [١۶۴] Yenə orada, səh. ١۶٢, hədis: ١٧.

١٠- [١۶۵] “Biharul-ənvar”, ٧١-ci cild. səh. ١٠٠.

۳۰- Qohumluq əlaqələrini möhkəmlətməyin müsbət təsirlərindən biri də ruzinin artmasıdır. İmam Səccad (ə) bir hədisdə həzrət Peyğəmbəri-Əkrəm (s)-dən belə nəql etmişdir: “Uzunömürlü olmaq və ruzisinin artmasını istəyən varsa, gərək qohumluq əlaqəsini qırmasın.”(۱)

۳۱- İmam Səccad (ə) buyurmuşdur: “Ruzisinin bol olmasını və əcəlinin təxirə salınmasını istəyən şəxs gərək qohumluq əlaqələrini kəsməsin.”(۲)

۳۲- İmam Səccad (ə) buyurmuşdur: “Qohumluq əlaqələrini möhkəmlətmək ömrü uzadır, yoxsulluğu və kədəri aradan aparır.”(۳)

۳۳- Hüzeyfə ibni Mənsur nəql edir ki, imam Sadiq (ə) buyurdu: “Haliqədən çəkinin; çünki o, insanı öldürür.” Soruşdum: “Haliqə nədir?” Buyurdu: “Qohumluq əlaqələrini kəsmək.”(۴)

۳۴- İmam Rza (ə) buyurmuşdur: “Beş xüsusiyyətə malik olan şəxs mal-dövlət yığa (varlı ola) bilməz: Həddindən artıq paxıllıq, uzun-uzadı arzu və çox hərislik etsə, qohum-əqrəba ilə qohumluq əlaqəsini kəssə və dünyanı axirətdən üstün tutsa.”(۵)

۳۵- Qohumluq əlaqələrini davam etdirməyin müsbət təsirlərindən biri də əməllərin pak və xalis olmasıdır. Belə ki, İmam Baqir (ə) buyurmuşdur: “Qohumluq əlaqələrinin davam etdirilməsi əməlləri xalis edir, bəlanı uzaqlaşdırır, mal-dövləti çoxaldır, ömrü uzadır, ruzini bol edir, insanı qohum-əqrəbanın və ailənin yanında sevimli edir. Buna görə də Allahdan qorxub, qohumluq əlaqələrini möhkəmlətmək lazımdır.”(۶)

۳۶- Onun müsbət təsirlərindən biri də qiyamət günü haqq-hesabın asanlaşmasıdır. İmam Sadiq (ə) bu barədə buyurmuşdur: “Qohumluq əlaqələrini möhkəmlətmək qiyamət gününün sorğu-sualını yüngülləşdirir, ömrü uzadır və pis ölümdən qoruyub saxlayır.”(۷)

۳۷- Onun müsbət təsirlərindən biri də şəhərlərin abadlaşmasıdır. İmam Sadiq (ə) buyurmuşdur: “Qohumluq əlaqələrini möhkəmlətmək və qonşularla xoş davranmaq şəhərləri abadlaşdırır, ömürləri uzadır.”(۸)

۳۸- İmam Sadiq (ə) buyurur: “Mən insanın nabud olmasının tezləşməsinə, ölümün

yaxınlaşmasına, evlərin xarab olunmasına səbəb olan qohumluq əlaqələrini kəsmək, ata-anaya aq olmaq və onlara pislik etmək kimi günahlardan Allaha pənah aparıram.”(۹)

۳۹- İmam Sadiq (ə) buyurmuşdur: “Sizi qohumluq əlaqələrinizi kəsməkdən nəhy edirəm; çünki bu iş qəlbi qəsavətli edir (bərkidir). Belə bir şəxs Allah-taalanın lütf və mərhəmətindən uzaqdır.”(۱۰)

۴۰- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Qohumluq əlaqələrini kəsən şəxs behiştə daxil olmaz.”(۱۱)



---

۱- [۱۶۶] “Üsuli-kafi”, ۲-ci cild, səh. səh. ۱۵۶, hədis: ۲۹.

۲- [۱۶۷] “Mişkatul-ənvar”, səh. ۱۶۶.

۳- [۱۶۸] “Biharul-ənvar”, ۷۱-ci cild, səh. ۸۸.

۴- [۱۶۹] “Mişkatul-ənvar”, səh. ۱۶۵.

۵- [۱۷۰] “Biharul-ənvar”, ۷۳-cü cild, səh. ۱۳۸.

۶- [۱۷۱] “Üsuli-kafi”, ۲-ci cild, səh. ۱۵۲, hədis: ۱۳.

۷- [۱۷۲] Yenə orada, səh. ۱۲۲, hədis: ۱۴.

۸- [۱۷۳] Yenə orada, səh. ۱۲۲, hədis: ۱۴.

۹- [۱۷۴] “Üsuli-kafi”, ۲-ci cild, səh. ۱۸۴.

۱۰- [۱۷۵] “Biharul-ənvar”, ۸۲-ci cild, səh. ۳۴.

۱۱- [۱۷۶] Yenə orada, ۷۴-cü cild, səh. ۹۱.

## QIRX İNCƏLİK

۱-Ən vəfasız söz Kufədir.

۲-Qadının ən gözəl ismət paltarı hicabdır.

۳-Aclıq ağılı artırır.

۴-Ən böyük dərd nadanlıqdır, tələskən və səbirsiz adam özü-özünün düşmənidir.

۵-Məğlubiyyətə uğramaq qələbəyə nail olmaq üçün bir körpüdür.

۶-Yaxşı əxlaq insanın qol-qanadıdır.

۷-Yaxşı əməl yerinə yetirmək istəyən şəxs bunu təxirə salmasın, çünki Şeytan onu bu əməldən yayındıra bilər.

۸-Pis yerlərə gedən şəxs ittiham olunar.

۹-Yersiz iş işsizlikdən yaxşıdır və orta səviyyəli iş ən yaxşı işdir.

۱۰-Vicdan insanın daxili qoruqçusudur, qeybət Şeytana pərəstiş etməkdir.

۱۱-Dünya çətinliklərinə dözüb, zirvələrini fəth etmək üçün himmət göstərmək lazımdır.

۱۲-Qəzəbi güzəştlə söndürmək olar.

۱۳-Hadisələr günlər kimi ötüb keçir, ona görə də saleh əməllər yerinə yetirmək üçün tələsmək lazımdır.

۱۴-İnsanlara qarşı kin bəsləmə, çünki səni qəmgin edər.

۱۵-Səbir hər bir çətinliyin açarıdır.

۱۶-Xəstələnməzdən qabaq sağlamlığınızın qədrini bilin.

۱۷-Xeyirxah iş qızıla bənzər, onu əxlaq sandığında qoruyub saxlayın.

۱۸-Pas dəmiri yeyər, həsəd isə qəlbi.

۱۹-Dəlilsiz hadisə olmaz.

۲۰-Hər bir səhv işə görə min dəlil gətirsən, onda min bir səhv olar.

۲۱-Sınıq şeylərin içində yalnız sınıq qəlb çox qiymətlidir, qəlbi yalnız göz yaşları ağardar.

۲۲-İnsan o vaxt təqaüdə çıxar ki, Allah onu dəvət etsin.

۲۳-Şeytanın hücumu səssizdir, nəfəs çəkmək ömürdən gedir.

۲۴-Hər şeyin yanğısı küldür, ömrün yanğısı isə xatirə.

۲۵-Məğlubiyyət yatmış enerjiləri oyadır.

۲۶-Behiştin sənədi, bu dünyada günahlardan çəkinməkdir.

۲۸-Əgər azad olmaq və zülmə qalib gəlmək istəyiriksə, hər bir şeyimizdən keçməyə hazır olmalıyıq!

۲۹-Məzlumun qarğışı zalımın qılıncından itidir.

۳۰-Yaşamaq üçün fikirləşin, lakin qüssələnməyin.

۳۱-Vicdan həmişə həqiqət yaradır.

۳۲-Dünya arzular qəbiristanlığıdır.

۳۳-Göz yaşı bir gövhərdir ki, yalnız gözdən çıxandan sonra qiymətli olur.

۳۴-Həsəd ruhun zindanıdır.

۳۵-Hər yazı bir dəfə oxumağa dəyər.

.Ağır iş ilk baxışda qeyri-mümkün görünür-۳۶

.İşin bəlası ona bağlı olmamaqdır-۳۷

.Tövbə daxili yumaqdır-۳۸

.Azadlıqsevərliyi Kərbəla hərəkatından öyrənmək lazımdır-۳۹

.Qəzəb dəlisovluqla başlayır, peşmançılıqla qurtarır-۴۰

## QURANIN QIRX İFADƏSİ HAQQINDA QISA ANLAYIŞ

:Səbir-۱

Təcrübə göstərmişdir ki, insan səbir edib ağır hadisələrə sinə gərməklə ali mərtəbələrə nail olur. Səbir etməyin aqibəti, hətta bu dünyada belə, yaxşı nəticədən ibarətdir. Məsələn, Yusif peyğəmbərin çətin sınaqlar və töhmətlərin müqabilində səbir etməsi onu son dərəcə izzətə yetirdi, zalım padşahı ona qul və qardaşlarını ona tabe etdi. İmam Hüseyn (ə) buyurmuşdur: “Səbir məqsədə çatmaq üçün ən yaxşı vasitədir.”(۱) Rəvayətlərdən aydın olduğu kimi, səbir üç qismə bölünür: ۱-Bəla və müsibətlər qarşısında səbir etmək. ۲-Allaha itaət zamanı səbir etmək. ۳-Günahlar və haramlar müqabilində səbir etmək. İkincisi birincisindən, üçüncüsü isə hər ikisindən fəzilətlidir. İmam Sadiq (ə) buyurmuşdur: “Qiyamət günü bir dəstə adam gəlib behiştin qapısını döyər. Onlara deyilər: “Siz kimsiniz?” Cavab verərlər: “Biz səbir əhliyik.” Soruşarlar: “Nəyə səbir etmişdiniz?” Deyərlər: “Allaha itaətdə, Onun hökmlərinə baş əyməkdə və günahdan uzaq olmaqda.” Allah-taala buyurar: “Düz deyirlər, onlara yol verin, behiştə daxil olsunlar.” Budur Allahın buyurduğu: “Həqiqətən səbir edənlər öz (mükafatlarını hesabsız alarlar.”(۲



---

.Əşəsiyyat”, səh. ۱۴۹“ [۱۷۷]-۱

.Kafi”, ۲-ci cild, səh. ۷۵“ [۱۷۸]-۲

:İxlas-٢

İxlas – Allahdan qeyrisindən üz çevirməkdir, yəni insan dili ilə Allahın hər bir cəhətdən tək olmasına şəhadət verməli, qəlbi və canı ilə yəqin etməli, əməl, niyyət və ibadətində .yalnız Onun razılığını əsas götürməlidir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Allah-taala sizin çöhrənizə və ".bədəninizə deyil, qəlbinizə və rəftarınıza nəzər edir

Qüşeyri, Zun-nun Misridən belə nəql edir: İxlasın üç əlaməti vardır: ١-"Camaatın onu məzəmmət və tərif etməsinin onun nəzərində bərabər olması. ٢-Yaxşı əməllərini yaddan çıxartmaq. ٣-Axirəti və ölümü yad etmək." Qəzzali yazır: "Həvarilər İsa (ə)-dan "xalis əməllər hansılardır?" – deyə soruşduqda, o həzrət buyurdu: "Allahın ".göstərişlərinə əməl etmək və onlara görə tərifllənməyi sevməmək

Həzrət Peyğəmbəri-Əkrəm (s) də buyurur: Allah-taala buyurmuşdur: "İxlas Mənim ".sirlərimdən biridir və onu, sevdiyim bəndələrimin qəlbində əmanət qoyaram

:(Xovf (qorxu-٣

Qorxu həm dünya, həm də axirət işlərində işlənir. Allahdan qorxmağın mənası haram işlərdən çəkinməkdir. Allahın hər bir şeyi görüb, eşitdiyini, görülən hər bir yaxşı və pis işdən xəbərdar olduğunu bilən şəxs yalnız Ona xatir, ixlasla ibadət edib, Onun razılığını əldə etmək fikrində olsa, xovf məqamına nail olmuşdur. İmam Hüseyn (ə) buyurmuşdur: "Allahdan qorxu hər bir hikmətin açarıdır." Əllamə Təbatəbayi deyir: "Allahın müqabilində özünü zəlil bir bəndə hesab edən halda durmaq qorxudan Allaha ibadət etmək deməkdir. Xovf iman və təqvanın həqiqətini əhatə edən bir addır. Heç bir ".əməl xovf qədər ehtiras və şəhvət hislərinin cilovlanmasına səbəb ola bilməz

Allahdan qorxmaq insanın mənəvi kamallarını artırır. Bu, bütün saleh əməllərin mənbəyi sayılır. İmam Sadiq (ə) İshaqa buyurdu: "Allahdan elə qorx ki, sanki Onu görürsən; sən Onu görməsən də, O, səni görür. Əgər Onun səni görməməsini təsəvvür etsən, kafir olarsan. Əgər Onun səni gördüyünü bilə-bilə günah etsən, Onu ".sənə nəzər edənlərin ən pisi qərar vermiş olarsan

:Tövbə-۴

Tövbə günahlardan çəkinib Allah dərgahına qayıdış deməkdir. Hədislərdə tövsiyə olunmuşdur ki, insan öz günahlarını başqalarına deməməli və onları yalnız Allah .dərgahında etiraf etməklə Ondan bağışlanmaq diləməlidir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ya Əli, xoş o kəsin halına ki, Allah-taala ona nəzər sala və o da Allahdan başqa heç kəsin xəbərdar olmadığı günahları üçün (ağlaya.”(۱

İmam Baqir (ə) buyurmuşdur: “Günahlarından tövbə edən şəxs (ümumiyyətlə) günahı (olmayan şəxs kimidir.”(۲

İmam Sadiq (ə) buyurmuşdur: “Xalis tövbə odur ki, insanın batini zahiri kimi, hətta ”.ondan daha da yaxşı olsun

:Riya-۵

İxlasla deyil, Allahdan qeyrisinə göstərmək məqsədi ilə yerinə yetirilən əmələ “riya” deyilir. Qəzzali deyir: “İbadət etməklə özünə tərəfdar (mürid) yığan şəxs riyakar .adlanır. Riyanın ən aşağı mərtəbəsi Allaha şərik qoşmaqdır

İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs camaata xatir işləsə, onun savabını camaat ”.verir. Lakin hər kəs Allaha xatir iş görsə, onun savabını Allah verir

İmam Əli (ə) buyurmuşdur: “Riyanın üç əlaməti vardır: Camaat onu görəndə sevinsin, ”.tək olanda (ibadətə qarşı) süst olsun və camaatın onu tərifləməsini istəsin

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Bir zaman gələr ki, camaatın daxili xəbis, zahiri isə dünyaya tamah etdiklərinə görə gözəl olar və Rəbblərinin yanında ”.olanları istəməzlər

:Təqva-۶

Nəfsi qadağan olunmuş şeylərdən, günah və çirkin işlərdən qoruyub saxlamağa “təqva” deyilir. Hər kəs həqiqi təqvaya malik olmaq istəyirsə, bütün günahlardan

.çəkinməli və vacib olan əməlləri yerinə yetirməlidir



---

.Biharul-ənvar”, ۷۷-ci cild, səh. ۶۳“ [۱۷۹] -۱

.Vəsailuş-şiə”, ۱۶-cı cild, səh. ۷۴“ [۱۸۰] -۲

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "İnsanların cənnətə getməsinə səbəb olan şeylərin ən mühümü Allah qarşısında təqva və gözəl əxlaqa malik olmaqdır."(١)

İmam Sadiq (ə)-dan təqvanın təfsiri barəsində soruşduqda, Həzrət buyurdu: "Təqva budur ki, Allah-taala səni, əmr etdiyi işlərdə və yerlərdə qaib, qadağan etdiyi yerlərdə isə hazır görməsin."(٢)

٧-Arzu:

İnsan ümid və arzu ilə yaşayır, bunlarsız yaşamaq mənasızdır. Dünya və axirət üçün mənfəəti və xeyri olan şeylərə "arzu" deyilir. Arzu insana sevinc gətirir. Təkamül və irəliləyişlə birgə olan arzu "düzgün arzu" hesab olunur. Qurani-kərim insana ömrünü boş yerlərə sərf etməməsini, ümid və arzu ilə yaşamasını göstəriş vermişdir. Düzgün olmayan arzu insanın özündən sonra yadigar olaraq xeyirxah bir iş qoymaq əvəzinə, fani dünyanın maddi ləzzətlərinə çatmasına himmət göstərməsidir. İmam Əli (ə) buyurmuşdur: "Bilin ki, arzu insanın əqlinin qəflətdə qalmasına və Allahı yaddan çıxarmasına səbəb olur." Həmçinin buyurmuşdur: "Hər kəs qəlbini dünya məhəbbətinə bağlasa, üç şeyə mübtəla olar: ١-Tükənməz qəm-qüssəyə. ٢-Ondan ayrılmayan tamaha. ٣-Nail ola bilməyəcəyi arzuya."

٨-Təvəkkül:

Acizliyi bildirmək və başqasına arxalanmaq "təvəkkül" adlanır. Allaha təvəkkül edən şəxs Allahdan qeyrisindən üz çevirir, insanlara göz dikmir və onlara ümid bəsləmir; yalnız Allahdan kömək diləyir, Onun qüdrəti haqqında fikirləşir, heç kəs onun haqq söz deməsinin qarşısını ala bilmir və özü də haqq danışmaqdan boyun qaçırmır. Allaha təvəkkül etmək qəlbi sakitləşdirir və qəm-qüssəni aradan aparır. Merac gecəsi Cəbrail Həzrət Peyğəmbər (s)-dən "Allaha təvəkkül etmək nə deməkdir?" – deyə soruşduqda, o həzrət buyurdu: "Təvəkkül yaranmışların (müstəqil şəkildə) heç bir xeyir və zərər yetirə bilməməsini başa düşməkdir."

٩-Aclıq:

Qurani-kərim ac qalmağı bir növ imtahan kimi qələmə vermişdir. Aclığa dözən şəxs

həqiqi mömindir. Ac qalmaq insanın əxlaqının düzəlməsinə, təfəkkür qüvvəsinin inkişaf etməsinə və az yemək həyat boyu orqanizmin rahatlığına səbəb olur. Çox yemək insanın düşüncəsini və fikrini artırmır. Rəvayətdə bəyan olunduğu kimi, aclıq hikmət .bulududur və ac qalan şəxsə hikmət yağışı yağar

Əbuzər demişdir: “Allaha and olsun, hər cümə günü mənim yeməyim bir sa arpadan ”.çox olmur

Əbu Süleyman demişdir: “Dünyanın açarı tox olmaq, axirətin açarı isə ac qalmaqdır. Ac ”.qalmaq insanın hikmətli olmasına səbəb olur və ariflərin xüsusiyyətlərdən biridir

:Bəla-١٠

Hər bir bəla həqiqəti dərk etmək üçün bir təcrübədir. İnsanlar onun vasitəsilə imtahana çəkilir, kimlərin şükr edən və kimlərin nankor və səbirsiz olduğu ayırd edilir. .Hər kəs onun Allah tərəfindən olduğunu qəbul etməsə, taqətsizlik göstərib küfr edər

Böyük filosof və arif Günabadi deyir: “Allah tərəfindən olan bəla həqiqətin batildən seçilmə vasitəsidir. İlahi imtahan, əgər insanın sevincinə səbəb olsa, şükr; yox əgər zərərə düşməsi ilə nəticələnsə, səbir etməlidir. Deməli, həm nemət, həm də möhnət bir bəladır, nemətin müqabilində şükür, möhnətin müqabilində isə səbir etmək .lazımdır

:Bəzən imtahandan məqsəd bir neçə məsələ ola bilər

a) Sədaqəti bildirmək: Buna həzrət İbrahim (ə)-ı misal göstərmək olar. Belə ki, ondan var-dövlət alındıqda və oğlu İsmailin başını kəsməyə əmr olunduqda, səbir edib Allah .qarşısında özünün sədaqətini və həqiqi imanını aşkar etdi

b) Cəza imtahanı: Bu imtahanın səbəbi imanın zəifliyi, onun nəticəsi də bədbəxtliyə düşməkdir. Buna İblisi misal göstərmək olar. Belə ki, o, Allah əmrinə qarşı çıxdığından, .Haqq dərgahından qovuldu

v) Yüksək məqamlara çatmaq üçün imtahan vermək: Bu imtahanın vasitəsilə insan yüksək və uca məqama nail olur. Buna həzrət İbrahim (ə), həzrət Əyyub (ə)-ı, digər

peyğəmbərləri və övliyaları misal göstərmək olar. Belə ki, Nəmrud həzrət İbrahim (ə)-ı oda atdı və o da buna səbir edib imamət məqamına nail oldu. Həmçinin Əyyub (ə) müxtəlif xəstəliklər və bəlalara düçar olduqda, səbir edib, Allah yanında uca məqama .malik oldu



---

.Biharul-ənvar”, ۷۱-ci cild, səh. ۳۷۳“ [۱۸۱] -۱
.Səfinətul-bihar”, ۲-ci cild, səh. ۲۷۸“ [۱۸۲] -۲

q) Həqiqətin aşkar edilməsi məqsədilə imtahan etmək: Buna həzrət Peyğəmbər (s)-lə .pıçıltı ilə söhbət edən şəxsin sədəqə verməsini misal göstərmək olar

:Bərzəx-۱۱

Bərzəx lüğətdə iki şeyin arasında pərdə asmaq və fasilə salmaq deməkdir. Dini termində isə bərzəx Allah-taalanın dünya həyatı ilə axirət arasında yaratdığı bir aləmə .deyilir. İnsanlar öldükdən sonra müəyyən müddətə qədər orada qalacaqlar

Qurani-kərimdə buyurulur: “Onların (dünya həyatı ilə axirət) arasında “Bərzəx” (aləmi) ”.vardır ki, (bu bərzəx aləmi) qiyamət gününədək davam edəcəkdir

İmam Sadiq (ə)-dan bərzəxin vaxtı barədə sual olunduqda, Həzrət buyurdu: “Ölüm saatından başlanır və qəbirdən qaldırılanadək (davam edir).” Həkim Günabadi deyir: “Bərzəx bu dünya ilə axirət arasındakı aləmdir. Dünya imtahan, axirət isə rahatlıq ”.yeridir

:Təsbih-۱۲

Təsbih, Allah-taalanın zatının kamallarına layiq olmayan hər bir sifəti Ondan uzaq bilməkdir. “Sübhanəllah” dedikdə, Allah-taalanın əqlən təsəvvür olunan hər bir şeydən üstün olduğu nəzərdə tutulur. O, hər bir xeyir və kamalın mənbəyidir. Yaranmışlar içərisində Allaha təsbih demək təkcə insanın vəzifəsi deyil; yer, göy və onların içərisində olan hər bir varlıq (öz varlığı səviyyəsində) Allah-taalaya səcdə, təsbih və .pərəstiş edir və Onun müqabilində baş əyirlər

:Təfəkkür-۱۳

Təfəkkür qəflətin ziddi və qəlbin saflaşmasında ən mühüm səbəblərdən biridir. Kin-küdurətin aradan getməsində, qürur evini (dünyanı) sadə bilib, əbədi səadət evinə (axirətə) üz tutmaqda təfəkkürün böyük rolu vardır. O, ibadətlərin başı, itaətlərin canı və ruhudur. Allah-taala insanı əql və düşüncə nemətilə heyvandan üstün etmişdir. Rəvayətlərdə bəyan olunduğu kimi, insan Allah-taalanın zatı haqqında deyil, nemətləri barəsində fikirləşməlidir. Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Bir saat təfəkkür etmək yetmiş il ibadət etməkdən üstündür.” Çünki ibadət nəfsi onun

xoşlamadığı şeylərə adət etdirməkdir və onun xeyri təkcə ibadət edənə çatır. Təfəkkür isə nəfsi yaxşı şeylərə adət etdirməklə yanaşı, əqlin genişlənməsi, idrak qüvvəsinin inkişaf etməsidir və onun xeyri bütün insanlara çatır. İmam Əli (ə) ".buyurmuşdur: "Təfəkkür edən şəxsin bəsirəti (qəlb gözü) açılar

:Qəza və qədər-۱۴

İlahi qəza və qədər İslam dininin qəti əqidələrindən sayılır. "Qədər" lüğətdə "bir şeyin ölçülməsi və miqdarı", "qəza" isə "onların həyata gercəkləşməsinin labud və qəti olması mənasını ifadə edir. İmam Rza (ə) qəza və qədərin təfsirində belə buyurmuşdur: "Qədər diri qalmaq və fani olmaq baxımından bir şeyin ölçülməsində, (qəza isə həmin şeyin qəti olaraq həyata keçməsindən ibarətdir."(۱

Qurani-kərimdə "qədər" barəsində buyurulur: "Şübhəsiz ki, Biz hər şeyi müəyyən ölçüdə (lazım olduğu qədər) yaratdıq."(۲) "Qəza" haqqında isə belə buyurulur: "Sizi (palçıqdan yaradan, sonra da (sizin üçün) bir əcəl təyin edən Odur!"(۳

Qəza və qədər məsələsi olduqca mürəkkəb olduğu üçün idrak və fikir cəhətindən onu başa düşməyə hazırlığı olmayanlar bu məsələyə girişməsinlər. Əks halda, bu iş onların əqidəsində səhvə, şəkk-şübhəyə yol verər və düz yoldan azmalarına gətirib çıxarar. Elə buna görə də imam Əli (ə) belə şəxslərə xitab edərək buyurmuşdur: "(Qəza və qədər) qaranlıq bir yoldur, onu keçməyin, dərin bir dənizdir, ora girməyin; Allahın (sirridir, onu əldə etmək üçün özünüzü zəhmətə salmayın."(۴

:(Həbt (pis əməllər vasitəsilə yaxşı əməllərin puç olması-۱۵

Həbt" – lüğətdə heyvanların xəstəliyə və köpməsinə səbəb olan bir növ zərərli və" .öldürücü otdan ibarətdir

Rağib İsfahani özünün "Müfrədat" kitabında "həbt"i bir neçə qismə bölmüşdür: ۱-Qiyamətdə heç bir faydası olmayan dünyəvi əməl. ۲-Allahın razılığı əsasında yerinə yetirilməyib, axirətə aid olan əməl. ۳-Pis əməllərin müqabilində (və onunla bərabər) .olan yaxşı əməllər

١- [١٨٣] “Kafi”, ١-ci cild, səh. ١٥٨.

٢- [١٨٤] “Qəmər” surəsi, ۴٩-cu ayə.

٣- [١٨٥] “Bəqərə” surəsi, ١١٧-ci ayə.

۴- [١٨۶] “Nəhcül-bəlağə”, “qısa sözlər” bölümü, ٢٧٧.

Hər kəs kafir olub, kafir halında da ölsə, əməlləri axirətdə puça çıxar. Rəvayətdə deyilir ki, hər kəs gözəl bir adət qoysa, qiyamətə qədər ona əməl edənlərin savabı qədər həmin şəxsə savab verilər. Lakin hər kəs pis bir adət qoysa, qiyamət gününə qədər, ona əməl edən şəxsin günahı həm ona əməl edən şəxslərə yazılar, həm də onun .boynuna yüklənər

:Rəhmət-۱۶

Yəhya ibni Səlam rəhmətin on bir mənasına işarə etmişdir: ۱-İslam dini. ۲-Ruzi. ۳-Kömək və qələbə. ۴-Sağlamlıq. ۵-Behişt. ۶-Yağış. ۷-Nübüvvət. ۸-Nemət. ۹-Quran. ۱۰-.Var-dövlət. ۱۱-İman

Salman Farsi həzrət Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu nəql edir: “Allah-taala yer və göylərlə birlikdə yüz rəhmət yaratdı və onun təkcə birini yer üzünə göndərdi ki, insanlar onun vasitəsilə bir-birlərinə rəhm edirlər.” (Ananın öz övladına məhəbbət göstərməsini, quşların su içməsini və insanların yaşamasını buna misal göstərmək olar. Allah-taala qalan doxsan doqquz rəhmətini isə qiyamətdə təqvalılara (.əta edəcəkdir

:(İkrah (məcburiyyət-۱۷

İslam nöqteyi-nəzərindən fərdi azadlığın nümunələrindən biri də dinin qəbul :edilməsində məcburiyyətin olmamasıdır. Qurani-kərimdə buyurulur

Dində heç bir məcburiyyət yoxdur. Artıq doğruluq (iman) azğınlıqdan (küfrdən) aydın“ (şəkildə seçilmişdir.”(۱

Çünki İslam bəyənilmiş din, iman və qəlbə aid olan bir inancdır və heç vaxt zorla qəbul etdirilib qəlblərdə yer tuta bilməz. Əksinə bir sıra mühüm müqəddimələrin hasil olması ilə eyni zamanda haqq batildən seçilib ayrılır. Bu aydınlıq hasil olarkən, insan təbii .olaraq haqqı qəbul edir

İnsan işlərində azad və ixtiyar sahibi olması inkar edilməz bir həqiqətdir. İslamın əziz peyğəmbəri həzrət Mühəmməd (s) vəfat etdikdən sonra müsəlmanların arasında ciddi şəkildə mübahisə obyektinə çevrilmiş məsələlərdən biri də insandan baş verən işlərin

keyfiyyəti idi. Bəzilərinin əqidəsinə əsasən, insan işlərində tam məcburiyyətə malikdir. Başqa bir qrupun nəzəriyyəsinə görə Allah-taala bütün işləri insanların ixtiyarında qoymuş, Öz qüdrət və hakimiyyətini (qəzavətini), eləcə də təqdirini onlardan götürmüşdür. Birinci qrupun fikrincə, insanın bütün işlərinin səbəbkarı məhz Allahdır. İkinci dəstənin fikrincə isə, insanın işlərinin səbəbkarı tam mənada onun özüdür. Bu iki azğın və yanlış fikrin müqabilində Peyğəmbər Əhli-beytinin bəyan etdiyi həqiqət və doğru əqidə bundan ibarətdir ki, insanın işləri nə tam cəbr (icbar), nə də tam təfviz əsasında deyil; həqiqət bu iki fikrin arasında orta mövqedə olan bir nöqtədir. Yəni insan bu dünyada öz işlərində tam məcbur olmadığı kimi, tam mənada öz başına da .buraxılmamışdır

İmam Sadiq (ə) bu iki etiqad arasındakı orta və mətədil olan haqq yolu məşhur bir cümlədə belə bəyan emtişdir: "İslamda nə tam cəbr vardır, nə də tam təfviz; əksinə (haqq yol) bu ikisinin arasında olan bir yoldur (orta mövqedir)."(٢)

:(Röya (yuxu-١٨

Röya insan üçün yaxın və ya uzaq gələcəkdə xeyirli, ya da qorxulu bir hadisənin baş verəcəyini bildirir. Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Düz danışan şəxslərin yuxusu doğrudur." Həmçinin buyurmuşdur: "Bizi yuxuda görən şəxs, sanki aşkara görmüşdür, çünki Şeytan mənim surətimə düşə bilməz." Peyğəmbərlərin yuxu .görməsi Allah tərəfindən olan bir növ ilhamdır

İmam Sadiq (ə) öz səhabələrindən birinə buyurdu: "Doğru və yalan yuxular haqqında fikirləş, gör onlar bir-birlərinə necə də qarışmışdır. Bütün yuxular doğru olsaydı, hamı peyğəmbər olardı; əgər hamısı yalan olsaydı, onda yuxunun heç bir faydası olmaz, ".artıq bir iş sayılardı

:Dua-١٩

Dua oxumaq, Allahla raz-niyaz və münacat etmək şiələrə məxsus olan xüsusiyyətlərdən biridir ki, onun vasitəsilə başqalarından seçilmiş, onun qayda və .fəziləti ilə ünsiyyət tapmışlar

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ehtiyaclarınızı (yalnız) Allahdan istəyin, (ağır və xoşagəlməz) hadisələrdə dua edib, Ona pənah aparın; çünki dua ibadətin ”.məğzidir

səh:۴۸

---

.Bəqərə” surəsi, ۲۵۶-cı ayə“ [۱۸۷] -۱

Ayətullah Cəfər Sübhaninin “Mənşuri əqaidi-imamiyyə” kitabından iqtibas [ ۱۸۸] -۲ .edilmişdir

Ən xalis ibadət dua və Allahla raz-niyaz etməkdir. Çünki insan dua edərkən camaatın ixtiyarında olanlardan üz çevirib, yalnız Allaha ümid bağlayır. Hədislərdə buyurulur ki, ən fəzilətli ibadət duadır.(١) Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Yardıma ehtiyacın olsa, onu Allahdan istə; çünki O, (hər bir) xeyrin mənbəyidir və insanın da həmişə bu xeyrə ehtiyacı vardır."

٢٠-Gözəl əxlaq:

Gözəl əxlaqa sahib olmağın hər iki dünyada böyük faydaları vardır. Bir nəfər imam Sadiq (ə)-dan gözəl əxlaqın nəyə deyildiyini soruşduqda, Həzrət ona buyurdu: "Yumşaq və mülayim davran, danışığını gözəlləşdir və din qardaşlarınla gülərüz, mehriban rəftar et."(٢) O həzrət başqa bir hədisdə belə buyurmuşdur: "Üç əməl vardır ki, hər kəs onlardan birinə malik olsa, Allah behişti ona vacib edər: ١-Yoxsul olduğu halda (Allah yolunda) ehsan və yaxşılıq etmək. ٢-Hamı ilə gülərüz olmaq və gözəl rəftar etmək. ٣-İnsaflı olmaq (yəni zərərinə də olsa belə, haqqı demək)."(٣)

٢١-Şəfaət:

Qiyamət günündə Allahın iznilə şəfaət etmək İslam dinin əqidələrindən biri sayılır və bu haqda heç bir şəkk-şübhə yoxdur. Qiyamət günündə peyğəmbərlər, məsum imamlar və İlahi övliyalar Allahın iznilə bəzi günahkar insanlara şəfaət edəcək və onları bağışladacaqlar. Qurani-kərim və saleh əməllər də, insana şəfaət edəcəkdir. Şəfaət o kəslərə ediləcəkdir ki, onlar heç vaxt Allah-taala ilə olan əlaqələrini tam şəkildə qırmamışlar və şəfaət olunmağa da ləyaqətli olsun. Allah-taala "Ənbiya" surəsinin ٢٨-ci ayəsində buyurur: "Onlar Allahın razı olmadığı şəxslərdən başqasına şəfaət etməzlər."

٢٢-Şükür:

Şükür – neməti xatırlayıb izhar etmək, Allaha yaxınlaşmaq və itaət yolunda səy göstərməkdir. Onun antonimi küfrdür, yəni nemətin Allah tərəfindən olmasını yaddan çıxarmaq.

٢٣-Sehr:

Sehr lüğətdə kökü zərif, səbəbi isə gizli olan şey mənasını ifadə edir. Dini termində isə səbəbi gizli olan və heç bir həqiqəti olmadığı halda, həqiqət olması təsəvvür edilən şeylərə deyilir. Buna həzrət Musa (ə)-la mübarizədə məğlubiyyətə uğrayan sehrbazların əməllərini misal göstərmək olar. Belə ki, camaat onların özləri ilə .gətirdikləri sadə iplərin əjdaha olmasını təsəvvür edirdilər

Sehrin bir neçə mənası vardır: ١-Həqiqəti olmayan xəyallar; misal üçün, gözbağlamaq, .cəld hərəkət, əli iti olmaq. ٢-Şeytana yaxınlaşmaqla, onu özünə cəlb etmək və s

:Əbəs (hədəfsiz və hikmətsiz) iş-٢۴

Faydasız bir işi yerinə yetirməyə "əbəs" deyilir. Rağib İsfahani özünün "Müfrədat" kitabında yazır: "Düzgün hədəfi olmayan işə "əbəs" deyilir. Allah-taala varlıq aləmini hədəfsiz və boş yerə yaratmamışdır. Onun insanı yaratmaqda əsas hədəfi ibadət və ".bəndəçilik nəticəsində hasil olan insani kamallara çatdırmaqdan ibarətdir

Bir şəxs imam Sadiq (ə)-dan "Allah nə üçün varlıq aləmini yaratmışdır?" – deyə soruşduqda, o həzrət buyurdu: "Allah-taala məxluqları hədəfsiz, boş yerə yaratmamışdır; onları Öz qüdrətini göstərmək üçün yaratmış və onlara Allahın ".razılığını qazanmaq üçün itaət etməyi vacib etmişdir

İmam Hüseyn (ə) öz səhabələrinə buyurdu: "Uca Allah insanları yaratdı ki, Onu ".tanısınlar

Qurani-kərimin "Zariyat" surəsinin ۵۶-cı ayəsində buyurulur: "Mən cini və insanı, Mənə ".ibadət etmələrindən (Məni tanımalarından) başqa bir məqsədlə yaratmadım

Bütün aləm və Allahın işləri mütləq şəkildə haqq olduğundan, hikmət sahibinə layiq olan surətdə yaranmış və heç də nahaq və əbəs yerə yaranmamışdır. Bu, Qurani-kərimin müxtəlif ayələrində qeyd olunmuşdur. Misal üçün, "Əhqaf" surəsinin ٣-cü ayəsində buyurulur: "Biz göyləri, yeri və onların arasında olanları yalnız haqq olaraq yaratdıq." İnsan və dünyanın sonu da qiyamətin bərqərar olunması ilə həqiqətə .çevriləcəkdir

:Ədalət-٢۵

---

۱- [۱۸۹] “۱ :Kafi”, ۲-ci cild, səh. ۳۳۹, hədis.
۲- [۱۹۰] “۴ :Üsuli-kafi”, ۲-ci cild, səh. ۱۰۳, hədis.
۳- [۱۹۱] “۱۰۳ .Kafi”, ۲-ci cild, səh.

İmam Əli (ə) buyurmuşdur: “Ədalət – hər bir işi öz yerində qərar verməkdir.” Ədalət insana, onun öz haqqı qədər əvəz vermək, zülm isə bu haqqı verməkdən imtina etməkdir. Allah-taala son dərəcə adil, kəramətli, bəxşiş və yaxşılıq edən, rəhimli olub əməllərə əvəz verməyi vəd etmişdir. Hətta yaxşı və bəyənilən arzuları fikirdən keçirmək üçün də yaxşı mükafata zəmanət vermiş və vəd etmişdir ki, yaxşı işlər üçün əlavə əvəz də verəcəkdir. Necə ki, “Ənam” surəsinin ۱۶۰-cı ayəsində buyurulur: “Kim ”.yaxşı bir iş görərsə, ona həmin işin on qat əvəzi (savabı) verilər

:Əql-۲۶

Həqiqətən, Allah-taala bizə təfəkkür, idrak və əql qüvvəsi bəxş etdiyinə görə, bizə əmr etmişdir ki, Onun xəlq etdiyi varlıqlar barəsində fikirləşək, şüurumuzu işə salıb, Allahın .hikmətində, kainatdakı nişanələrində və insanın daxili aləmində dərindən düşünək

İmam Sadiq (ə)-dan “əql nədir?” – deyə soruşulduqda, o həzrət buyurdu: “Əql odur ki, ”.Allah-taala onun vasitəsilə (insandan) sual soruşur və behişt onun vasitəsilə qazanılır

Ağıllı insan həyatın çətinliklərinə, ağrı-acılarına dözür, əqli ilə dünyanın puç və müvəqqəti, axirətin isə əbədi və həmişəlik olmasına yəqin edir. Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Allah əqldən də əziz olacaq bir varlıq yaratmamışdır.” Həmçinin buyurmuşdur: “Allahın yaratdığı ilk şey əql idi.” Başqa bir hədisdə ”.buyurmuşdur: “İnsanın dayaq nöqtəsi əqlidir və əqli olmayan şəxsin də dini yoxdur

”.İmam Rza (ə) buyurmuşdur: “Əql Allahın (insanlara) hədiyyəsidir

İmam Sadiq (ə) buyurmuşdur: “Allah-taala insandan (nankorluq etdiyinə görə) bir ”.neməti almaq istədikdə, birinci onun əqlini əlindən alır

:Qürur-۲۷

Qürur insanın dünyaya aldanması deməkdir. İnsanı süst edib, yaxşı əməlinin qarşısını alan hər bir şeyə “qürur” deyilir. Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Axirəz-”.zamanda yaşayan insanların qəlbinə qürur hakim kəsiləcəkdir

:Qəzəb-۲۸

Qəzəb insanın nəfsində qaralıq və çirkinlik yaradıb, onu tamamilə dəyişir, rahatlığını iztiraba, sevincini kədərə çevirir, yuxusunun, istirahətinin qarşısını alır, orqanizmə də öz mənfi təsirini göstərir. Əgər qəzəb insana qalib gəlsə, sirlərinin üstünü açar. İmam Sadiq (ə) buyurmuşdur: "Allah öz qəzəbini udan şəxsin eyblərini örtər və gizlədər."(١)

O həzrət başqa bir hədisdə belə buyurmuşdur: "Qəzəb hikmət sahiblərinin hikmətini məhv edər (elə buna görə də onda hikmət əvəzinə səfehlik müşahidə olunar). Hər kim qəzəbinə sahib olmasa (qəzəbini cilovlaya bilməsə), ağlına da sahib ola bilməz."(٢)

:Qəflət-٢٩

Bundan da böyük qəflət ola bilərmi ki, insan əql, düşüncə, istedad və idrak qüvvəsinə malik olduğu halda, onu məqsədsiz, dəyərsiz və boş yerlərdə puça çıxarsın? İnsan Allah tərəfindən ona verilən qüdrəti o zaman puça çıxarar ki, onun dəyər və əhəmiyyətindən agah olmasın. Buna əsasən, qəflət həmin nadanlıq, həyatda batil, mənasız və faydasız işlərlə məşğul olmaqdır. Qəflət insanın diqqətsizlik və ağılsızlıq ucbatından düçar olduğu səhvidir. Alimlərdən biri demişdir: "Qəlbin qəfləti çoxaldıqda, mələyin insana etdiyi ilhamlar da azalar." Baba Tahir demişdir: "Qəflət məhrum olmaq ".deməkdir

:Qəlb-٣٠

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "İnsanın qəlbinin ətrafında gəzib- ".dolaşan şeytanlar olmasaydı, insanlar mələkut aləminə ucalardılar

İmam Sadiq (ə) buyurmuşdur: "Qəlb Allahın hərəmidir; belə isə, Allahın hərəmində Ondan başqasına yer vermə (qəlbin məxfi guşələri Allaha məxsusdur, dünya məhəbbətini ondan xaric et)."(٣)



---

١- [١٩٢] "Kafi", ٢-ci cild, səh. ٣٠٣.

٢- [١٩٣] Yenə orada.

٣- [١٩٤] "Biharul-ənvar", ٧٠-ci cild, səh. ٢٥.

:Kahin-۳۱

Sirli qüdrətə malik olan, qeybdən bəzi xəbərlər verən və xariqul-adə şəkildə ruhlarla əlaqədə olan şəxsə kahin deyilir və o, xəbəri cinlərdən alır. Bu, tağut kəlməsi ilə də eyni .mənanı daşıyır

Bir kişi həzrət Peyğəmbər (s)-dən kahinlər haqqında soruşduqda, Həzrət buyurdu: "Çox da mühüm bir iş deyildir." Dedi: "Ya Peyğəmbər! Axı onların dedikləri bəzi məsələlər doğru idi!" Peyğəmbər (s) buyurdu: "O, cinlərin vasitəsilə Allah tərəfindən alınıb, öz dostlarının qulaqlarına deyilən sözlərdir və onu yüz yalanla qarışdırıb ".deyirlər

:Cihad-۳۲

Cihad Allah yolunda döyüşmək, nəfsi istəklərə və arzulara qələbə çalmaqdır. Nəfs güclü və qalib olduqda, insana hakim olur. Həzrət Peyğəmbəri-Əkrəm (s) düşmənlə cihad etdikdən sonra, nəfslə mübarizəyə işarə edib, onu ən böyük cihad və mübarizə adlandırdı. İnsan düşmənlə bir neçə dəfədən artıq müharibə aparmır və o, bu müharibədə həm qələbə çala, həm də məğlubiyyətə uğraya bilər. Lakin nəfslə mübarizə əbədidir və insanın ömrünün sonuna qədər davam edir. Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Sənin ən böyük düşmənin nəfsindir və ona yalnız mübarizə ".aparmaqla qələbə çalmaq olar

:Məcnun-۳۳

Peyğəmbərlərdən heç biri çətinliklərdən, müsibətlərdən, ağır hadisələrdən və əzab-əziyyətlərdən uzaq olmamışlar. Onların ən kiçik müsibətlərindən və əzab-əziyyətlərindən biri ağılsızlıq və dəliliklə (məcnunluqla) ittiham olunmalarıdır. Lakin həqiqət əhli arasında günah işlərlə məşğul olanlara, təkçə dünyaya arxalanıb, mal-.dövlət haqqında fikirləşənlərə "məcnun" deyilir

:Vəhy-۳۴

Peyğəmbərlərin qeyb aləmi ilə əlaqə yaratması vəhy yolu ilə həyata keçir. Bu əlaqə, başqa sözlə vəhy, əql, idrak və hissiyyatla həyata keçməz. Vəhy Allahın Öz

göstərişlərini xalqa çatdırmaq üçün peyğəmbərlərin ixtiyarına qoyduğu xüsusi bir :vasitədir. Allah-taalanın Öz bəndələri ilə əlaqə yaratması yalnız üç yolla mümkündür

;a)-Qəlbə ilham etməklə

b)-Hicab (pərdə) arxasından danışmaqla; belə ki, insan (peyğəmbər) Allahın danışığını .eşidir, lakin onu görmür. Allahın Musa (ə)-la danışmasını buna misal göstərmək olar

.v)-Bir elçi (mələk) göndərər ki, o da Allahın izni ilə vəhy edər

Qurani-kərimdə bu barədə belə buyurulur: "Hər bir bəşər övladına Allahla danışmaq müyəssər omaz. Allah onlarla ancaq vəhylə, yaxud pərdə arxasından danışar və ya bir elçi (mələk) göndərər. O da Allahın izni ilə Allahın istədiyini vəhy edər. Həqiqətən, O, ((hər şeydən) ucadır və hikmət sahibidir."(١

:(Məkr (hiylə-٣٥

Allah tərəfindən olan məkr və hiylənin mənası insanları aldatmaq deyil, cəza, əzab və .möhlət verməkdir. Müharibədə düşmənə qarşı hiylə işlətmək halaldır

:Əhd-peyman-٣٦

Əhd-peymanın Qurani-kərimdə işlənən ən mühüm mənası əmanəti qəbul etməkdir ki, .insandan başqa hər bir məxluq onu qəbul etməkdən imtina etmişdir

:Ölüm-٣٧

Ölüm həyatın sonu deyil, əksinə bir yerdən başqa bir yerə köçməkdir. İmam Əli (ə) buyurmuşdur: "Dünya əbədi deyil, müvəqqəti bir həyatdır, belə isə, ibrət götürün və onu abad etməyin. Çünki siz əbədi həyat üçün yaradılmısınız. (Ölməklə) bir yerdən ".başqa bir yerə köçəcək və orada əbədi olaraq yaşayacaqsınız

İnsanın xilqəti bir damcı sudan (nütfədən) başlayır, o, tədriclə inkişaf edir və bir məqama çatdıqda, onun bədəninə ruh verilir. Qurani-kərim bu mərhələdən sonra Allahı "Əhsənul-xaliqin" (yaradanların ən yaxşısı) adlandırır. İnsanın əcəli yetişdikdə, bu dünyadan tam ayrı olan bir aləmə köçür ki, bu da onun təkamülüdür. Qurani-kərim

bu mərhələlərə belə işarə edir: “Sonra ona ayrı bir həyat (xilqət) bəxş etdik. Yaradanların ən yaxşısı olan Allah təzimə (və sitayişə) məxsusdur. Bundan sonra siz ”.öləcək və daha sonra isə qiyamət günündə dirildiləcəksiniz



---

.Şura” surəsi, ۸۱-ci ayə“ [۱۹۵] -۱

İnsanın təkamülə çatması maddi dünyanı tərk etməsinə bağlıdır. Əgər ölüm olmasaydı, insan təkamül mərhələsinə çatmazdı. İmam Həsən (ə)-dan "ölüm nədir?" – deyə soruşduqda, o həzrət buyurdu: "Möminlər üçün ən böyük sevincdir, çünki çətinliklərlə birgə olan dünya həyatından əbədi behiştə yola düşür. Kafirlərə isə ən ağır həlakətdir, çünki cəhənnəmə yollanırlar." İmam Cavad (ə)-dan soruşuldu: "Nə üçün müsəlmanların ölümdən xoşu gəlmir?" Həzrət buyurdu: "Çünki onlar ölümün həqiqətini tanımırlar, necə ki, uşaq (xəstələndikdə) dərmanın faydasını bilmədiyi üçün onu qəbul ".eməkdən imtina edir

:Nemət-٣٨

Allaha nisbət verilən nemətlərdən məqsəd, yalnız xeyir və yaxşılıqdır. İnsanın Allah dərgahına yaxınlaşmaq və Onun razılığını cəlb etmək üçün yerinə yetirdiyi əməllərə nemət deyilir. Bütün təfsirçilərin nəzərinə əsasən, Allahın insanlara dinin kamilləşməsi ilə sona yetirdiyi nemət hidayət və doğru yola yönəlməkdir. Hər bir varlığın ən böyük neməti onun həyat sürməsidir. Buna əsasən, hər bir insan axirət aləmindəki həyat .haqqında fikirləşsə, ən böyük nemətə malik olmuşdur

:Nur-٣٩

Gizli və məxfi şeylər nurun vasitəsilə aşkar edilir. Nur Qurani-kərimdə görmək, işıqlandırmaq, hidayət, iman, Quran, xeyir işlər, yol göstərmək, rahatlıq, tövbə, zikr və .şükür mənalarında işlənmişdir

:Yəqin-٤٠

Yəqin elmin xüsusiyyətlərindən olub, mərifət məqamından üstündür və hökmün möhkəmliyi ilə birgə olan nəfsin aramlığına deyilir. İmam Sadiq (ə) buyurmuşdur: "Allah-taala rahatlıq və asayişi yəqin və razılıqda, qəm-qüssəni isə şəkk və tərəddüddə qərar vermişdir." Yenə də o həzrət buyurmuşdur: "Yəqinin həddi budur ki, ".özünü daim Allahla bilib heç bir şeydən qorxmayasan

:Yəqin üç qismə bölünür

Elmül-yəqin: Yəqinin birinci mərtəbəsidir, ondan məqsəd həqiqətlə uyğun gələn-١

dəqiq elmlər, sabit və möhkəm etiqadlardır. Bu məqam alimlərin yorulmaz səy və ciddi .cəhdlə nail olduqları dərəcədir

Eynül-yəqin: Canlı şəkildə müşahidə etməyə və dünyadan gedən zaman can vermə-۲ .halından xəbərdar olmağa deyilir. Bu, ariflərin məqamıdır

Həqqül-yəqin: Aqil ilə məqul arasında mənəvi birliyin və həqiqi əlaqənin-۳ yaranmasına deyilir. Yüksək imana malik olmaq nəticəsində kəşf yolu ilə behişt, .cəhənnəm və onların necəliyini müşahidə edib qeyb aləmindən xəbər verməkdir

## QURANIN BƏZİ SURƏLƏRİNİN OXUNUŞUNUN SAVABI

Fatihə” surəsi: Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs “Fatihə” “-۱ (surəsini oxusa, Allah-taala ona nazil olmuş bütün ayələrin tilavətinin savabını verər.”(۱

Bəqərə” və “Ali-İmran” surələri: İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs “Bəqərə” və“-۲ “Ali-İmran” surələrini oxusa, qiyamət günündə bu iki surə iki bulud parçası kimi ona (kölgə salar.”(۲

Bəqərə” surəsində yerləşən ən fəzilətli ayə – “Ayətəl-kürsü” haqqında göstəriş“ verilmişdir ki, hər gün onu yetmiş dəfə oxuyun. Əgər səhralıqda olsanız, bir dairə xətt çəkdikdən sonra dəstəmazlı halda, dairənin içində üzü qibləyə oturub onu oxusanız, .hacətlərinizin qəbul olunması üçün çox faydalıdır

Nisa” surəsi: Əmirəl-möminin Əli (ə) buyurmuşdur: “Hər kəs “Nisa” surəsini hər“-۳ (cümə günü oxusa, qəbir əzabından amanda qalar.”(۳

Maidə” surəsi: İmam Baqir (ə) buyurmuşdur: “Hər kəs “Maidə” surəsini hər cümə“-۴ axşamı oxuyarsa, zülm imanına qalib gəlməz və heç vaxt Allaha şərik qoşanlardan (olmaz.”(۴

Ənam” surəsi: İmam Sadiq (ə) buyurmuşdur: “Ənam” surəsi birdəfəyə nazil“-۵ olmuşdur. Yetmiş min mələk onu Allahın yetmiş böyük adı olduğu halda, Peyğəmbərə gətirmişlər. Əgər camaat onun oxunuşunun nə qədər fəzilət və savaba malik ”.olduğunu bilsəydilər, onu oxumağı heç vaxt tərk etməzdilər

İmam Rza (ə) buyurmuşdur: “Hər kəs bu surəni oxusa, yetmiş min mələk onun üçün (qiyamət gününədək təsbih deyərlər.”(۵

İmam Baqir (ə) buyurmuşdur: “Əgər bir şəxsin vasitəsilə həlak olacağından qorxsan, ”.“Ənam” surəsini oxu ki, sənə heç bir zərər yetirə bilməz

Əraf” surəsi: İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs “Əraf” surəsini hər ayda bir“-۶ dəfə oxusa, qiyamət günü Allah-taalanın buyurduğu qorxu və qüssəsi olmayan, hər (cümə günü oxusa isə, qiyamət hesabı asan tutulan şəxslərdən olacaqdır.”(۶

Ənfal" surəsi: İmam Sadiq (ə) buyurmuşdur: "Hər kəs "Ənfal" və "Tövbə" surələrini"-٧ hər ay oxusa, Şeytan ona yaxınlaşa bilməz və Əmirəl-möminin Əli (ə)-ın şiələrindən ".olar

Hud" surəsi: İmam Baqir (ə) buyurmuşdur: "Hər kəs hər cümə günü "Hud" surəsini"-٨ oxusa, Allah-taala qiyamət günü onu peyğəmbərlər cərgəsində gətirəcək və (günahlarını bağışlayacaq."(٧

Yusif" surəsi: İmam Sadiq (ə) buyurmuşdur: "Hər kəs "Yusif" surəsini hər gün və ya"-٩ hər gecə bir dəfə oxusa, Allah-taala qiyamət günü onu Yusif (ə)-ın gözəlliyində gətirəcək, camaat üçün olan çətinlik onun üçün olmayacaq və onun (behiştdəki) (qonşuları Allahın saleh bəndələrindən olacaqdır."(٨

İbrahim" və "Hicr" surələri: İmam Sadiq (ə) buyurmuşdur: "Hər kəs "İbrahim" və"-١٠ "Hicr" surələrini cümə gününün namazının iki rükətində oxusa, heç vaxt fəqirliyə və ".dəliliyə tutulmaz

Taha" surəsi: Onu ruzinin artması və işlərin sahmana düşməsi üçün sübh"-١١ azanından sonra gün çıxana qədər oxumaq faydalıdır. İmam Sadiq (ə) buyurmuşdur: "Taha surəsini oxumağı tərk etməyin, çünki Allah-taala onu və onu oxuyanı sevir. Hər kəs onu oxumağa müdavimət etsə, Allah-taala qiyamət günü əməl dəftərini onun sağ əlinə verər və onun İslamda olan əməllərindən ağır hesab çəkməz, həmçinin o, razı (olanadək ona (Öz nemətlərini) əta edər."(٩



---

.Təfsiri Nurus-səqəleyn", ١-ci cild, səh. ٤" [١٩٦]-١

.Yenə orada, ١-ci cild, səh. ٣٠٩ [١٩٧]-٢

.Yenə orada, ١-ci cild, səh. ٤٢٩ [١٩٨]-٣

.Vəsailuş-şiə", ٢-ci cild, səh. ٢٨٨" [١٩٩]-٤

.Biharul-ənvar", ٨٩-cu cild, səh. ٢٧٤, hədis: ١" [٢٠٠]-٥

.Təfsiri Əyyaşi", ٢-ci cild, səh. ٢" [٢٠١]-٦

.Biharul-ənvar", ٨٩-cu cild, səh. ٢٧٨" [٢٠٢]-٧

.Təfsiri Əyyaşi", ٢-ci cild, səh. ١٦٦" [٢٠٣]-٨

Həcc” surəsi: İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs “Həcc” surəsini hər üç gündən“-۱۲ bir oxusa, həmin ildə ona həcc qismət olar və əgər həcc səfərində ölsə, behiştə daxil ”.olar

Yasin” surəsi: Hər gün üzü qibləyə oturub, onu oxuduqdan sonra yüz dəfə salavat“-۱۳ .deməyin savabı çoxdur

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs qabiristanlığa daxil olarkən “Yasin” surəsini oxusa, o gün qəbiristan əhlindən (əzab) azalar və oxuyan şəxs üçün (qəbiristanda olan hər bir qəbrin müqabilində çoxlu savab verilər.”(۱

Zümər” surəsi: İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs “Zümər” surəsini oxusa,“-۱۴ Allah-taala ona dünya və axirət şərəfini verər və onu mal-dövlətsiz və qohum-(əqrəbasız halda, başıuca edər.”(۲

Fussilət” surəsi: İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs “Fussilət” surəsini oxusa,“-۱۵ qiyamət günü göz işlədikcə nur və sevinc görəcək, dünyada isə başqalarının tərif və (qibtəsi ilə yaşayacaqdır.”(۳

Duxan” surəsi: İmam Baqir (ə) buyurmuşdur: “Hər kəs vacib və müstəhəb“-۱۶ namazlarda “Duxan” surəsini oxusa, Allah-taala qiyamət günü onu amanda olanlardan qərar və ona Öz ərşinin kölgəsində yer verəcək, ondan asan hesab (çəkərək əməl dəftərini sağ əlinə verəcəkdir.”(۴

Zariyat”, “Şərh” və “Təlaq” surələri: Bu surələri hər gün bir dəfə ruzinin artması,“-۱۷ gündəlik xərcin əldə edilməsi və güman etmədiyi yerdən ruzinin yetişməsi üçün .oxumaq faydalıdır

Ər-rəhman” surəsi: İmam Sadiq (ə) buyurmuşdur: “Ər-rəhman” surəsini oxumağı“-۱۸ tərk etməyin, həqiqətən bu surə münafiqlərin qəlbində yer tutmaz. Hər kəs bu surəni ”.həmişə namazda oxusa, qiyamət günündə şəfaət edər

Vaqiə” surəsi: Hər gecə işa namazından sonra və ya yatmazdan qabaq bir dəfə“-۱۹ .oxumaq faydalıdır

İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs işa namazından sonra “Vaqiə” surəsini oxusa, (heç vaxt fəqir və camaata möhtac olmaz.”(۵

Təlaq” surəsi: Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs “Təlaq”“-۲۰ (surəsini oxusa, Allahın Rəsulunun davranışı əsasında vəfat edər.”(۶

.Məariç” surəsi: Bu surəni oxumaq insanı Şeytanın şərrindən qoruyub saxlayır“-۲۱

Nuh” surəsi: Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs “Nuh” surəsini“-۲۲ oxuyub, Allahdan bir hacət diləsə, Allah-taala o hacətin yerinə yetirməsini (asanlaşdırar.”(۷

Cin” surəsi: İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs bu surəni çox oxusa, dünyada“-۲۳ cinlərin gözündən, sehrindən və şərrindən amanda qalar və behiştdə həzrət ”.Peyğəmbəri-Əkrəm (s)-in dostlarından olar

Müzzəmmil” surəsi: Ruzinin artması üçün qırx bir gün müddətində hər gün bir dəfə“-۲۴ .oxumaq faydalıdır

Nəbə” surəsi: Hər kəs hər gün sübh namazından sonra – bir ildən üç il müddətində“-۲۵ – oxusa, Allah-taala ona həcc ziyarətini qismət edər. Həmçinin, hər gün əsr .namazından sonra onu xəstənin şəfa tapması üçün oxumaq çox faydalıdır

Fəcr” surəsi: İmam Sadiq (ə) buyurmuşdur: “Bu surə imam Hüseyn (ə)-ın surəsidir.“-۲۶ Hər kəs onu vacib və müstəhəb namazlarda oxusa, behiştdə imam Hüseyn (ə)-la birgə ”.olar

Bələd” surəsi: İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs bu surəni oxuyub, ona əməl“-۲۷ (etsə, Allah-taala onu Peyğəmbər (s)-lə məhşur edər.”(۸

Şəms” surəsi: Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs “Şəms”“-۲۸ surəsini oxusa, sanki üzərinə günəş və ay sacan hər bir şeyin sayı qədər sədəqə (vermişşdir.”(۹

۱- [۲۰۵] “Məcməül-bəyan”, ۸-ci cild, səh. ۶۴۶.

۲- [۲۰۶] “Müstədrəkül-vəsail”, ۴-cü cild, səh. ۳۴۷.

۳- [۲۰۷] “Vəsailuş-şiə”, ۲-ci cild, səh. ۸۹۱.

۴- [۲۰۸] “Əl-burhanu fi təfsiril-Quran”, ۷-ci cild, səh. ۱۵۵.

۵- [۲۰۹] “Nurus-səqəleyn”, ۵-ci cild, səh. ۲۰۳.

۶- [۲۱۰] “Müstədrəkül-vəsail”, ۴-cü cild, səh. ۳۵۲.

۷- [۲۱۱] “Əl-burhanu fi təfsiril-Quran”, ۸-ci cild, səh. ۱۲۶.

۸- [۲۱۲] “Müstədrəkül-vəsail”, ۴-cü cild, səh. ۳۵۸.

۹- [۲۱۳] “Məcməül-bəyan”, ۱۰-cu cild, səh. ۷۵۲.

Ləyl” surəsi: Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs “Ləyl” surəsini“-۲۹ oxusa, Allah-taala ona razı olanadək ruzi verər, onu çətinlikdən qurtarar və ona (asanlıq əta edər.”(۱

Zuha” surəsi: Hər gün, yaxud hər cümə gecəsi arada fasilə vermədən oxumağın“-۳۰ .çoxlu savabı vardır

Qədr” surəsi: Hər bir hacətin yerinə yetirilməsi üçün bir məclisdə (bir oturumda) üç“-۳۱ yüz altmış dəfə, həccə getmək və ruzinin artması üçün iyirmi dörd saat ərzində min .dəfə oxumaq faydalıdır

İmam Baqir (ə) “Qədr” surəsinin oxunuşunun savabı haqqında buyurmuşdur: “Hər kəs “Qədr” surəsini uca səslə oxusa, Allah yolunda qılınc çəkən; hər kəs onu yavaş oxuyarsa, Allah yolunda öz qanına boyanmış kimi olar. Həmçinin, hər kəs onu on dəfə (oxusa, onun min günahı bağışlanar.”(۲

Zəlzələ” surəsi: İmam Rza (ə) buyurmuşdur: “Bu surəni dörd dəfə oxuyan şəxsə“-۳۲ ”.Quranın hamısını oxuyub qurtaran şəxsin savabı verilər

İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs bu surəni oxusa, dünyada zəlzələ və ildırım ”.kimi böyük bəlalara düçar olmaz

Qariə” surəsi: İmam Baqir (ə) buyurmuşdur: “Hər kəs “Qariə” surəsini oxusa, Allah-“-۳۳ taala bu dünyada onu Dəccalın fitnəsindən, qiyamətdə isə cəhənnəmin hərarətindən (qoruyub saxlayar.”(۳

Təkasur” surəsi: Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs “Təkasur”“-۳۴ (surəsini yatanda oxusa, qəbir fitnəsindən amanda qalar.”(۴

Əsr” surəsi: Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs “Əsr” surəsini“-۳۵ ardıcıl oxusa, Allah-taala onun axır-aqibətini yaxşılıqla sona bitirər və haqq səhabələrindən olar. Əgər həmin surə xəzinəyə oxunsa, sahibi o xəzinəni acanadək, (Allah-taala onu qoruyub saxlayar.”(۵

Huməzə” surəsi: İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs vacib namazların birində“-۳۶

“Huməzə” surəsini oxusa, Allah-taala yoxsulluğu ondan uzaqlaşdırar, ruzisini artırar və (pis (faciəli) ölümü ondan uzaq edər.”(۶

Kövsər” surəsi: İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs bu surəni vacib və“-۳۷ müstəhəb namazlarda oxusa, Allah-taala onu “Kövsər” bulağından sirab edər. Belə ”.şəxs “Tuba” ağacının altında Peyğəmbəri-Əkrəm (s)-lə birgə olar

Kafirun” surəsi: İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs bu surəni vacibi namazda“-۳۸ ”.oxusa, Allah-taala onu, atasını və anasını bağışlayar, dünyada başıuca edər

İxlas” surəsi: Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs “İxlas” surəsini“-۳۹ bir dəfə oxusa, sanki Quranın üçdə birini, onu iki dəfə oxusa, sanki Quranın üçdə ikisini (və onu üç dəfə oxusa, sanki bütün Quranı oxumuşdur.”(۷

Fələq” və “Nas” surələri: İmam Baqir (ə) buyurmuşdur: “Hər kəs vətr namazında“-۴۰ “Fələq”, “Nas” və “İxlas” surələrini oxusa, ona belə deyilər: “Ey Allahın bəndəsi! Müjdə (olsun sənə, həqiqətən Allah-taala (sənin) vətr namazını qəbul etmişdir.”(۸



---

.Yenə orada, səh. ۷۵۷ [۲۱۴] -۱

.Üsuli-kafi”, ۴-cü cild, səh. ۴۲۷, hədis: ۶“ [۲۱۵] -۲

.Nurus-səqəleyn”, ۵-ci cild, səh. ۶۵۸“ [۲۱۶] -۳

.Üsuli-kafi”, ۴-cü cild, səh. ۴۲۹, hədis: ۱۴“ [۲۱۷] -۴

.Əl-burhan fi təfsiril-Quran”, ۸-ci cild, səh. ۳۷۹“ [۲۱۸] -۵

.Nurus-səqəleyn”, ۵-ci cild, səh. ۶۶۷“ [۲۱۹] -۶

.Biharul-ənvar”, ۸۹-cu cild, səh. ۳۵۰, hədis: ۱۸“ [۲۲۰] -۷

.Məcməül-bəyan”, ۱۰-cu cild, səh. ۸۶۴“ [۲۲۱] -۸

## QURAN OXUMAQ HAQQINDA QIRX HƏDİS

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Sizlərdən hər hansı biriniz Allahla-۱ danışmaq istəyirsə, Quran oxusun. Elmin əvvəlini və axırını (öyrənmək) istəyənlər ”.gərək Quran oxusunlar

İmam Əli (ə) buyurmuşdur: “Ən fəzilətli zikr Quran oxumaqdır, çünki bu əməl qəlbin-۲ ”.genişlənməsinə və batinin nurlu olmasına səbəb olur

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Həddi-büluğa çatmamışdan qabaq-۳ ”.Quran oxuyanlara, şübhəsiz ki, hikmət verilmişdir

İmam Əli (ə) buyurmuşdur: “Yeddi yerdən başqa vaxtlarda həmişə Quran oxuyun: ۱--۴ Rükuda. ۲-Səcdədə. ۳-Hacətləri istəyəndə. ۴-Hamamda. ۵-Cünub halında. ۶-Heyz (halında. ۷-Nifas halında.”(۱

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs Allahın və Onun-۵ ”.peyğəmbərlərinin dostu olmaq istəyirsə, Quranı üzündən oxusun

İmam Sadiq (ə) buyurmuşdur: “Quranı üzündən oxumaq valideynin əzabını kafir olsa-۶ ”.da belə yüngülləşdirir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Quranın mətninə və yazısına baxmaq-۷ ”.ibadətdir

İmam Sadiq (ə) buyurmuşdur: “Sənin yanında Quran oxunulanda, sakit qalıb qulaq-۸ ”.asmaq sənə vacibdir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər gecə (Qurandan) on ayə oxuyan-۹ ”.şəxs qafillərdən sayılmaz və əgər əlli ayə oxusa, zikr edənlərdən hesab olunar

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Quranı uca səslə oxuyan şəxs-۱۰ sədəqəni aşkar şəkildə verən, yavaş səslə oxuyan şəxs isə sədəqəni gizli şəkildə ”.verən şəxsə bənzəyir

İmam Sadiq (ə) buyurmuşdur: “Mömin bir gənc Quran oxusa, (Quran) onun əti və-۱۱

qanı ilə qaynayıb-qarışar və qiyamət günündə onun üçün (əzab qarşısında) bir maneə ”.qərar verilər

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Məscidlər Qurana görə bərpa-۱۲ ”.edilmişdir

İmam Əli (ə) buyurmuşdur: “Quran haqqında düşünün və onu yaxşı başa düşün;-۱۳ ”.çünki Quran qəlblərin baharıdır

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Quran oxuyanların ən yaxşısı,-۱۴ ”.şübhəsiz ki, Quran oxuyanda qəmgin olanlardır

İmam Sadiq (ə) Allaha dua edərək demişdir: “İlahi! Məni Quranın halalına əməl-۱۵ edənlərdən, haramından çəkinənlərdən, vaciblərini yerinə yetirənlərdən, hüdud və ”!qanunlarını icra edənlərdən qərar ver

İmam Sadiq (ə) Allaha dua edərək demişdir: “(İlahi!) Quran oxumağı mənim üçün-۱۶ ”.elə qərar ver ki, onu oxuyanda Sən məndən razı qalasan

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Öz övladlarınızı üç şeylə tərbiyə edin:-۱۷ (Peyğəmbərinizə məhəbbətlə, onun Əhli-beytinə sevgi-istəklə və Quran oxumaqla.”(۲

İmam Əli (ə) buyurmuşdur: “Quran gündüzdə yol göstərən, qaranlıq gecədə isə işıq-۱۸ ”.sacandır

İmam Sadiq (ə) buyurmuşdur: “Quran (insanı) behiştə göndərib, cəhənnəmdən-۱۹ ”.saxlayır

İmam Səccad (ə) buyurmuşdur: “Quran mənimlə olduğu halda, şərqlə qərb-۲۰ ”.arasında yaşayanların hamısı ölsə də, mən təklikdən qorxmaram

İmam Sadiq (ə) buyurmuşdur: “Quranı əzbərdən bilən şəxs ona əməl etsə, axirətdə-۲۱ ”.Allahın xəbər gətirən və yaxşı rəftar edən mələkləri ilə dost olar

İmam Sadiq (ə) buyurmuşdur: “Quran oxuyan şəxs ehtiyacsız olar, əks təqdirdə-۲۲ ”.(Quan oxumasa) heç bir şey onu qane etməz

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Quran hamilləri (hafizləri) behişt-۲۳
”.əhlinin nümayəndələri və başçılarıdır

İmam Sadiq (ə) buyurmuşdur: “Zehnin və bədəninin zəif olmasına baxmayaraq-۲۴
”.zəhmət çəkib Quranı əzbərləyən şəxsin savabı çoxdur

İmam Səccad (ə) buyurmuşdur: “Quran ayələri xəzinədir, hər vaxt o xəzinənin-۲۵
”.ağzını acdınsa, bil ki, ona nəzər etməyin savabı vardır

İmam Sadiq (ə) buyurmuşdur: “Dünya əhli səmadakı ulduzlara baxdıqları kimi,-۲۶
”.səma əhli də müsəlman bir şəxsin Quran oxuduğu evə baxarlar

İmam Sadiq (ə) buyurmuşdur: “Mən evdə Quranın olmasını sevirəm, çünki Allah-۲۷
”.onun vasitəsilə şeytanları (evdən) uzaq edir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Mələklər mənim ümmətimdən olan-۲۸
qeyri-ərəb bir şəxsin düzgün oxumadığı Quranı səhih ərəblə (oxunmuş kimi) yuxarı
”.apararlar

İmam Sadiq (ə) buyurmuşdur: “Möminə layiqdir ki, ya Quranı öyrənsin, ya da onu-۲۹
”.öyrənmək üçün zəhmət çəksin

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Evlərinizi Quran oxumaqla-۳۰
işıqlandırın, yəhudilər və məsihilər kimi qəbiristana çevirməyin (onlar yalnız kilsələrdə
Tövrat və İncili oxuyub, ibadət edirlər); çünki Quran oxumaq xeyir-bərəkət gətirir və
”.ev əhalisinin çoxlu ruzi əldə etməsinə səbəb olur

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Quranın digər sözlərə olan fəzilət və-۳۱
üstünlüyü Allahın sair varlıqlara olan fəzilət və üstünlüyü kimidir. Quran hər bir şeydən
– Allahdan başqa – üstündür. Buna əsasən, hər kəs Qurana ehtiram göstərsə, sanki
Allaha ehtiram göstərmişdir; hər kəs də Qurana ehtiram göstərməsə, sanki Allaha
”.ehtiramsızlıq etmişdir

İmam Sadiq (ə) buyurmuşdur: “Quranı əzbərləyib, ona əməl edənlərin məqamları-۳۲
”.asimanın ən böyük mələklərinə bərabərdir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Mənim ümmətimin yüksək məqama-۳۳
”.nail olan şəxsləri Quranı həml (hifz) edənlər və gecə (ibadət üçün) oyaq qalanlardır

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Həqiqətən, Allahın kitabından bir ayə-۳۴
”.oxumaq ərşin altından tutmuş, yerin altına qədər olanlardan yaxşıdır

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “...Axirətin bəlası Quran oxuyan-۳۵
”.şəxsdən götürülər

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Allah-taala üç səsi çox sevir: ۱-Quran-۳۶
tilavət edən şəxsin səsini. ۲-Xoruzun səsini. ۳-Sübh vaxtı günahlarının bağışlanmasını
”.diləyən şəxsin səsini

Həzrət Peyğəmbəri-Əkrəm (s) Salman Farsiyə buyurmuşdur: “Ey Salman! Sənə-۳۷
Quran oxumağı tövsiyə edirəm, çünki Quran oxumaq cəhənnəm odunun qalxanıdır,
insanı əzabdan saxlayır və günahların kəffarəsi sayılır... Mömin şəxs Quran oxuyanda
”.Allah-taala ona rəhmət nəzərilə baxır

İmam Əli (ə) buyurmuşdur: “Qurandan bir ayə eşidən şəxs üçün (bunu eşitmək-۳۸
”.Yəməndə yerləşən) “Şir” dağının ağırlığı qədər qızılı olmasından yaxşıdır

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Sizin ən yaxşılarınız Quranı öyrənib,-۳۹
”.başqalarına öyrədənlərdir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Üç şeyə baxmaq ibadətdir: ۱-Ata--۴۰
”.ananın üzünə. ۲-Dənizə. ۳-Qurani-kərimə

səh:۵۷

**ALLAHIN QIRX ANDI**

١-“Vətturi”: “And olsun Tur dağına.”(١)

٢-“Və kitabin məstur”: “And olsun yazılmış kitaba (Qurana).”(٢)

٣-“Vəssəmai vət-tariq”: “And olsun göyə və gecə gələnə.”(٣)

٤-“Vəssəmai zatil-büruc”: “And olsun bürclər sahibi olan göyə.”(٤)

٥-Vəl-yovmil-məvud”: “And olsun vəd olunmuş günə.”(٥)

٦-Vəlləyli və ma vəsəq”: “And olsun gecəyə və gecənin qoynuna aldıqlarına.”(٦)

٧-Vəl-qəməri izət-təsəq”: “And olsun bədirlənməkdə olan aya.”(٧)

٨-Fəla uqsimu bil-xunnəs”: “And içirəm gecə yanıb, gündüz sönən ulduzlara.”(٨)

٩-“Vəlləyli iza əsəs”: “And olsun qaralmaqda olan gecəyə.”(٩)

١١-“Vən-naziati ğərqa”: “And olsun (kafirlərin canını) çətinliklə alanlara (əzab mələklərinə).”(١٠)

١٢-“Vən-naşitati nəşta”: “And olsun (möminlərin canını) rahatlıqla alanlara.”(١١)

١٣-“Vəs-sabihati səbha”: “And olsun (Allahın əmrlərini) sürətlə yerinə yetirənlərə.”(١٢)

١٤-“Fəs-sabiqati səbqa”: “And olsun (bir-birini) ötən mələklərə.”(١٣)

١٥-“Fəl-muddəbirati əmra”: “And olsun işə əncam çəkənlərə (Allahın əmri ilə dünyanın işlərini idarə edən mələklərə).”(١٤)

١٦-Vəl-mursəlati urfa”: “And olsun bir-birinin ardınca göndərilən elçilərə.”(١٥)

١٧-“La uqsimu biyovmil-qiyaməh”: “And içirəm qiyamət gününə.”(١٦)

١٨-“Və la uqsimu bin-nəfsil-ləvvaməh”: “And içirəm özünü qınayan nəfsə.”(١٧)

١٩-“Nun vəl-qələmi və ma yəsturun”: “Nun! And olsun qələmə və (mələklərin)

(yazdıqlarına.”(۱۸

(Vən-nəcmi iza həva”: “Batmaqda olan ulduza (Sürəyya ulduzuna) and olsun.”(۱۹“-۲۰

(Vəl-bəytil-məmur”: “And olsun (mələklərin ibadət etdiyi) Beytül-məmura.”(۲۰“-۲۱

(Vəz-zariyati zərva”: “And olsun (toz-torpağı) sovurub dağıdan küləklərə.”(۲۱“-۲۲



---

.Tur” surəsi, ۱-ci ayə“ [۲۲۴] -۱

.Tur” surəsi, ۲-ci ayə“ [۲۲۵] -۲

.Tariq” surəsi, ۱-ci ayə“ [۲۲۶] -۳

.Büruc” surəsi, ۱-ci ayə“ [۲۲۷] -۴

.Büruc” surəsi, ۲-ci ayə“ [۲۲۸] -۵

.İnşiqaq” surəsi, ۱۷-ci ayə“ [۲۲۹] -۶

.İnşiqaq” surəsi, ۱۸-ci ayə“ [۲۳۰] -۷

.Təkvir” surəsi, ۱۵-ci ayə“ [۲۳۱] -۸

.Təkvir” surəsi, ۱۷-ci ayə“ [۲۳۲] -۹

.Naziat” surəsi, ۱-ci ayə“ [۲۳۴] -۱۰

.Naziat” surəsi, ۲-ci ayə“ [۲۳۵] -۱۱

.Naziat” surəsi, ۳-cü ayə“ [۲۳۶] -۱۲

.Naziat” surəsi, ۴-cü ayə“ [۲۳۷] -۱۳

.Naziat” surəsi, ۵-ci ayə“ [۲۳۸] -۱۴

.Mürsəlat” surəsi, ۱-ci ayə“ [۲۳۹] -۱۵

.Qiyamət” surəsi, ۱-ci ayə“ [۲۴۰] -۱۶

.Qiyamət” surəsi, ۲-ci ayə“ [۲۴۱] -۱۷

.Qələm” surəsi, ۱-ci ayə“ [۲۴۲] -۱۸

.Nəcm” surəsi, ۱-ci ayə“ [۲۴۳] -۱۹

.Tur” surəsi, ۴-cü ayə“ [۲۴۴] -۲۰

.Zariyat” surəsi, ۱-ci ayə“ [۲۴۵] -۲۱

۲۳- “Fəl-hamilati viqra”: “And olsun yağış yüklü buludlara.”(۱)

۲۴- “Vəl-adiyati zəbha”: “And olsun (cihad zamanı) tövşüyə-tövşüyə) qacan atlara.”(۲)

۲۵- “Vəttini vəz-zəytun”: “And olsun əncirə və zeytuna.”(۳)

۲۶- “Və turi sinin”: “And olsun Tur dağına.”(۴)

۲۷- “Və hazəl-bələdil-əmin”: “And olsun bu təhlükəsiz, əmin-amanlıq şəhərə (Məkkəyə).”(۵)

۲۸- “Vəzzuha”: “And olsun günorta vaxtı aydınlıq günə.”(۶)

۲۹- “Vəlləyli iza səca”: “And olsun sakitləşməkdə olan gecəyə.”(۷)

۳۰- “Vəlləyli iza yəğşa”: “And olsun (aləmi zülmətə) bürüməkdə olan gecəyə.”(۸)

۳۱- “Vəşşəmsi və zuhaha”: “And olsun günəşə və onun işığına.”(۹)

۳۲- “Vəl-qəməri iza təlaha”: “And olsun günəşin ardınca çıxan aya.”(۱۰)

۳۳- “Vəssəmai və ma bənaha”: “And olsun göyə və onu yaradana.”(۱۱)

۳۴- “Vəl-ərzi və ma təhaha”: “And olsun yerə və onu döşəyənə.”

۳۵- “Və nəfsin və ma səvvaha”: “And olsun nəfsə və onu yaradana.”(۱۲)

۳۶- “La uqsimu bihazəl-bələd”: “And içirəm bu şəhərə (Məkkəyə).”(۱۳)

۳۷- “Və validin və ma vələd”: “And içirəm ataya və onun övladına.”(۱۴)

۳۸- “Vəl-fəcr”: “And olsun dan yerinə.”(۱۵)

۳۹- “Və ləyalin əşr”: “And olsun on gecəyə (Zil-həccə ayının birinci on gecəsinə).”(۱۶)

۴۰- “Vəlləyli iza yəsr”: “And olsun keçib getməkdə olan gecəyə.”(۱۷)

səh:۵۹

۱- [۲۴۶] “Zariyat” surəsi, ۲-ci ayə.

۲- [۲۴۷] “Adiyat” surəsi, ۱-ci ayə.

۳- [۲۴۸] “Tin” surəsi, ۱-ci ayə.

۴- [۲۴۹] “Tin” surəsi, ۲-ci ayə.

۵- [۲۵۰] “Tin” surəsi, ۳-ci ayə.

۶- [۲۵۱] “Zuha” surəsi, ۱-ci ayə.

۷- [۲۵۲] “Zuha” surəsi, ۲-ci ayə.

۸- [۲۵۳] “Ləyl” surəsi, ۱-ci ayə.

۹- [۲۵۴] “Şəms” surəsi, ۱-ci ayə.

۱۰- [۲۵۵] “Şəms” surəsi, ۲-ci ayə.

۱۱- [۲۵۶] “Şəms” surəsi, ۵-ci ayə.

۱۲- [۲۵۸] “Şəms” surəsi, ۷-ci ayə.

۱۳- [۲۵۹] “Bələd” surəsi, ۱-ci ayə.

۱۴- [۲۶۰] “Bələd” surəsi, ۳-cü ayə.

۱۵- [۲۶۱] “Fəcr” surəsi, ۱-ci ayə.

۱۶- [۲۶۲] “Fəcr” surəsi, ۲-ci ayə.

۱۷- [۲۶۳] “Fəcr” surəsi, ۴-cü ayə.

## QIRX HAQQ

.Allahın sənin üzərində ən böyük haqqı: Ona ixlasla ibadət etməkdir-١

.Nəfəs çəkməyin haqqı: Allaha itaət etməkdir-٢

Qulağın haqqı: Onun insanın boynunda olan haqqı haram sözlər (qeybət)-٣ eşitməkdən qoruyub saxlamaq, qəlbdə xoş düşüncə, ideya və gözəl xasiyyət yaradan hikmətli sözləri eşidib qəlbə ötürməkdən əlavə, xariclə qəlb arasında əlaqə vasitəsinə çevirməməkdən ibarətdir. Çünki qulaq həm pis, həm də yaxşı şeyləri ürəyə yetirən bir .qapıdır

Dilin haqqı: Haram sözlər deməkdən (söyüş söymək, qeybət etməkdən) çəkinmək,-۴ .boş-boş danışmamaq və gözəl sözlər deməyə adət etməkdir

.Gözün haqqı: Onu haramlardan saxlamaqdır-۵

.Əlin haqqı: Haram mala (və haram şeyə) əl uzatmamaqdır-۶

Ayağın haqqı: Haram üçün arddım atmamaqdır; çünki insan bir neçə müddətdən-٧ .sonra həmin ayaqla Sirat körpüsünü keçməlidir

.Qarının haqqı: Həddən artıq yeməmək və onu haram malla doldurmamaqdır-٨

.cinsiyyət üzvünün haqqı: Onu örtmək və zinadan qoruyub saxlamaqdır-٩

Namazın haqqı: Onu hüzuri-qəlblə, diqqətlə qılmaq və bütün şərtlərinə əməl-١٠ .etməkdir

Həccin haqqı: Onun vacib bir vəzifə olduğunu bilmək və günahdan çəkinib Allaha-١١ .pənah aparmaqdır

Orucun haqqı: Onun Allah tərəfindən dilin, qulağın, gözün, qarının və sair bədən-١٢ üzvlərinin üzərinə çəkilən bir pərdə olduğunu və cəhənnəm odundan qoruduğunu .bilməkdir

.Sədəqənin haqqı: Allaha tapşırılan bir zəxirə və əmanət olduğuna inanmaqdır-١٣

.Qurbanlığın haqqı: Onu yalnız Allaha xatir yerinə yetirməkdir-۱۴

Müəllimin haqqı: Onun sözlərinə qulaq asmaq, ona ehtiram bəsləmək və onunla-۱۵
.ucadan danışmamaqdır

Nəzarət altında yaşayanların haqqı: Onlarla ədalətlə davranmaq, mehriban bir ata-۱۶
kimi onların qayğısını çəkmək, cəzalandırmaqda tələsməmək və səhvlərinə göz
.yummaqdır

Şagirdin haqqı: Onlarla yaxşı və mülayim rəftar etmək, elm öyrətməkdə paxıllıq-۱۷
.etməməkdir

Arvadın haqqı: Onun Allah tərəfindən bir nemət olduğunu bilmək və onunla yaxşı-۱۸
.davranıb, ehtiramını saxlamaqdır

Ananın haqqı: Səni doqquz ay özü ilə gəzdirdiyini, gecələri yatmayıb sənə süd-۱۹
verdiyini, əzab-əziyyətlərə sinə gərib səni boya-başa çatdırdığını, özü ac-susuz qaldığı
halda, sənə yemək və su verdiyini başa düşüb, ehtiramını saxlamaqdır. İmam Səccad
(ə) bu barədə buyurmuşdur: “Ananın sənin boynundakı haqqı budur ki, biləsən ki, o,
səni elə bir müddətdə və elə bir yerdə – öz bətnində saxlamışdır ki, heç kəs sənə qarşı
bu işi görməzdi. Anan səni öz qəlbinin meyvəsi ilə qidalandırmışdır, halbuki başqaları
bu işi görməzdi. O, səni bütün var-qüvvəsi və bütün vücudu - qulağı, gözü, əli, ayağı və
(s. - ilə qoruyub saxlamışdır.”۱)

Atanın haqqı: Sənin dünyaya gəlməyində əsas rol oynadığını başa düşməkdir; çünki-۲۰
əgər o olmasaydı, sən də dünyaya gəlməzdin, deməli, bu nemətə görə Allaha şükür et
və onun ehtiramını saxla. İmam Səccad (ə) bu barədə buyurmuşdur: “Atan barəsində
bilməlisən ki, o, sənin vücudunun başlanğıcı və əslidir, sən isə onun budaqlarısan. Əgər
(o olmasaydı, sən də olmazdın. Sənin vücuda gəlməyin ona bağlıdır.”۲)

Övladın haqqı: Sənin vücudunun bir hissəsi olduğunu, dünyada həm yaxşı, həm də-۲۱
pis bir iş gördüyü halda, sənə mənsub edildiyini bilmək və Allaha itaət etməkdə ona
.kömək etməkdir

Qardaşın haqqı: Sənin izzət, qüdrət, dayaq nöqtən və arxalanacağın şəxs olduğunu-۲۲

başa düşüb, çətinliklərdə ona kömək etməyindir. Əgər o, Allaha itaət edənlərdən olsa, .ona arxa ol; əks təqdirdə, Allahı ondan üstün tutmalısan



---

.Töhəful-üqul", səh. ۱۸۹" [۲۶۴] -۱

.Yenə orada [۲۶۵] -۲

Sənə yaxşılıq edən şəxsin haqqı: Ona təşəkkür edib minnətdar olmaq, onu dua-۲۳ etmək, yaxşılığı barəsində danışmaq, mal-dövlət və qüdrət sahibi olduğun zaman .əvəzini ödəməkdir

Azan verən şəxsin haqqı: Səni ibadətə dəvət etdiyi üçün ona öz minnətdarlığını-۲۴ .bildir

Camaat namazında imamın haqqı: O, Allah ilə sənin aranda səfir hökmündə olub,-۲۵ sənin tərəfindən danışdığı, haqqında dua etdiyi, qorxu hissi ilə Allah dərgahında durmağı öhdəsinə aldığı, özünü sənin, namazını da namazının qalxanı qərar verdiyi .üçün ona öz təşəkkürünü bildir

Məclisdəki həmsöhbətlərin haqqı: Onunla mülayim danışmaq, məclisdən çıxmaq-۲۶ .istədikdə, ondan icazə almaq və ona elm öyrətmək üçün paxıllıq etməməkdir

Qonşunun haqqı: Birlikdə olanda ona ehtiram göstərmək, yanında olmadıqda onun-۲۷ abır-heysiyyətini qoruyub saxlamaq, eyblərini axtarmamaq və səhvini bağışlamaqdan .ibarətdir

Dostun haqqı: Onunla insafla rəftar et, ehtiramını saxla. Əgər sənə yaxşılıq-۲۸ .etmişdirsə, əvəzini ödə, günah etmək fikrində olsa, onu bu işdən çəkindir

Malın haqqı: Onu yalnız halal yolla kəsb et və onu xeyirxah işlərə sərf etmək üçün-۲۹ .paxıllıq etmə

Borc aldığın şəxsin haqqı: Əgər gücün çatırsa, borcunu qaytar, əks halda xoş dillə-۳۰ .razılığını cəlb et

.Al-ver etdiyin şəxsin haqqı: Onu aldatmayasan və kələk vurmayasan-۳۱

Dava edən şəxsin haqqı: Əgər onun iddiası haqdırsa, özün ona şahid ol, ona zülm-۳۲ .etmə, haqqını ver; yox əgər nahaq yerə iddia edirsə, onunla mülayim rəftar et

Məsləhətçinin haqqı: Əgər məsləhət edənin məsələsi barəsində xüsusi nəzərin-۳۳ .vardırsa, bəyan et, əks təqdirdə, nəzər sahiblərinin yanına göndər

۳۴- Nəsihətə qulaq asanın haqqı: Ona mülayimliklə, mehr-məhəbbət göstərməklə nəsihət etməkdir.

۳۵- Özündən böyük olan şəxslərin haqqı: Onun yaşını nəzərə alıb, ehtiramını saxlamaq, ondan qabağa keçməmək və onu nadanlıqla ittiham etməməkdir.

۳۶- Özündən kiçik yaşlı şəxslərin haqqı: Ona məhəbbət göstərməklə təlim vermək və səhvini bağışlamaqdır.

۳۷- Xahiş edən şəxsin haqqı: Onun xahişinə və hacətinə müsbət cavab verməkdir.

۳۸- Xahiş etdiyin şəxsin haqqı: Əgər sənin xahişini qəbul etsə, ona minnətdarlığını bildir, əks təqdirdə, üzrxahlıq et.

۳۹- Allaha xatir səni sevindirən şəxsin haqqı: Əvvəlcə Allaha, sonra da ona təşəkkür et.

۴۰- Sənə pislik edən şəxsin haqqı: Onu bağışla, əgər bağışlamağının ona zərəri vardırsa, qisasını al.

səh:۶۱

## YEMƏK VƏ İÇMƏK

.Yemək pak olmalıdır, nəcis yeməyi yemək haramdır-١

Ruzi halal yoldan kəsb olunmalıdır. Müsəlman şəxs malını halal yoldan kəsb etdiyi-٢ halda, onun xums və zəkatını da verməlidir. Şəriətə uyğun olmayan yoldan qazanc əldə edən şəxslərin yeməyindən qorunmaq lazımdır. İmam Əli (ə) Osman ibni Hüneyfə (yazdığı məktubda belə buyurur: "Yeməyinin halallığında şübhə etsən, onu yemə."(١

İmam Baqir (ə) buyurmuşdur: "Allah dərgahında yemək-içməkdə və cinsi-٣ (məsələlərdə haramdan qorunmaqdan yaxşı ibadət yoxdur."(٢

Süfrə başında əyləşməzdən öncə, əllərinizi yuyun. Peyğəmbər (s) buyurmuşdur:-۴ "Yeməkdən qabaq dəstəmaz almaq yoxsulluğu, yeməkdən sonra isə dəliliyi aradan ".aparır və gözün nurunu artırır

Yeməkdən sonra da əllərinizi yuyun. İmam Sadiq (ə) buyurmuşdur: "Hər kəs-۵ yeməkdən əvvəl və sonra əllərini yusa, əvvəldən axıra qədər yemək ona mübarək ".(bərəkətli) olar

Süfrə başında diz üstə əyləşin və heç bir şeyə söykənməyin. İmam Əli (ə)-۶ buyurmuşdur: "Süfrə başında qullar kimi, ayaqlarınızı bir-birinin üstünə qoyub ".dizlərinizin üstə əyləşin və yerdə yemək yeyin

Yeməyi Allahın adı ilə başlayın. İmam Əli (ə) bu barədə buyurmuşdur: "Hər kəs-٧ yeməyi Allahın adı ilə başlasa, zəmanət verirəm ki, ona həmin yeməkdən əzab-əziyyət ".yetişməz

Yeməyi azacıq duz ilə başlayın. Belə ki, imam Əli (ə) buyurmuşdur: "Yeməyi duz ilə -٨ başlayın. Əgər insanlar duzun nə qədər faydalı olduğunu bilsəydilər, onu sınaqdan .".çıxarılmış zəhərə qarşı işlədilən dərmana üstünlük verərdilər

Yeməyi sağ əllə yemək müstəhəbdir. İmam Sadiq (ə) buyurmuşdur: "Sol əlinizlə-٩ ".yeyib-içməyin, hətta bir şey belə almayın

.Yeməyi Allaha həmd-səna etməklə qurtarın və yeməyin sonunda azacıq duz yeyin-١٠

.Tikələri yaxşı çeynəyin, əvvəlki tikəni yeyib qurtarmayınca, başqa tikə götürməyin-۱۱

.Yemək vaxtı imkan daxilində başqasının üzünə baxmayın-۱۲

.Tələskən halda yemək yeməyin və süfrə başında çox oturun-۱۳

.Sol ayağınız üstə oturun və üç barmaqla yeyin-۱۴

Yeməyi isti-isti yemək məkruhdur. İmam Sadiq (ə) həzrət Peyğəmbəri-Əkrəm (s)--۱۵ in belə buyurduğunu nəql etmişdir: “Xörəyi isti-isti yeməyin və onun soyumasını gözləyin; çünki Allah-taala bizim isti yemək yeməyimizi istəmir. Bərəkət soyuq ”.yeməkdədir

Yeməyi üfürmək məkruhdur. İmam Sadiq (ə) bu barədə buyurmuşdur: “Peyğəmbər-۱۶ ”.(s) yeməyə, yaxud içməyə üfürməyi qadağan etmişdir

Yeməkdə orta həddi gözləyin, həddən artıq yeməyin və doymamışdan qabaq-۱۷ .yeməkdən əl çəkin

İmam Rza (ə) buyurmuşdur: “Yeməyə meylin olan halda (doymamışdan qabaq)-۱۸ ondan əlini çək; çünki doymamışdan qabaq yeməkdən əl çəkmək mədəyə, bədənə, (bədənin yüngülləşməsinə və əqlin inkişafına faydalıdır.”(۳

İmam Əli (ə) buyurmuşdur: “Qarnı (normadan artıq) dolu olan şəxs yerin və göyün-۱۹ ”.mələkutuna daxil olmaz

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Boğaza qədər yeməkdən pərhiz-۲۰ (edin, çox yeməyin bədən üçün zərəri var və çox yemək xəstəliyə səbəb olar.”(۴



---

.Nəhcül-bəlağə”, Sübhi Saleh, ۴۵-ci məktub“ [۲۶۶] -۱

.Üsuli-kafi”, ۲-ci cild, səh. ۷۹“ [۲۶۷] -۲

.Müstədrəkül-vəsail”, ۳-cü cild, səh. ۸۱“ [۲۶۸] -۳

.Müstədrəkül-vəsail”, ۳-cü cild, səh. ۸۰“ [۲۶۹] -۴

۲۱- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Çox yemək insanı ibadətə qarşı süst edər.”(۱)

۲۲- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Az yeyən şəxsin bədəni sağlam, qəlbi saf olar, çox yeyən şəxsin isə bədəni xəstə və qəlbi bərk olar.”(۲)

۲۳- İmam Sadiq (ə) buyurmuşdur: “Az yemək hər bir halda və hər bir tayfanın yanında bəyənilmiş bir sifətdir.”(۳)

۲۴- İmam Sadiq (ə) buyurmuşdur: “Möminin qəlbinə çox yeməkdən zərərli bir şey yoxdur. Çox yemək insanın qəlbini bərkidir və ehtirası cuşa gətirir, aclıq isə möminin munisi, ruhun qidası, qəlbin təamı və bədəninin sağlamlığıdır.”(۴)

۲۵- İmam Əli (ə) buyurmuşdur: “Çox yeməkdən pəhriz et, çox yeyən şəxsin xəstəliyi çoxalar və yuxusu pozular.”(۵)

۲۶- İmam Sadiq (ə) buyurmuşdur: “Əgər sizdən biri yeməyə məşğul olarsa, gərək qarnının üçdən bir hissəsini təam üçün, ikinci üçdən bir hissəsini su üçün və digər üçdən bir hissəsini isə nəfəs üçün ayırsın.”(۶)

۲۷- Gecə vaxtı az yeyin, yeməyi heç olmazsa yatmamışdan iki saat öncə yeyin.

۲۸- Cəm halında yemək müstəhəbdir. Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Yemək yeyəndə bir yerə toplaşın; çünki Allah sizin üçün onda xeyir-bərəkət qərar vermişdir.”

۲۹- Yemək vaxtı, xüsusilə tikəni ağıza qoyan zaman danışmaq məkruhdur.

۳۰- Süfrə başında oturduğunuz zaman başqalarını gözləməyib, yeməyə başlayın. Ev sahibi gərək qonağa müxtəlif təkliflər verməklə onu utandırmasın.

۳۱- Süfrə başına möminləri dəvət edin və fasiqləri (günah əhlini) dəvət etməkdən çəkinin. Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Təqvasız şəxslərin yeməyindən istifadə etməyin və onları öz süfrənizə dəvət etməyin.”

۳۲- Çörəyi bıçaqla kəsmək və yeməyin ortasında, xüsusilə yemək yağlı olduğu halda, su

.içmək məkruhdur

Qızıl və gümüş qabda yemək və içmək caiz deyildir. Həzrət Peyğəmbəri-Əkrəm (s)-۳۳ buyurmuşdur: “Hər kəs dünyada qızıl və gümüş qabda su içsə, axirətdə qızıl və gümüş (qabda su içməkdən məhrum olar.”(۷

.Cənabətli halda yemək və içmək məkruhdur-۳۴

Şam vaxtı az yeyin. Həzrət Peyğəmbəri-Əkrəm (s) şam yeməyi haqda-۳۵ ”.buyurmuşdur: “Şam yeməyini tərk etmək bədən sisteminin pozulmasına səbəb olur

Səhər yeməyini istədiyiniz qədər yeyin. İmam Sadiq (ə) bu barədə buyurmuşdur:-۳۶ ”.“Səhər yeməyi insanın izzət və şərəfini artırır

İmam Rza (ə) buyurmuşdur: “Yeməyi qurtardığınız zaman arxası üstə uzanıb, sağ-۳۷ ”.ayağınızı sol ayağınızın üstünə qoyun

Süfrədəki yemək qalıqlarını yemək müstəhəbdir; çünki bu iş fəqirliyi aradan aparır,-۳۸ .bədəndəki ağrıları kəsir və yetmiş savabı vardır

İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs su içib imam Hüseyn (ə)-ı yad etsə və o-۳۹ həzrətin düşmənlərinə lənət göndərsə, onun üçün yüz min savab yazılar və yüz min ”.günahı məhv olunar

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Əgər bir kəs suyu üç dəfəyə içsə və-۴۰ hər dəfə içəndə əvvəldə “Bismillah”, axırda isə “Əl-həmdu lillah” desə, həmin su onun ”.qarnında olduğu vaxta qədər Allaha təsbih deyər və savabı ona verilər



---

.Yenə orada [۲۷۰] -۱

.Yenə orada [۲۷۱] -۲

.Müstədrəkül-vəsail”, ۳-cü cild. səh. ۸۰“ [۲۷۲] -۳

.Yenə orada [۲۷۳] -۴

.Yenə orada, səh. ۸۱ [۲۷۴] -۵

## YEMƏLİ VƏ İÇMƏLİLƏR

١-Nar:

İmam Əli (ə) buyurmuşdur: “Uşaqlarınızın tez dil açması üçün onlara nar yedizdirin.” Nar insanı arıqladır, təzyiqi aşağı salır, əsəb sisteminin normal olması üçün məsləhət görülür, qara ciyərə və sarılıq xəstəliyinə faydalıdır. Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər bir narın içində bir behişt dənəsi vardır və mən onun bir dənəsini belə tərk etməyə (yeməməyə) razı deyiləm.”

٢-Əncir:

Qurani-kərimdə bəzi meyvələrin adı çəkilmişdir, əncir də onlardan biridir. Belə ki, buyurulur: “Vəttini vəz-zəytun.” “An olsun əncirə və zeytuna.”

Əncirin çoxlu faydası vardır. Onun tərkibində şəkər, yağ, mineral maddələr, su və nişasta vardır. Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Əncir behişt meyvələrindəndir və (insanı) incəqəlbli və rəhmli edir.”

٣-Üzüm:

Kamil bir yemək olub mikrobları aradan aparır, qanı az olan uşaqlara xeyirlidir. Bədəndə olan zəhərləri dəf edir, iştahanın artmasına səbəb olur. Onun tərkibində A, V və S vitaminləri vardır. Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Sizin ən yaxşı meyvəniz üzümdür və onun heç bir zərəri yoxdur.”

۴-Günəbaxan:

Onun tərkibində A və V vitaminləri vardır, burunu açır, qara ciyərə faydalıdır, üzərinə milçək və ağcaqanad qonmur, tüstüsü həşəratları, sicanı və qurbağanı qovur.

۵-Albalı:

Onun tərkibində A, V, S və D vitaminləri vardır, qanın turşuluğunu aşağı salır, revmatizm və oynaq ağrılarına faydalıdır.

۶-Gavalı:

Onun tərkibində çoxlu vitamin vardır. İmam Sadiq (ə) buyurmuşdur: “Acqarına gavalı yemək başgicəllənməyə, ürəkbulanmaya və öd kisəsinə xeyirlidir, lakin bədəndəki şişləri oyadır.”

۷-Üzərlik:

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Həqiqətən, üzərliyi yalnız mələklər əkir və məmur olduqları yerə çatdırırlar. Onun dənəsində şəfa vardır və yetmiş növ xəstəliyə dərmandır.”

۸-İsfinac:

Onun tərkibində dəmir vardır, qanda olan turşuluğu və ağızın pis qoxusunu aradan aparır, sümükləri və əzələləri bərkidir. O, bağırsaqlara xeyirlidir və mədə toxumalarını yumşaldır və qan azlığına faydalıdır.

:Badımcan-٩

Su ilə bişirildikdə, insanın arıqlamasına səbəb olur. Böyrəkdəki şişin və oynaq ağrılarının sağalması üçün faydalıdır. Mədə-bağırsaq xəstəliyinə tutulanlara zərərli və dəri xəstəliyinə düçar olanlara qadağandır. Həddən artıq yemək yeyənlərə və təzyiqi .olanlara xeyirlidir

:Düyü-١٠

Bəzi xəstəliklərə tutulanlar üçün münasib bir yeməkdir, arıq şəxslərə, səs tellərinə, ishal və vərəm xəstəliklərinə düçar olanlara xeyirlidir. Onun tərkibində A vitamini və .nişasta vardır

:Heyva-١١

İmam Sadiq (ə) buyurmuşdur: "Hər kəs açqarına heyva yesə, nütfəsi pak və övladı göyçək olar." Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Heyva üzün rəngini ağ və övladı göyçəkləşdirir. Mədə divarının aşılanmasına və ürəyin möhkəmlənməsinə səbəb olur." Həmçinin buyurmuşdur: "Heyvanın üç xasiyyəti vardır: ١-Ürəyə aramlıq və ".şadlıq verir. ٢-Paxılın əliaçıq olmasına səbəb olur. ٣-Qorxağı şücaətli edir

:Portağal-١٢

Bir az su və bal ilə qarışdırıb içəndə bədənin kalsiumunu daha da artırır. Əgər odda .bişirmək istəsəniz, qabın ağzını açıq qoyun. Onun tərkibində S vitamini vardır

:Yarpız-١٣

.Həzmedici və qüvvətlidir, bəlğəmi və köpü aparır, əsəb sistemini sakitləşdirir

:Soğan-١۴

Şəkər, vərəm, revmatizm xəstəliyinin dərmanıdır, böyrəklərdə yaranan daşları əridir, böyrək, mədə və bağırsaqların sağalması üçün onu bişmiş halda yeyin. Dəridəki ləkələri aparmaq üçün soğanı doğrayıb, sirkəyə qoyun, sonra dəriyə çəkin. Soğan .tənəffüs yollarını açır, ishalı, yorğunluğu aparır, iştaha gətirir və zehnə xeyri vardır

:Turp-۱۵

İmam Əli (ə) bu barədə buyurmuşdur: “Turp bəlğəmi aparır, yeməyi dadlı edir.” Həzrət Peyğəmbəri-Əkrəm (s) də buyurmuşdur: “Turpu yedikdən sonra, ağzınızdan onun qoxusunun gəlməməsini istəyirsinizsə, onu yemək istədiyiniz zaman məni yad edin.”

:Cəfəri-۱۶

Cəfərinin yarpağında cinsi hormonlar mövcuddur, onun tərkibində xlorofil olduğu üçün qanı az olan şəxslərdə qan yaradır, oksigenin cəzb olunmasına və qanın təmizlənməsinə səbəb olur.

:Çay-۱۷

Çay içmək ürək döyüntüsünə və digər arizələrin yaranmasına, əsəb sisteminin həddən artıq fəallaşmasına səbəb olur. Yorğunluğu aradan aparır, zehni işləri asanlaşdırır və böyrəklərə xeyri vardır.

:Halva-۱۸

Həzrət Peyğəmbəri-Əkrəm (s)-dən “sizin sevdiyiniz ən yaxşı yemək hansıdır?” – deyə soruşduqda, o həzrət buyurdu: “Soyuq halva.” Həmçinin buyurmuşdur: “Mömin şirindir, şirin şeyləri də çox sevir. Halva da yaxşı yeməklərdən biridir.”

:Yemiş-۱۹

Tez həzm olunur, insanda enerji yaradır, bədəndəki zəhərləri təmizləyir, böyrəyin yaxşı işləməsinə səbəb olur və yorğunluğu aparır. Revmatizm və böyrək xəstəliklərinə faydalıdır, amma şəkər xəstəliyinə zərərdir. Yemişi acqarına yeməyin, çünki qulunca və iflicə səbəb ola bilər. İmam Əli (ə) buyurmuşdur: “Yemişin şərbəti behişt şərbətlərindəndir.” Həzrət Peyğəmbəri-Əkrəm (s) də buyurmuşdur: “Yemişi doğrayıb yeməyin, onu dişinizlə yeyin; çünki o, mübarək və pak tərəvəzlərdəndir, dişləri təmizləyib ağardır, qəlbi pak edir və onu yemək ibadət sayılır.”

:Xurma-۲۰

Yorğunluğu və aclığı aradan aparır, qarın qurultusunu kəsir və yetmiş növ xəstəliyə şəfadır. İmam Sadiq (ə) buyurmuşdur: "Övladınızın göyçək olması üçün qadınlarınıza nifas vaxtı xurma yedizdirin." Yenə də buyurmuşdur: "Hər kəs gündə acqarına yeddi ədəd xurma yesə, Şeytan ona zərər yetirə bilməz. Yatan vaxtı yeddi ədəd xurma yemək qarındakı qurdları

aradan aparır.” İmam Əli (ə) da buyurmuşdur: “Xurma yeyin, çünki o, hər bir dərdin ”.dərmanıdır

:Xiyar-۲۱

Mizacı soyuq olan şəxslərin xiyar yeməsi məsləhət deyildir və onlara zərərlidir. Əlbəttə, onu xurma ilə yesələr, heç bir zərəri olmaz. Həzrət Peyğəmbər (s) onu duz və xurma ilə birlikdə yeyərdi. Xiyar sarılıq xəstəliyinə xeyirdir, qabığı qanı artırır, lakin çətin həzm olunur, insanın ağırlaşmasına və köpməsinə səbəb olur. Qəlbin güclənməsinə faydası vardır, ona görə də xırda xiyarı qabığı ilə birlikdə yemək onun .asanlıqla həzm edilməsinə və həyati xüsusiyyətlərin artmasına səbəb olur

:Darçın-۲۲

Onu yeməklərdə istifadə etmək faydalıdır. Şirin və ətirlidir, insanın qüvvətli olmasına səbəb olur, tez həzm olunur, bədəndəki mikrobları və qarında olan qurdları öldürür, mədə ağrısını kəsir, qəlbin və tənəffüsün hərəkətini çoxaldır, ürəyi qüvvətləndirir və .ishalı aradan aparır

:Reyhan-۲۳

Onun qoxusu milçək və ağcaqanadları qovur, dənəsini yemək zəhərlənmənin qarşısını .alır. Baş ağrısına və gicəllənməyə xeyri vardır. İshal və vəbanın mikroblarını öldürür

:Ərik-۲۴

İnsanın qüvvətli olmasına səbəb olur, onun tərkibində A və V vitaminləri vardır. Uşaqların yaxşı inkişaf etməsi üçün faydalıdır. Qan azlığının, zəifliyin, ishalın və dərinin dərmanıdır. Onun dənəsini yemək köpü aradan aparır. Kalı və yetişməmişi mədəyə .zərərlidir, mədəsində yara olan şəxslər gərək onu yeməkdən çəkinsinlər

:Zəfəran-۲۵

İmam Baqir (ə) buyurmuşdur: “Zəfəran bədən əzələlərin güclənməsinə faydalıdır və əsəb sisteminə xeyri vardır, bel ağrısını kəsir, qəm-qüssəni dəf edir, yuxusuzluğu ”.aradan aparır, tənəffüs yollarını açır və mikrobları öldürür

:Zeytun-۲۶

Qurani-kərimdə zeytun əncirlə birgə qeyd olunmuşdur. İmam Rza (ə) buyurmuşdur: “Zeytun bəlğəmi və qəm-qüssəni aradan aparıb insanın əxlaqını düzəldir.” İmam Sadiq ”.(ə) da buyurmuşdur: “Zeytun peyğəmbərlərin yeməyidir və kişinin nütfəsini çoxaldır

:Göyərti-۲۷

İmam Sadiq (ə) buyurmuşdur: “Süfrələrin zinəti göyərtidir. Öz süfrələrinizə göyərti qoymaqla və yeməklərinizi Allahın adını çəkməklə bəzəyin, çünki bu iş Şeytanın uzaq ”.olmasına səbəb olur

:Alma-۲۸

:Sarımsaq-۲۹

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Sarımsaq yeyin, lakin həmin halda məscidə getməyin.” Həmçinin buyurmuşdur: “Sarımsaq yeyin, əgər mələklə danışmasaydım, mən də sarımsaq yeyərdim.” İmam Baqir (ə) buyurmuşdur: “Biz sarımsaq yeyirik.” Sarımsağın bəzi zərərləri də vardır, o cümlədən: Görmə qabiliyyətinin azalmasına, sarılığın güclənməsinə və kişilərin sonsuz olmasına səbəb olur, uşaqlara və dəriyə zərəri vardır. Lakin bədəndəki mikrobları öldürür, bəlğəmi .azaldır, astma, vərəm və anfulanza xəstəliyinə, eləcə də göy öskürəyə çox faydalıdır

:Şəlğəm-۳۰

Arıqlamaq üçün xeyirlidir, sinənin, zökamın və qara ciyərin dərmanıdır. Şəlğəmin suyu .böyrəkdə yaranan daşların əriməsi üçün faydalıdır

:Süd-۳۱

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Heç bir yeməli və içməli şey südün yerini verə bilməz.” Onun tərkibində A, V, S, D, E və s. vitaminləri vardır. İnək südünün sinəyə və soyuq mizaclı insalara xeyri vardır, qanın artmasına səbəb olur. O, təklikdə .kamil bir yeməkdir. Zəhərlənmənin qarşısını alır və əzələləri qüvvətləndirir

:Bal-۳۲

Bal orqanizmin bütün ehtiyaclarını ödəyən bir yeməkdir, onun tərkibində V۱, V۲, E və S vitaminləri vardır, ishalın kəsilməsi üçün faydalıdır və onda şəfa vardır. Həzrət .Peyğəmbər (s)-in baldan xoşu gəlir və ondan istifadə edirdi

:Mərci-۳۳

Mərci bərəkətlidir, qəlbi rəhmli edir və gözün yaşını çoxaldır. O, qəlbin qəsavətini aradan aparır, ürək döyüntüsünü kəsir və təzyiqi aşağı salır. Onun tərkibində dəmir, .mineral maddələr, V۱ və V۲ vitaminləri vardır

:Kahı-۳۴

İnsanın yuxulamasına, susuzluğunun və huşsuzluğunun aradan getməsinə səbəb olur, tez həzm olur, sarılıq və cüzam xəstəliklərinə, qanın saflaşmasına, baş və döş .ağrılarına faydalıdır

:Balqabaq-۳۵

Öskürəyə, sinə və boğaz ağrılarına faydalıdır, ağlı artırır, üzü nurani və gözəl edir. .Həzrət Peyğəmbər (s) kədu yeməyi sevirdi

:Qoz-۳۶

Uşaqların orqanizmi üçün ehtiyac duyulan şeylər qozun tərkibində mövcuddur, əgər pendirlə birgə yeyilsə, faydası daha çox olar. Şəkər xəstəliyinə tutulanlar və əqli fəaliyyətlərlə məşğul olanlara xeyirlidir. Onun tərkibində A, V۱, V۲, V۶ vitaminləri mövcuddur. Yeməyi yaxşı həzm edə bilməyənlərə və bağırsaq xəstəliyinə tutulanlara zərəri vardır. İmam Sadiq (ə) buyurmuşdur: "Qoz və pendirin hər ikisi birlikdə dərmandır, əgər bir-birindən ayrılsalar (ayrı-ayrılıqda yeyildikdə), hər biri xəstəliyə ".səbəb olar

:Armud-۳۷

Revmatizm xəstəliklərinə, oynaq ağrılarına və bağırsaqlara faydalıdır. Onun tərkibində

A, V, S, R vitaminləri, kalsium və mineral maddələr vardır. Əsəbləri sakitləşdirir, .təzyiqin qarşısını alır, qanı təmizləyir, böyrəklərin yaxşı işləməsinə səbəb olur

:Banan-۳۸

İnsanın qüvvətli və yeməyin yaxşı həzm olmasına səbəb olur. Bir ədəd banan bir dana ciyərinə bərabərdir. Ürək və böyrək xəstəliklərinə xeyri vardır, insanı qan azlığından .xilas edir. Əlbəttə, qaralmış bananı yemək olmaz

:Şaftalı-۳۹

Onun tərkibində A, V۱, V۲, R, S vitaminləri və kalsium kimi maddələr vardır. Bədənə tez yayılır, təzə dərilmişini gözəlliyi qoruyub saxlamaq üçün üzə sürtmək faydalıdır, ağızın .qoxusunu, susuzluğu aradan aparır və sarılıq xəstəliyinə xeyirlidir

:Qarpız-۴۰

Yorğunluğu aradan aparır, qanı duruldur. Onun yeməklə birgə yeyilməsi məsləhət görülür, əks təqdirdə həzm prosesinə çətinlik yarada bilər. Dənəsi qarında qurdun .əmələ gəlməsinin qarşısını alır

## QONAQPƏRVƏRLİK

.Peyğəmbərlərin bəyənilən sifətlərindən biri qonaqpərvərlik idi-١

Bəzi peyğəmbərlər gecə vaxtı evində qonağı olmasaydı, yemək yeməzdi. Buna-٢
.həzrət İbrahim (ə)-ı misal göstərmək olar

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Müsəlman qardaşınızın (yeməyə)-٣
”.dəvətini qəbul edin; çünki bu, imanın bir hissəsidir

İmam Sadiq (ə) buyurmuşdur: “Möminin mömin qardaşının üzərindəki-٤
”.hüquqlarından biri də onun dəvətini qəbul etməkdir

İmam Sadiq (ə) buyurmuşdur: “Həzrət Peyğəmbər (s)-in xanım Zəhra (ə)-a öyrətdiyi-٥
”.şeylərdən biri də qiyamət gününə imanı olan şəxsin dəvətini əziz tutması idi

İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs bir müsəlmanı doyuzdursa, qiyamət-٦
”.günündə onun savabının nə qədər olacağını Allah-taaladan başqa heç kəs bilməz

İmam Sadiq (ə) buyurmuşdur: “Qonağa doyunca təam vermək günahların-٧
”.bağışlanmasına səbəb olur

Həzrət Peyğəmbər (s)-in imam Əli (ə)-a vəsiyyətlərindən biri də bu idi: “Sənə-٨
qonşularınla yaxşı rəftar etməyi, qonaqları əzizləməyi və onlara təam verməyi
”.vəsiyyət edirəm

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Qonaq getməyən evə mələk də-٩
”.getməz

İmam Əli (ə) buyurmuşdur: “Qonağı sevən hər bir şəxsin çöhrəsi qiyamət günündə-١٠
”.on dörd gecəlik ay kimi parlayar

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Allah-taala bəndəsinin xeyrini-١١
istədikdə, ona bir hədiyyə göndərər.” Səhabələr: “o hədiyyə nədir?” – deyə
soruşduqda, Həzrət buyurdu: “Özü ilə yeməyini gətirən və ev sahibinin günahlarını özü
”!ilə aparan (bağışlanmasına səbəb olan) qonaq

۱۲- İmam Əli (ə) buyurmuşdur: “Qonağın ayaq səsini eşidib, gəlişinə görə xoşhal olan elə bir mömin yoxdur ki, günahları bağışlanmasın.”

۱۳- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs yeməyini qonaqla birgə yesə, Allah ilə onun arasında olan bütün zülmət pərdələri aradan qalxar.”

۱۴- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Qonaq behiştə yol göstərəndir.”

۱۵- İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs Allahı tanıyan üç şəxsə yemək versə, Allah-taala ona üç behiştdən – Firdovsi-əla, Ədn və Tuba cənnətlərindən – yemək verər.”

۱۶- İmam Baqir (ə) buyurmuşdur: “Hər kəs dörd müsəlmana yemək versə, sanki İsmail (ə)-ın dörd övladını əsirlikdən azad etmişdir.”

۱۷- İmam Sadiq (ə) buyurmuşdur: “İmanın əlamətlərindən biri də qonaqlıq vermək və yaxşı əxlaqa malik olmaqdır.”

۱۸- Bir şəxs imam Baqir (ə)-ın hüzuruna gəlib soruşdu: “Hansı əməlin savabı bir qulu azad etməklə bərabərdir?!” O həzrət buyurdu: “Mömin şəxsə yemək vermək.”

۱۹- İmam Sadiq (ə) buyurmuşdur: “Mənim yanımda möminə yemək verməyim, onun görüşünə getməyimdən yaxşıdır; və onun görüşünə getməyim də, on qulu azad etməyimdən yaxşıdır.”

səh:۶۸

İmam Sadiq (ə) buyurmuşdur: “Allah-taala Onun (razılığı) yolunda yemək-۲۰ verilməsini, eləcə də yemək verən şəxsi çox sevir, xeyir-bərəkəti onun evinə öz ”.yuvasına ucan quşdan da tez göndərir

Ev sahibinin əxlaqi vəzifələrindən biri qonaqdan qabaq yeməyə başlayıb, ondan-۲۱ .sonra yeməyi qurtarmasıdır

İmam Sadiq (ə) buyurmuşdur: “Mömin qardaşın qonaq gəldikdə, evində olan-۲۲ yeməkdən gətir (yesin), lakin onu qonaq çağırmısansa, gücün çatan qədər onun ”.qulluğunda durmalısan

İmam Sadiq (ə) buyurmuşdur: “Əgər bir kəs pulunun yüz dirhəmini möminə təam-۲۳ ”.vermək üçün sərf etsə, israf etməmişdir

İmam Sadiq (ə) buyurmuşdur: “Evinə bir qonaq gəldikdə, onun yemək yeyib--۲۴ yeməməsini soruşma, hər nəyin varsa, gətir (yesin). Çünki olanını (qonağın yanına) ”.gətirən şəxs comərd və gözəl xasiyyətlidir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Qonağın ev sahibi üzərində olan-۲۵ haqqı (qonaq) evdən çıxana qədər onunla birlikdə getməsidir (yəni qonağı yola ”.(salmasıdır

Ailə-uşaqlarının yeməyini tədarük görə bilməyən şəxs gərək bir kəsi qonaq dəvət-۲۶ etməsin. Çünki qonaqlıq vermək müstəhəb, ailə-uşaqları dolandırmaq isə vacibdir. Heç .bir müsəlman müstəhəb əmələ görə vacib əməli tərk etməməlidir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Allah-taala, öz dini qardaşının sevdiyi-۲۷ ”.yeməyi hazırlayan şəxsin günahlarını bağışlayıb, onu sevindirər

.Qonaqdan qabaq yatmayın-۲۸

.Onun qarşısında öz çətinliklərinizdən və problemlərinizdən danışmayın-۲۹

.Onun söhbətlərinin arasında (sözünü kəsib) danışmayın-۳۰

.Onun qarşısında ailənizə qəzəblənməyin-۳۱

.Özünüzün şad və sevinc içində olduğunuzu göstərin-۳۲

.O gedəndə özünüzün qəmgin və narahat olduğunuzu bildirin-۳۳

Bir kişi imam Əli (ə)-ı qonaq dəvət etdikdə, o həzrət buyurdu: "Üç şərtlə sizə qonaq-۳۴ gələrəm: Bazardan bir şey almayasan, evdə olan yeməklərdən gətirəsən və öz ailənə ".çətinlik yaratmayasan

.Bir möminin evinə daxil olduqda, ev sahibinin təklif etdiyi yerdə əyləşin-۳۵

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Əgər sizi bir qonaqlığa dəvət-۳۶ ediblərsə, övladlarınızı özünüzlə ora aparmayın. Əgər kimsə belə bir iş tutarsa, haram ".yemiş və o məclisə günahkar daxil olmuş olar

İmam Sadiq (ə) buyurmuşdur: "Qonaqlığa (təkcə) dəvət olunsanız, övladınızı-۳۷ özünüzlə ora aparmayın; çünki bu, günahdır və övladınızın da (o qonaqlıqda) yemək ".yeməsi haram sayılır

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Allaha xatir sevdiyin şəxsi qonaqlığa-۳۸ ".dəvət et

İmam Sadiq (ə) buyurmuşdur: "Möminin günahın qarşısını ala bilmədiyi halda günah-۳۹ ".Məclisində iştirak etməsi layiq deyildir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Möminlərə ehsan və qonaqlıq-۴۰ vermək beş yerdə sünnədir: ۱-Toy Məclisində. ۲-Həcdən qayıdanda. ۳-Övlad dünyaya ".gələndə. ۴-Sünnət toyunda. ۵-Ev alanda

səh:۶۹

## DİL – SUSMAQ VƏ DANIŞMAQ

İmam Sadiq (ə) sükut haqqında belə buyurmuşdur:

۱-“Sükut həqiqət əhlinin məsləki, dünyanın sabit və dönməz həqiqətlərinə bəsirət gözü ilə baxanların şüarıdır.

۲-Sükut hər növ rahatlığın açarı, dünya və axirətin asayişidir.

۳-Sükut Allahın razılığına səbəb olur.

۴-Sükut qiyamət günü haqq-hesabın yüngül olmasına səbəb olur.

۵-Sükut xatalardan və uçurumlardan qorunmaq vasitəsidir.

۶-Sükut nəfsani qüvvələri boğmaq üçün vasitədir.

۷-Sükut nəfsin rahatlığı üçün vasitədir.

۸-Sükut Allaha edilən ibadət və münacatların ləzzətini dərk etmək üçün vasitədir.

۹-Sükut qəlbi sərtlikdən təmizləyir.

۱۰-Sükut həya və təqva qazanmaq üçün vasitədir.

۱۱-Sükut təfəkkürün, ağlın və mürüvvətin artmasına səbəbdir.

۱۲-Sükut vasitəsilə insan düşüncəli və gözüaçıq olur.”(۱)

۱۳-İmam Əli (ə) buyurmuşdur: “İnsanın yerinə yetirdiyi ibadət və itaətlərin arasında ən asanı, eyni zamanda Allah dərgahında ən qiymətlisi söz (dil) ilə yerinə yetirilən ibadətdir.”(۲)

۱۴-İmam Əli (ə) buyurmuşdur: “Tanınmaq istəyirsinizsə, danışın; çünki insan öz dili altında gizlənmişdir.”(۳)

۱۵-İmam Əli (ə) buyurmuşdur: “İnsanın batini dili altında gizlənmişdir.”(۴)

۱۶-İmam Sadiq (ə) həzrət Peyğəmbəri-Əkrəm (s)-in belə buyurduğunu nəql etmişdir:

“Allah-taala bədən üzvlərindən ən çox dilə əzab verər. Dil deyər ki, İlahi, nə üçün hər bir şeydən çox mənə əzab verdin. Ona deyilər ki, sənin dediyin bir söz yerin şərqini və qərbini bürüdü, onunla nahaq qanlar töküldü, məzlumların malı qəsb olundu və camaatın namusuna ləkə yaxıldı. And olsun izzət və cəlalıma, bədən üzvlərindən heç birinə layiq görmədiyim əzabla səni cəzalandıracağam.”(۵)

۱۷- İmam Sadiq (ə) buyurmuşdur: “Mömin şəxsə sakit olduğu vaxta qədər savab yazılar. Danışmağa gəldikdə isə, ya savab, ya da günah yazılar.”(۶)

۱۸- Həzrət Əli (ə) oğlu imam Həsən (ə)-a belə vəsiyyət etmişdir: “Susmaq peşmançılıqdan amanda qalmaqdır, susmaqla itirdiyin mənfəəti ələ gətirmək, danışmaqla itirdiyin faydalırı ələ gətirməkdən asandır.”(۷)

۱۹- Osman ibni İsa deyir ki, imam Rza (ə)-ın hüzurunda idim, gördüm ki, bir kişi Həzrətdən ona tövsiyə etməsini istədi. Həzrət buyurdu: “Dilini qorusan izzətli olarsan, öz ixtiyarını insanlara vermə, yoxsa özünü zillətə salarsan.”(۸)

۲۰- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Dilin fitnə-fəsadı qılınc zərbəsinin yaratdığı fəsaddan daha kəskindir.”(۹)

۲۱- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “İnsanın qəlbi düzəlməsə, imanı düzəlməz və dili düzəlməsə, qəlbi düzəlməz.”(۱۰)

۲۲- İmam Sadiq (ə) buyurmuşdur: “Susmaq dünya və axirətdəki rahatlığın açarıdır.”(۱۱)

۲۳- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Möminin nicatı dilini qorumaqdadır.”(۱۲)

۲۴- Loğman öz övladına buyurdu: “Ey övladım! Çox vaxt mən danışdığıma görə peşman olmuşam, lakin sükut etdiyim üçün təəssüflənməmişəm.”(۱۳)

۲۵- İmam Əli (ə) buyurmuşdur: “Möminin dili qəlbinin arxasında, münafiqin qəlbi isə dilinin arxasında olar. Mömin danışmazdan əvvəl fikirləşər, əgər xeyir olsa, dilinə gətirər, əgər şər olsa, onu aşkar etməz. Münafiq isə dilinə gələni deyər, xeyir-şərini fikirləşməz.”(۱۴)

---

۱- [۲۷۷] Ayətullah Məhdəvi Kəninin “Əxlaqi-əməli” kitabından iqtibas edilmişdir.

۲- [۲۷۸] “Misbahuş-şəriə”, ۴۶-cı fəsil.

۳- [۲۷۹] “Nəhcül-bəlağə”, “qısa sözlər”: ۳۹۲.

۴- [۲۸۰] “Nəhcül-bəlağə”, “qısa sözlər”: ۳۸۴.

۵- [۲۸۱] “Üsuli-kafi”, ۲-ci cild, səh. ۱۱۹, hədis: ۱.

۶- [۲۸۲] Yenə orada, səh. ۱۱۳, hədis: ۴.

۷- [۲۸۳] “Müstədrəkül-vəsail”, ۲-ci cild, səh. ۸۹, hədis: ۱۲.

۸- [۲۸۴] “Üsuli-kafi”, ۲-ci cild, səh. ۱۱۳, hədis: ۴.

۹- [۲۸۵] “Biharul-ənvar”, ۷۱-ci cild, səh. ۲۸۶.

۱۰- [۲۸۶] “Nəhcül-bəlağə”, ۱۷۵-ci xütbə.

۱۱- [۲۸۷] “Müstədrəkül-vəsail”, ۲-ci cild, səh. ۸۹, hədis: ۱۶.

۱۲- [۲۸۸] Yenə orada.

۱۳- [۲۸۹] “Əl-məhasinu vəl-musavi”, Beyhəqi, ۱-ci cild, səh. ۱۶۶.

۱۴- [۲۹۰] “Nəhcül-bəlağə”, (Sübhi Saleh), səh. ۴۷۶.

İmam Rza (ə) buyurmuşdur: “Helm və susmaq düşüncənin əlamətlərindəndir.-۲۶ Həqiqətən, susmaq hikmətin qapılarındandır, məhəbbəti cəzb edir və xeyir işlərin (kökündür.”(۱

İmam Əli (ə) buyurmuşdur: “Sözü nə qədər ki, deməmisən, o sənin ixtiyarındadır,-۲۷ elə ki, danışdın, sən onun ixtiyarında olursan. Buna görə də dilini qızıl-gümüşün kimi qoruyub saxla. Çünki çoxlarının bir kəlmə yersiz danışması böyük bir neməti əlindən (alıb, onun başına dərd-bəla gətirmişdir.”(۲

İmam Sadiq (ə) buyurmuşdur: “Elə bir gün yoxdur ki, bədən üzvləri dilə şikayət edib-۲۸ (deməsinlər: Səni Allaha and veririk, sənə görə əzab çəkməyək.”(۳

İmam Sadiq (ə) buyurur: Loğman öz övladına buyurdu: “Əziz oğlum! Danışmaq-۲۹ ”.gümüşdürsə, danışmamaq qızıldır

İmam Baqir (ə) buyurmuşdur: “İnsan dilini nəzarət altında saxlamasa, günahdan-۳۰ (amanda qala bilməz.”(۴

Bir kişi həzrət Peyğəmbəri-Əkrəm (s)-in yanına gəlib, o həzrətdən tövsiyə etməyi-۳۱ xahiş etdi. Həzrət buyurdu: “Dilini saxla, vay olsun sənə, insanların cəhənnəmi (qazanmaqda dillərindən başqa bir şey varmı?!”(۵

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Möminin nicatı dilini-۳۲ (qorumasındadır.”(۶

İmam Sadiq (ə) buyurmuşdur: “Ey şiələr, bizim üçün zinət olun, rüsvayçılıq səbəbi-۳۳ olmayın Camaatla yaxşı davranın, onu yersiz danışmaqdan və nalayiq sözlərdən ”.qoruyun

”.İmam Sadiq (ə) buyurmuşdur: “Allah-taala söyüş verən şəxslə düşməndir-۳۴

İmam Sadiq (ə) buyurmuşdur: “Pis danışmaq sərtlikdəndir və sərt adamın yeri-۳۵ ”.cəhənnəmdir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Söyüş verən və boş-boş danışan-۳۶ ”.adamı özünə yoldaş seçən şəxs Allahın ən pis bəndələri zümrəsindən sayılır

۳۷- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Söyüş vermək, nalayiq sözlər demək və boş-boş danışmaq münafiqlik sifətlərindəndir.”

۳۸- İmam Sadiq (ə) buyurmuşdur: “Dili düz olan şəxsin əxlaqı da pak olar.”

۳۹- İmam Sadiq (ə) buyurmuşdur: “Düz danışan adamı təsdiq edən ilk şəxs Allahdır.”

۴۰- İmam Səccad (ə)-dan danışmaq və susmağın hansı birinin ən fəzilətli olduğu barəsində soruşduqda, o həzrət buyurdu: “Onların hər ikisinin özünəməxsus bəlası var. Əgər hər ikisinin eyblərini götürsək, danışmaq susmaqdan fəzilətlidir.” Soruşdular ki, bu necə ola bilər? Həzrət cavab verib buyurdu: “Çünki Allah-taala peyğəmbərləri susmaq üçün deyil, danışmaq üçün göndərmişdir. Susmaqla cənnəti və Allahın vilayətini almaq olmaz. İnsanları sükutla cəhənnəmdən qorxuza bilməzsən. Allahın qəzəbindən sükutla (duaya işarə edir) qurtarmaq olmaz.”(۷)



---

۱- [۲۹۱] “Üsuli-kafi”, ۲-ci cild, səh. ۱۱۶, hədis: ۲۱.
۲- [۲۹۲] “Nəhcül-bəlağə”, “qısa sözlər”: ۳۸۱.
۳- [۲۹۳] “Vəsailuş-şiə”, ۲-ci cild, səh. ۲۶۶, hədis: ۱۰.
۴- [۲۹۴] “Biharul-ənvar”, ۷۸-ci cild, səh. ۱۷۸.
۵- [۲۹۵] “Üsuli-kafi”, ۱-ci cild, səh. ۱۱۵, hədis: ۱۴.
۶- [۲۹۶] Yenə orada, ۲-ci cild, səh. ۱۱۴.
۷- [۲۹۷] “Vəsailuş-şiə”, ۲-ci cild, səh. ۲۵۵, hədis: ۲.

## ZİKR VƏ ALLAHI YAD ETMƏK

١-Zikr etmək peyğəmbərlərin sifətlərindən idi.

٢-İmam Sadiq (ə) buyurmuşdur: "Subhanəllah demək insanın əməl tərəzisinin yarısını, "Əlhəmdu lillah" onu bütünlüklə, "Allahu-əkbər" isə yerlə göyun arasını doldurar."(١)

٣-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Ölüm mələyi (Əzrail) hər gecə nida edib deyir: "Ey qəbir əhli, bu gün kimə və nə üçün qibtə edirsiniz? Artıq axirət işini aşkar şəkildə gördünüz?!" Ölülər cavabında deyərlər: "Biz möminlərə qibtə edirik. Onlar Ramazan ayında oruc tuturlar, biz tutmuruq, onlar sədəqə verir, biz vermirik. Onlar Allahı çox yad edir, biz isə yad etmirik. əfsuslar olsun dünya evində bizim əldən verdiklərimizə!"(٢)

٤-Zikr etmək Allah-taalanı yad edib, Onun sifətləri haqqında fikirləşməkdir.

٥-İmam Sadiq (ə) buyurmuşdur: "Həqiqətən Allaha zikr edən şəxs mütidir."

٦-İmam Baqir (ə) buyurmuşdur: "Allaha zikr etməklə məşğul olan mömin şəxs durduğu, oturduğu və uzandığı halda olsa da belə, daim namaz halındadır."

٧-İmam Baqir (ə) buyurmuşdur: "Kəlmeyi-şəhadətdən sonra "La ilahə illəllah" zikrini deməkdən üstün bir savab yoxdur."(٣)

٨-Allahdan uzaq düşməkdən qəmli bir ayrılıq yoxdur, belə isə həmişə qəlbinizi Allahı yad etməklə məşğul edin.

٩-Allah-taala həmişə zikr halında olan şəxsə hikmət vermişdir. Çünki hikmət kökü qəlbdə, meyvəsi isə dildə olan bir ağaca bənzəyir.

١٠-Allahı yad etmək insan ruhunu təmizləyir.

١١-Zikr etmək Allahla ünsiyyətdə olmağın rəmzi və açarıdır.

١٢-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Ən yaxşı ibadət "La ilahə illəllah" deməkdir."(٤)

İmam Sadiq (ə) buyurur: Peyğəmbər (s) buyurmuşdur: “Hər kəs Allahı çox yad etsə-۱۳ Allah onu sevər və onun üçün iki qurtuluş yazılar; biri atəşdən, digəri də nifaqdan (münafiq olmaqdan) qurtuluş.”(۵)

Rəvayətə əsasən, hər bir şeyin dərmanı vardır, günahların da dərmanı tövbə və-۱۴ .istiğfar edib Allahdan bağışlanmaq diləməkdir

”.Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ən yaxşı tövbə zikr etməkdir-۱۵

”.Allah-taala Musa (ə)-a buyurdu: “Hər halda Məni yad etmək yaxşı əməllərdəndir-۱۶

İmam Sadiq (ə) buyurur: “Allah-taala buyurmuşdur: “Hər kəs bir dəstə adam-۱۷ ”.arasında Məni yad etsə, Mən də onu bir dəstə mələklər arasında yad edərəm

İmam Sadiq (ə) buyurmuşdur: “Bizim şiələrimiz tək-tənha olduqları zaman Allahı-۱۸ ”.çox yad edənlərdir

İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs Allahı çox yad etsə, Allah-taala Öz-۱۹ ”.rəhmətini ona şamil edər

İmam Sadiq (ə) buyurur: “Allah-taala buyurmuşdur: “Hər kəs Məni yad etmək-۲۰ məqsədilə Məndən bir şey istəməyi yaddan çıxarsa, ona istədiyindən yaxşısını əta ”.edərəm

İmam Sadiq (ə) buyurur: “Allah-taala buyurmuşdur: “Hər kəs Məni xəlvətdə yad-۲۱ ”.etsə, Mən onu aşkarda yad edərəm

.Ən yaxşı zikrlərdən biri də namazdır-۲۲

İmam Sadiq (ə) buyurmuşdur: “Nemətə şükür etmək haramlardan çəkinməkdir və-۲۳ ”.bütün şükürlər “Əl-həmdu lillahi Rəbbil-aləmin” deməkdədir

İmam Sadiq (ə) buyurmuşdur: “Hər bir məclisdə əyləşənlər Allahı yad etməyib,-۲۴ Peyğəmbərə salavat göndərməsələr, qiyamət günündə həmin məclis onlar üçün həsrət və qəm-qüssəyə çevriləcək.”(۶)

۱- [۲۹۸] “Üsuli-kafi”, ۲-ci cild, səh. ۵۰۶.

۲- [۲۹۹] “İrşadul-qülub”, səh. ۵۳۶.

۳- [۳۰۰] “Üsuli-kafi”, ۲-ci cild, səh. ۵۱۶, hədis: ۱.

۴- [۳۰۱] Yenə orada, səh. ۵۱۷, hədis: ۲.

۵- [۳۰۲] Yenə orada, səh. səh. ۵۰۰, hədis: ۴.

۶- [۳۰۳] “Üsuli-kafi”, ۲-ci cild, səh. ۴۹۸. hədis: ۵.

۲۵- İmam Baqir (ə) buyurmuşdur: “Bizi yad etmək Allahı yad etmək və düşmənlərimizi yad etmək Şeytanı yad etməkdir.”

۲۶- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Məclislərinizi Əhli-beyti yad edib onların fəzilətlərini danışmaqla zinətləndirin; çünki bu işdə Peyğəmbərin qırx xisləti vardır.”

۲۷- İmam Sadiq (ə) buyurmuşdur: “Qəlb Allahın həramidir, Allahın həraminə Allahdan qeyrisinə yol verməyin.”

۲۸- İmam Sadiq (ə) buyurmuşdur: “Hər kəs “La hovlə və la quvvətə illa billah” deyərsə, Allah-taala mələklərə buyurar: “Bəndəm mənə təslim olmuşdur, onun hacətini rəva edin.”(۱)

۲۹- Hədislərdə buyurulur ki: “Bizim şiələrimiz xəlvətdə olarkən Allahı çox zikr edərlər.”(۲)

۳۰- İmam Əli (ə)-ın imam Hüseyn (ə)-a etdiyi vəsiyyətdə buyurulur: “Hər bir halda Allahı yad et.”

۳۱- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Allaha itaət edən şəxs Allahı yad etmişdir.”

۳۲- Rəbbinin adını həmişə yad et, üzünü yalnız Ona tərəf tut!

۳۳- Agah olun, qəlblər yalnız Allahı yad etməklə aramlaşar.

۳۴- Allahdan üz çevirən şəxsin dünyada yaşayışı sıxıntılı olar.

۳۵- Allahı həmişə yad etmək ruhun qüvvətlənməsinə səbəb olar.

۳۶- Şeytan pərhizkarları vəsvəsə etmək istədikdə, onlar dərhal Allahı yad edir və bununla da nicat tapırlar.

۳۷- İmam Səccad (ə) dua edərək demişdir: “İlahi! Səni yad etmək ləzzətindən başqa hər bir ləzzətdən tövbə edirəm!”

۳۸- Allah-taala buyurur: “Məni yad edin, Mən də sizi yad edim.”

.Hər kəs Allahı çox yad etsə, Allaha qarşı məhəbbəti artar-۳۹

Zikr etməyin ən yüksək mərhələsi günahlardan çəkinməkdir və onun təsiri də-۴۰ .günahları tərk etməyə bağlıdır

## NƏZAFƏT VƏ TƏMİZLİK

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Həqiqətən Allah pakdır və pak olanları-۱ ”.da sevir

(İmam Rza (ə) buyurmuşdur: “Peyğəmbərlərin əxlaqından biri də paklıqdır.”(۳-۲

İmam Əli (ə) buyurur: “Peyğəmbər (s) saçını darayır, çox vaxtlar onu su ilə düzəldir-۳ ”.və buyururdu: Su mömini ətirli etmək üçün kifayətdir

İmam Sadiq (ə) buyurmuşdur: “Saçı daramaq ruzini artırır, hacətin qəbul olunmasına-۴ ”.səbəb olur və bəlğəmi aradan aparır

İmam Sadiq (ə) buyurmuşdur: “Peyğəmbər (s) saqqalını aşağıdan yuxarı qırx dəfə,-۵ yuxarıdan aşağı isə yeddi dəfə darayır və buyururdu: Saçı daramaq insanın ağlını ”.artırır



---

.Məhasini-Bərqi”, səh. ۴۲“ [۳۰۴] -۱
.Üsuli-kafi”, ۲-ci cild, səh. ۴۹۹, hədis: ۲“ [۳۰۵] -۲
.Töhəful-üqul”, səh. ۳۳۰“ [۳۰۶] -۳

İmam Sadiq (ə) buyurur: “Peyğəmbər (s) buyurmuşdur: Dodaqlar aşkar olunana-۶
”.qədər bığın artıqlarını qırxmaq sünnədir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Atəşpərəstlər və zərdüştilər saqqalını-۷
”.qırxır, bığını uzadırlar, biz isə bığımızı qırxıb, saqqalımızı saxlayırıq

”.İmam Sadiq (ə) buyurmuşdur: “Dırnaqları tutmaq mənim sünnəmdir-۸

Dırnaqları cümə axşamı, yaxud cümə günü tutmaq, eləcə də onları tutanda sol əlin
.kiçik barmağından başlayıb, sağ əlin kiçik barmağında qurtarmaq müsətəhəbdir

İmam Sadiq (ə) buyurmuşdur: “Hər on beş gündən bir bədəndəkin artıq tükləri-۹
”.qırxmaq sünnədir

İmam Sadiq (ə) buyurmuşdur: “Üç əməl peyğəmbərlərin əxlaqından sayılır: Ətir-۱۰
”.vurmaq, başın tükünü ülgüclə qırxmaq, bədənin tüklərini nurə ilə təmizləmək

İmam Sadiq (ə) buyurmuşdur: “Peyğəmbər (s)-in ətirə verdiyi pul yeməyə-۱۱
(.(meyvəyə) xərclədiyi puldan çox idi.” (O həzrətin istifadə etdiyi ətir müşk idi

İmam Əli (ə) buyurmuşdur: “Peyğəmbər (s) (hədiyyə olunan) ətir və halvanı geri-۱۲
”.qaytarmırdı

Peyğəmbər (s) saçlarına yağ sürtməyi sevir və buyururdu: “Saça yağ sürtmək qəm--۱۳
”.qüssəni aradan aparır

.Peyğəmbər (s)-in başı ağrıyanda qaşlarına və bığına yağ sürtərdi-۱۴

Peyğəmbər (s) yeddi şeyi torpağa basdırmağı göstəriş vermişdir: “۱-Tükü. ۲--۱۵
Dırnağı. ۳-Heyz qanına bulaşmış parcanı. ۴-cifti. ۵-Dişi. ۶-Qanı. ۷-Ələqəni (rüşeymin siqt
(olduğu zaman qadından gələn qanı).”(۱)

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurur: Cəbrail mənə dedi: “Bir gündən bir özünə-۱۶
”.ətir vur, cümə günü isə ətir vurmağı tərk etmə

İmam Kazım (ə) buyurmuşdur: “Bədənin on yerində təmizlik etmək lazımdır: Onun-۱۷

:beşi başa, beşi də bədənə aiddir

a) Baş hissəyə aid olan təmizlik: ۱-Dişləri fırça ilə yumaq. ۲-Bığın uclarını qısaltmaq. ۳-Saçı yumaq. ۴-Məzməzə (ağıza su alıb qar-qara) etmək. ۵-İstinşaq etmək (buruna su .(alıb silmək

b) Bədənə aid olan təmizlik: ۱-Sünnət etmək. ۲-Qarının aşağıdakı tükləri qırxmaq. ۳-".Qolutuqda bitən tükləri qırxmaq. ۴-Dırnaqları tutmaq. ۵-İstibra etmək

İmam Sadiq (ə) buyurmuşdur: "Dişləri fırça ilə yumaq sünnədir və onun on bir-۱۸ :xüsusiyyəti vardır

.a) Ağzı təmizləyir

.b) Gözü işıqlandırır və ona nur verir

.v) Allahın razılığına səbəb olur

.q) Dişləri ağardır

.d) Ağızın pis qoxusunu aparır

.s) Dişlərin ətini möhkəmlədir

.h) İştahanı artırır

.x) Bəlğəmi aradan aparır

.ç) Zehni gücləndirir

.p) Savabları ikiqat artırır

".r) Mələklərin xoşhal olmasına səbəb olur

Peyğəmbər (s) səfərə gedəndə, həmişə beş şeyi özü ilə aparardı: ۱-Güzgü. ۲--۱۹ .Sürmə. ۳-Misvak. ۴-Daraq. ۵-(Namaz qılmaq üçün) Səccadə

.Ayaq yoluna gedəndə başı örtmək və istibra etmək müstəhəbdir-۲۱

İmam Kazim (ə) buyurmuşdur: “Cümə günündə başı sidrlə qarışmış su ilə yumaq-۲۲ sünnədir; bu, ruzini artırır, bədənin tükünü və dərisini gözəlləşdirir və baş ağrısının ”.qarşısını alır

İmam Sadiq (ə) buyurmuşdur: “Həcamət etmək (bədəndən qan almaq), bədənin-۲۳ tüklərini nurə ilə təmizləmək, (asqırmaq məqsədilə) burunotu iyləmək peyğəmbərlərin ”.dərmanı idi



---

.Xisal”, ۲-ci cild, səh. ۴, hədis: ۱“ [۳۰۷] -۱

İmam Əli (ə) buyurmuşdur: “Dişləri fırça ilə yumaq sünnədir, bu, Allahın razılığına-۲۴
”.səbəb olur və ağzı xoş iyli edir

Həzrət Peyğəmbər (s) hər namaz üçün dəstəmaz alıb buyururdu: “Dəstəmaz-۲۵
”.nurdur, dəstəmazın üstündən dəstəmaz almaq nur üstündən əlavə nurdur

İmam Əli (ə) bayramlarda qusl etməyi Peyğəmbər (s)-in sünnəsinə əməl etmək və-۲۶
.hacətlərin qəbul olunması üçün paklıq vəsiləsi hesab edirdi

Həzrət Peyğəmbər (s) mübarək Ramazan ayının axırlarında etikaf saxladığı-۲۷
.günlərdə hər gecə şam və işa namazları arasında qusl verirdi

İmam Əli (ə) həzrət Peyğəmbər (s)-in belə buyurduğunu nəql etmişdir: “Qusl-۲۸
verəndə Cəbrail mənə barmağımda olan üzüyü hərəkət etdirməyi və göbəyimin içini
”.yumağı göstəriş verdi

İmam Əli (ə) buyurmuşdur: “Evlərin ən yaxşısı hamamdır; çünki orada cəhənnəm-۲۹
”.odu insanın yadına düşür və bədəni pak-pakizə olur

.Hər kəs bədəni örtülü halda hamama daxil olsa, Allah-taala onu öz örtüyü ilə örtər-۳۰

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ey Aişə! Paltarları yu; çünki paltar-۳۱
”.Allaha zikr deyir və çirkli olduqda, artıq zikr demir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Paltarlarınızı yuyun, bədənizdəki-۳۲
artıq tükləri təmizləyin, dişlərinizi fırça ilə yuyun, paklıq və nəzafətə riayət edin. Çünki
Bəni İsrail qövmünün kişiləri çirkli qiyafədə yaşayırdılar. Bu səbəbdən də onların
(arvadları ismət paltarlarını yırtıb zina edirdilər.”(۱

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Dişləri fırça ilə yumaq dəstəmazın bir-۳۳
”.hissəsi, dəstəmaz da imanın bir hissəsidir

”.İmam Sadiq (ə) buyurmuşdur: “Ətirə nə qədər pul xərcləsəniz də, israf sayılmır-۳۴

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Həqiqətən, Allah-taala ibadət edən-۳۵
”.pak insanı çox sevir

İmam Əli (ə) buyurmuşdur: “Başqalarının əziyyətə düşməsinə səbəb olan bədən-۳۶
”.qoxusunu su ilə yuyub pak edin

”.Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Allahın ən pis bəndəsi çirkli şəxsdir-۳۷

İmam Əli (ə) buyurmuşdur: “Təmiz paltar qəm-qüssəni aradan aparır və namazın-۳۸
”.pak halda qılınmasına səbəb olur

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Cəbrail mənə misvak vurmaq-۳۹
”.haqqında o qədər tövsiyə etdi ki, onun vacib olmasını güman etdim

İmam Sadiq (ə) dua edərək demişdir: “İlahi! Çirkinlikləri və aludəlikləri məndən uzaq-۴۰
”.et, bədənimi və qəlbimi pak-pakizə qərar ver

səh:۷۵

---

.Nəhcül-fəsahə”, səh. ۷۲“ [۳۰۸] -۱

## HARAMLARDAN VƏ GÜNAHDAN ÇƏKİNMƏK

۱-İmam Əli (ə) buyurmuşdur: “Ən pis günah onu kiçik saymaqdır.”

۲-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Xata və günahın kiçikliyinə deyil, kimin qarşısında etdiyinə bax!”(۱)

۳-İmam Əli (ə) buyurmuşdur: “Əgər günahını böyük sayırsansa, demək Allahı əzəmətli tanıyırsan; günahını kiçik və əhəmiyyətsiz saydığın zaman, Allahı da kiçik bilmiş olursan.”

۴-İmam Sadiq (ə) Müfəzzəl ibni Ömərə buyurdu: “Həqiqətən, təqva ilə olan az əməl, təqvasız olan çox əməldən daha yaxşıdır.”

۵-İmam Əli (ə) Osman ibni Hənifə yazıb bildirdi: “...Sənə halal olması məlum olmayanları dilinə vurma!...”

۶-İmam Baqir (ə) Əbu Bəsirə buyurdu: “Qarnı və daməni (cinsiyyət üzvünü) haramlardan qoruyub saxlamaqdan da üstün bir əməl varmı?!” Başqa bir hədisdə isə belə buyurmuşdur: “Allah-taalanın yanında qarnı və daməni (cinsiyyət üzvünü) haramlardan qoruyub saxlamaqdan da fəzilətli bir ibadət yoxdur.”

۷-İmam Sadiq (ə) buyurmuşdur: “Təqva ilə birgə olmayan heç bir çalışmanın faydası yoxdur.”

۸-İmam Baqir (ə) buyurmuşdur: “İbadətlərin ən çətini pərhizkarlıqdır.”

۹-İmam Sadiq (ə) şiələrinin birinə belə məktub yazdı: “Əgər aqibətinin yaxşılıqla sona yetməsini istəyirsənsə, ən yaxşı əmələ məşğul olduğun halda, bu dünyadan üz döndər və böyük Allahın haqqını əda et! Məbada, Allahın nemətlərinə qarşı tüğyançılıq və əmri ilə müxalifət edəsən, Onun helm və səbrinə qürurlanasan!”

۱۰-İmam Baqir (ə) buyurur: Əli (ə)-ın kitabında yazılmışdır ki, Peyğəmbəri-Əkrəm (s) buyurur: “Zina əməli çoxalan zaman qəfil ölümlər artar, tərəzidə əskik çəkilərsə, Allah onları qəhətlik və bahaçılığa düçar edər. Əgər zəkat verməkdən imtina etsələr yer öz bərəkitini, əkin, meyvə və mədənlərini çəkər. İlahi hökmlərdə ədalətsizlik etsələr

zülmə və düşmənçiliyə kömək etmiş olarlar. Əgər əhd-peymanlarını pozsalar, Allah onlara öz düşmənlərini hakim edər. Qohumluq əlaqələrini kəssələr, mal-dövlətləri şər adamlara qismət olar. Yaxşılığa əmr edib pisliklərdən çəkindirməsələr və mənim Əhli-beytimdən olan şərəfli insanlara (imamlara) tabe olmasalar, Allah onlara ən pis adamı hakim edər. Belə bir zamanda o ümmətin yaxşı insanlarının duası da qəbul olunmaz." (٢)

١١- İmam Əli (ə) buyurmuşdur: "Bədgüman (sui-zənn) etməkdən uzaq olun; çünki (başqaları barəsində) bədgüman etmək ibadətin (müsbət) təsirini aradan aparır."

١٢- İmam Sadiq (ə) buyurmuşdur: "Günah insanı Allahla ibadətdən, Onunla raz-niyaz və münacat etmək ləzzətindən saxlayır. İnsanda günahın təsiri iti bıçaqdan da sürətlidir."

١٣- İmam Baqir (ə) buyurmuşdur: "Hər kəs Allaha itaət etsə (müti olsa), bizim dostumuzdur. Hər kəs Allaha asi (üsyankar) olsa, bizim düşmənimizdir." (٣)

١٤- İmam Sadiq (ə) buyurmuşdur: " Günahkar şəxs öz günahına izhar etsə, ona ehtiram etmək vacib deyil və qeybəti caizdir."

١٥- İmam Əli (ə) buyurmuşdur: " Göz yaşının quruması yalnız qəlbin qəsavət bağlaması səbəbi ilədir. Qəlblər də yalnız günahın çoxluğu ilə bərkiyib, qəsavət bağlayar."

١٦- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Öz günahından tövbə edən şəxs, (ümumiyyətlə) günah etməyənlər kimidir."

١٧- İmam Əli (ə) buyurmuşdur: "Sizlərdən hər kəs Allah yanında hansı məqamda olduğunu bilmək istəsə, baxıb görsün: günah edərkən Allahın məqamı onun nəzərində neçədirsə, onun da məqamı Allah yanında elədir." (٤)

١٨- İmam Baqir (ə) buyurmuşdur: "Behişt camaat arasında fəsad törətmək üçün çalışan şəxsə haramdır."

١٩- İmam Sadiq (ə) buyurur: "Atam dəfələrlə buyurardı: "Qəlb üçün günahdan da zərərli bir şey yoxdur; çünki qəlb günaha batıb, ona israr edir, bu da günahın qəlbə hakim olması və onu (əksinə) dəyişdirməsi ilə nəticələnir."

---

۱- [۳۰۹] “Biharul-ənvar”, ۷۷-ci cild, səh. ۷۹.

۲- [۳۱۰] “Səfinətul-bihar”, ۲-ci cild, səh. ۶۳۰.

۳- [۳۱۱] “Kafi”, ۲-ci cild, səh. ۷۵.

۴- [۳۱۲] “Biharul-ənvar”, ۷۰-ci cild, səh. ۱۷.

İmam Əli (ə) buyurmuşdur: “Əfv edib bağışlamağın az olması ən qəbahətli eyb,-۲۰
(intiqam almağa tələsmək isə günahların ən böyüyüdür.”(۱

İmam Sadiq (ə) buyurmuşdur: “...Allah çoxlu günah edən bəndələrinin çoxlu tövbə-۲۱
”.etməsini sevir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Asimana çatana qədər günah edib,-۲۲
”.sonra tövbə etsəniz də, Allah sizin tövbənizi qəbul edər

İmam Sadiq (ə) buyurmuşdur: “Bəzən insan bir günah edir, lakin Allah-taala həmin-۲۳
günaha görə onu behiştə aparır.” Ərz etdilər: Allah insanı günah etməsinə görə behiştə aparарmı? Buyurdu: “Bəli, o, bir günah etdiyinə görə, həmişə o günahdan peşman olub
”.özünü danlayır, Allah da onu bağışlayıb behiştə aparır

Allah-taala Davud (ə)-a buyurdu: “Ey Davud, günahkarlara sonsuz rəhmətimin hər-۲۴
şeyi əhatə etdiyini müjdə ver ki, Mənim rəhmətimdən məyus olmasınlar. Yaxşı əməl sahiblərini də qəzəbimlə qorxut ki, öz itaətlərilə qürur hissi keçirməsinlər. Çünki qürur,
(özündən razı olmağa səbəb olur ki, o da ən ağır günahdır.”(۲

İmam Sadiq (ə) buyurmuşdur: “Günaha israr etmək heç vaxt kiçik (günah) və-۲۵
”.günahdan tövbə etmək heç vaxt böyük (günah) sayılmır

”!İmam Kazim (ə) buyurmuşdur: “Heç vaxt xeyir əməli çox, günahı isə az saymayın-۲۶

İmam Baqir (ə) buyurmuşdur: “Səbir iki qismə bölünür: Bəla və müsibət müqabilində-۲۷
səbir etmək. Bu, yaxşı və üstün əməl sayılır. Bundan da üstünü haramlardan
”.qorunmaqda səbir etməkdir

İmam Əli (ə) buyurmuşdur: “Pis rəftar ən pis yoldaş, həyatın acılığı və canın-۲۸
”.əzabıdır

İmam Əli (ə) buyurmuşdur: “Ən pis adam səhvi bağışlamayan və çirkinlikləri-۲۹
”.gizlətməyəndir

İmam Əli (ə) buyurmuşdur: “Yaxşı güman (hüsnü-zənn) nigarançılıqları azaldır və-۳۰
”.insanı günaha batmaqdan uzaq edir

۳۱-İmam Əli (ə) buyurmuşdur: “Qəzəb səni günaha batırmasın; çünki axırda qəzəbin sönəcək, lakin dinin əlindən çıxacaqdır.”

۳۲-İmam Baqir (ə) buyurmuşdur: “Qəzəbdən böyük bir şey (günah) yoxdur, çünki insan qəzəblənməklə Allah taalanın haram etdiyi qətlə mürtəkib olar və yaxud iffətli bir qadını ittiham edər.”

۳۳-İmam Sadiq (ə) buyurmuşdur: “Küfrün səbəbi üç şeydir: Tamah, qürur və həsəd.”

۳۴-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Mömini xar və zəlil edən şəxsi, Allah xar və zəlil edər.”

۳۵-İmam Sadiq (ə) buyurmuşdur: “Dörd tayfa behiştdən məhrum olar: ۱-Kahin. ۲-Münafiq. ۳-Həmişə şərab içən şəxs. ۴-Söz gəzdirən.”

۳۶-İmam Əli (ə) buyurmuşdur: “İnsanların ən pisi söz gəzdirən, dostların arasını vuranlar və iffətli şəxslərin eyblərini axtaranlardır.”

۳۷-İmam Sadiq (ə) buyurmuşdur: “Bir şəxsin xatalarını yadda saxlayıb, nə vaxtsa onu rüsvay etmək məqsədilə onunla dostluq edən şəxs Allahdan uzaq düşmüşdür.”

۳۸-Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Allah mömin kişi və qadına böhtan atan, onlarda olmayan (pis) xüsusiyyəti onlara nisbət verən şəxsi qiyamət günündə dediyi sözün məsuliyyətindən çıxana qədər oddan olan bir təpənin üstündə qərar verər”

۳۹-İmam Baqir (ə) buyurmuşdur: “Tövbə etdikdən sonra günahı yenə davam etdirən şəxs (Allaha) istehza edən şəxs kimidir.”

۴۰-İmam Sadiq (ə) buyurmuşdur: “Məgər bilmirsiniz ki, əməl dəftərləriniz ona (Rəsuli-Əkrəmə) göstərilir?! Həzrət onda günah əməl görərsə, narahat olur. Belə isə, Rsuli-Əkrəmi narahat etməyin və onu (gözəl əməllərlə) sevindirib şad edin.”(۳)

səh:۷۷

---

۱- [۳۱۳] “Qürərul-hikəm”, səh. ۲۳۵.

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs (qadın və ya kişi) evlənsə, öz-١
(dininin yarısını qorumuşdur. Qalan yarısında da gərək təqvalı olsun.”(١

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Allah yanında yatmış evli şəxs,-٢
(gündüzləri oruc tutub gecələri oyaq qalan subay adamdan üstündür.”(٢

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs dünyadan pak-pakizə-٣
(getmək istəsə, gərək ailə qursun və subay halda ölməsin.”(٣

İmam Sadiq (ə) buyurmuşdur: Bir kişi atamın hüzuruna gəldi. Həzrət ondan soruşdu:-۴
“Evlisənmi?” Cavab verdi: “Xeyr!” Buyurdu: “Bütün dünya və onda olanları, tək halda gecələyim (subay qalım) deyə, mənə versələr, qəbul etmərəm.” (Sonra buyurdu:) “Evli adamın qıldığı iki rükət namaz, subay adamın gecələr oyaq qalıb gündüzlər oruc tutmasından fəzilətlidir.” Sonra atam on yeddi dinar pul verib buyurdu: “Bu pul ilə
(evlən.”(۴

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Evli şəxsin qıldığı iki rükət namaz,-۵
gecələri oyaq qalıb ibadət edən, gündüzləri isə oruc tutmaqla keçirən subay adamın
(əməlindən fəzilətlidir.”(۵

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs maddi məsələlərdən və həyat-۶
xərclərindən qorxub evlənməsə, deməli, Allah və Onun vədəsi barədə sui-zənn (pis
”.güman) etmişdir

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ən pis ölülər o kəslərdir ki, ailə-٧
(qurmaqdan boyun qaçırmışlar.”(۶

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ümmətimin yaxşıları evlilər, pisləri isə-٨
(subaylardır.”(٧



---

.Kafi”, ۵-ci cild, səh. ٣٢٨“ [٣١۶] -١

۲- [۳۱۷] “Biharul-ənvar”, ۱۰۳-cü cild, səh. ۲۲۱.

۳- [۳۱۸] “Mən la yəhzuruhul-fəqih”, ۳-cü cild, səh. ۳۸۵.

۴- [۳۱۹] “Biharul-ənvar”, ۱۰۳-cü cild, səh. ۲۱۷.

۵- [۳۲۰] “Mən la yəhzuruhul-fəqih”, ۳-cü cild, səh. ۳۸۰.

۶- [۳۲۱] “Təhzib”, ۷-ci cild, səh. ۲۳۹.

۷- [۳۲۲] “Biharul-ənvar”, ۱۰۳-cü cild, səh. ۲۲۱.

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ailə qur, yoxsa məsihi rahiblərindən,-۹
(yaxud Şeytanın qardaşlarından olarsan.”(۱

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Asimanın rəhmət qapıları dörd yerdə-۱۰
açılır: Yağış yağdıqda, övlad ata-ananın üzünə (məhəbbətlə) baxdıqda, Kəbənin qapısı
(açıldıqda və nikah baş verdikdə.”(۲

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ey cavanlar! Sizdən hər kəsin qüdrəti-۱۱
(imkanı) varsa, ailə qursun. Çünki bu işlə gözləriniz qadınlardan çəkilər və namusunuz
(qorunar.”(۳

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ailə qurun, qızları ərə verin, subay-۱۲
kişiləri evləndirin. Hər bir müsəlmanın şərəf və səadəti odur ki, qızlar ərsəyə çatdıqda,
”.onu ərə versin

Həzrət Peyğəmbəri-Əkrəm (s) tərki-dünyalıqla məşğul olmağın, ailə qurmağı tərk-۱۳
etməyin qarşısını almış və qadının ərə getməkdən imtina etməsini qadağan
(etmişdir.(۴

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs cavan ikən ailə qursa,-۱۴
Şeytan nalə çəkib deyər ki, vay olsun mənə, vay olsun mənə, bu gənc dininin üçdə
(ikisini mənim şərrimdən qorudu.”(۵

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Subay oğlan və qızlarınızı evləndirin.-۱۵
Həqiqətən, mütəal Allah onların əxlaqlarını yaxşılaşdırar, ruzilərini bol edər və abır-
(şərəflərini artırar.”(۶

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Allah dərgahında İslamda nikahla-۱۶
abad olmunuş evdən sevimli, təlaqla viran olmuş evdən pis və qəzəbli bir şey
(yoxdur.”(۷

İmam Sadiq (ə) buyurmuşdur: “Subaylarını evləndirənlər qiyamət günündə Allahın-۱۷
(rəhmət nəzəri ilə baxdığı şəxslərdəndir.”(۸

İmam Əli (ə) buyurmuşdur: “Ən üstün vasitəçilik iki nəfərin ailə qurmasında, mütəal-۱۸

(Allah onların arasında şəri nikah qərar versin deyə, vasitəçi olmaqdır."(۹

İmam Kazim (ə) buyurmuşdur: "Üç dəstə qiyamət günündə heç bir kölgə olmayan-۱۹ zaman Allahın rəhmət kölgəsində qərar tutarlar: Mömin qardaşını evləndirənlər, mömin qardaşına xidmət edib hacətini yerinə yetirənlər və mömin qardaşının sirrini (faş etməyib gizli saxlayanlar."(۱۰

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Hər kəs halal yolla ailə qurmağa-۲۰ çalışsa, mömin kişini evləndirib mömin qadını ərə versə, Allah-taala bu zəhmət və xərcin əvəzində onu behişt huriləri ilə evləndirər, bu yolda dediyi hər söz və götürdüyü (hər qədəm üçün bir illik ibadət savabını yazar."(۱۱

İmam Sadiq (ə) buyurmuşdur: "Günahların ən pisi üçdür: Nahaq qətl, qadının-۲۱ ".mehriyyəsini verməmək, (yaxud təxirə salmaq) və işçinin haqqını ödəməmək

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Hər kəs iki mömininin ailə qurmasına-۲۲ çalışaraq onları evləndirsə, Allah-taala əvəzində onu hər biri dürr və yaqutdan tikilmiş (qəsrdə olan min Huril-eynlə evləndirər."(۱۲

İmam Kazim (ə) buyurmuşdur: "Sözsüz, qiyamət günündə Allahın xüsusi lütf və-۲۳ rəhmət kölgəsi vardır ki, onun altında yalnız peyğəmbərlər, onların vəsiləri, mömin qulu azad edən möminlər, başqa mömininin borcunu ödəyən mömin bəndə, mömin qadınla kişinin ailə qurmasında zəhmət çəkib, onların haqqını boynuna götürən mömin (qərar tapar."(۱۳

İmam Əli (ə) buyurmuşdur: "Qadının mehriyyəsini çox etməyin, çünki (bu iş)-۲۴ ".düşmənçiliyə səbəb olar



---

.Yenə orada, ۱۳-cü cild, səh ۲۲۱ [۳۲۳] -۱

.Biharul-ənvar", ۱۰۳-cü cild, səh. ۲۲۱" [۳۲۴] -۲

.Vəsailuş-şiə", ۱۴-cü cild, səh. ۱۵۳" [۳۲۵] -۳

.Yenə orada, ۱۴-cü cild, səh. ۲۴۸ [۳۲۶] -۴

۵- [۳۲۷] “Biharul-ənvar”, ۱۰۳-cü cild, səh. ۲۲۱.

۶- [۳۲۸] Yenə orada, ۱۰۳-cü cild, səh. ۲۲۲.

۷- [۳۲۹] “Kafi”, ۵-ci cild, səh. ۳۲۸.

۸- [۳۳۰] “Təhzib”, ۱-ci cild, səh. ۴۰۴.

۹- [۳۳۱] Yenə orada, ۷-ci cild, səh. ۲۱۵; “Kafi”, ۵-ci cild, səh. ۳۳۱.

۱۰- [۳۳۲] “Biharul-ənvar”, ۷۴-cü cild, səh. ۳۵۶.

۱۱- [۳۳۳] Yenə orada, ۱۰۳-cü cild, səh. ۲۲۱.

۱۲- [۳۳۴] “Vəsailuş-şiə”, ۲۱-ci cild, səh. ۱۵۳.

۱۳- [۳۳۵] Yenə orada, ۲۰-ci cild, səh. ۴۶.

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Xeyir-bərəkəti daha çox olan nikah-۲۵ (odur ki, xərci az olsun.”(۱

İmam Sadiq (ə) buyurmuşdur: “Allahın Rəsulu qiyməti otuz dirhəm olan bir zirehi-۲۶ (mehriyyə qərar verib, Əli (ə) ilə Fatiməni evləndirdi.”(۲

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Qadının mübarək (bərəkətli)-۲۷ (olmaması mehriyyəsinin çoxluğu və əxlaqının pis olmasındadır.”(۳

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs bir ovuc buğda və ya-۲۸ xurmanı (qarşı tərəfin razılığı ilə) mehriyyə qərar versə, onun nikahı halal və (düzdür.”(۴

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ailə qur, hətta (mehriyyəsi) dəmir-۲۹ (üzük olsa belə.”(۵

İmam Sadiq (ə) buyurmuşdur: “Oğrular üç dəstədir: Zəkat verməyənlər, qadınların-۳۰ mehriyyəsini verməyib (özünə) halal sayanlar və borc alıb qaytarmaq fikrində (olmayanlar.”(۶

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Əgər dinini və əxlaqını bəyəndiyiniz-۳۱ bir kəs elçiliyə gəlsə, onu qəbul edib qızınızı verin.” O həzrətdən “əgər onun nəsəbi pis olsa, nə edək?” – deyə soruşduqda, Həzrət əvvəlki sözü təkrar edərək əlavə etdi: “Dini və gözəl əxlaqı olduğu halda, əsil-nəsəbinin məşhur olmadığına görə ona qız (verməsəniz, yer üzündə böyük fitnə-fəsad baş verəcəkdir.”(۷

İmam Cavad (ə) buyurmuşdur: “Hər kəs sizə elçi gəlsə, onun dinindən və-۳۲ (düzlüyündən yəqinlik hasil etdikdən sonra ailə qurmağa razı olun.”(۸

Bir kişi imam Hüseyn (ə)-ın yanına gəlib dedi: “Mənim bir qızım var, onu neçə adama-۳۳ ərə versəm yaxşı olar?” Həzrət buyurdu: “Onu Allahdan qorxan (təqvalı olan) bir adama ərə ver, çünki həmin şəxs sənin qızını sevsə, əzizləyəcək, amma acığı gəlsə, (əzab-əziyyət (zülm) etməyəcəkdir.”(۹

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs qızını imansız və fasiq bir-۳۴

(adama ərə versə, sözsüz, onunla qohumluq əlaqəsini kəsmişdir."(۱۰

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Qadınla təkcə onun gözəlliyinə görə-۳۵ evlənmə; çünki onun gözəlliyi iffətsizliyinə səbəb ola bilər. Həmçinin qadının mal-dövlətinə görə də onunla evlənmə; çünki bu iş onun tüğyan və itaətsizlik etməsinə (səbəb ola bilər. Sən qadınla onun dininə görə ailə qur."(۱۱

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Hər kəs qadınla, təkcə onun gözəllik-۳۶ və camalına görə ailə qursa, Allah o qadının gözəlliyini onun üçün əzab-əziyyət səbəbi (edər."(۱۲

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Hər kəs qadının mal-dövlətinə görə-۳۷ onunla ailə qursa, Allah onu həmin mal-dövlətə həvalə edər; hər kəs qadının gözəlliyinə görə onunla evlənsə, o qadında xoşlamadığı və acığı gəldiyi şeyləri görəcəkdir; hər kəs qadınla dininə görə ailə qursa, Allah o yaxşılıqların hamısını onun (üçün cəm edəcəkdir."(۱۳

İmam Sadiq (ə) buyurmuşdur: "Hər kəs qadınla təkcə mal-dövlətinə görə ailə-۳۸ qursa, mütəal Allah onu yalnız həmin mal-dövlətə həvalə edər. (Yəni çətin vaxtlarda (Allahın lütf və mərhəmətindən binəsib qalar.)"(۱۴

İmam Səccad (ə) buyurmuşdur: "Hər kəs Allah xatirinə və sileyi-rəhimə görə ailə-۳۹ (qursa, Allah onun başına izzət tacı qoyar."(۱۵

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Hər kəs bir qadınla təkcə onun-۴۰ gözəlliyinə görə evlənsə, istədiyinə çatmayacaqdır. Hər kəs qadınla, təkcə onun malına görə evlənsə, mütəal Allah onu təkcə o mala vəkil edər. Sizlərə dindar qadın seçməyi tövsiyə edirəm. (Çünki bütün xeyir və bərəkət onun vücudunda (qoyulmuşdur.)"(۱۶

səh:۸۰

---

.Kənzül-ümmal", ۱۶-cı cild, səh. ۲۲۹" [۳۳۶] -۱

.Vəsailuş-şiə", ۲۱-ci cild, səh. ۲۵۱" [۳۳۷] -۲

۳- [۳۳۸] “Biharul-ənvar”, ۵۰-ci cild, səh. ۳۲۱.

۴- [۳۳۹] “Kənzül-ümmal”, ۱۶-cı cild, səh. ۳۲۱.

۵- [۳۴۰] Yenə orada, ۱۶-cı cild, səh. ۳۲۱.

۶- [۳۴۱] “Biharul-ənvar”, ۹۶-cı cild, səh. ۱۲.

۷- [۳۴۲] “Təhzib”, ۷-ci cild, səh. ۳۹۴.

۸- [۳۴۳] “Mən la yəhzuruhul-fəqih”, ۳-cü cild, səh. ۳۹۳.

۹- [۳۴۴] “Əl-müstətrəf”, ۲-ci cild, səh. ۲۱۸.

۱۰- [۳۴۵] “Məhəccətul-beyza”, ۳-cü cild, səh. ۹۴.

۱۱- [۳۴۶] Yenə orada, ۳-cü cild, səh. ۸۵.

۱۲- [۳۴۷] “Vəsailuş-şiə”, ۲۰-ci cild, səh. ۵۳.

۱۳- [۳۴۸] “Təhzib”, ۷-ci cild, səh. ۳۹۹.

۱۴- [۳۴۹] “Kafi”, ۵-ci cild, səh. ۳۳۳.

۱۵- [۳۵۰] “Mən la yəhzuruhul-fəqih”, ۳-cü cild, səh. ۳۸۵.

۱۶- [۳۵۱] “Təhzib”, ۷-ci cild, səh. ۳۹۹.

Allah-taala buyurmuşdur: "Səbir etmək və namaz qılmaqla kömək diləyin!-۱ (Həqiqətən, bu, Allaha itaət edənlərdən başqası üçün ağırdır."(۱

İmam Baqir (ə) buyurmuşdur: "Qiyamət günü bəndədən soruşulacaq ilk əməl-۲ namazdır; əgər namaz qəbul olunsa, sair əməllər də qəbul olunacaqdır, əks halda sair (əməllər ona heç bir fayda verməyəcəkdir."(۲

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Namaz dinin sütunudur, onu bilə-bilə-۳ (tərk edən şəxs dinini xarab etmişdir."(۳

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Hər kəs namazını zay etsə, Allah--۴ taala onu (qiyamətdə) Qarun, Firon və Hamanla məhşur edər. Vay olsun namazı tərk (edən şəxsə!"(۴

Allah-taala buyurmuşdur: "(Möminlər) tövbə, ibadət və şükr-səna edənlər, oruc-۵ tutanlar (və ya cihad yolunda, elm öyrənmək üçün yurdundan ayrılıb başqa yerlərə gedənlər), rüku və səcdə edənlər (namaz qılanlar), yaxşı işlər görməyi əmr edib pis (işlərdən çəkindirənlərdir. (Ya Mühəmməd!) Belə möminlərə müjdə ver."(۵

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Allah mənim gözümün nurunu-۶ namazda qərar vermişdir; yemək ac olan şəxs, su isə susuz şəxs üçün sevimli olduğu kimi, onu mənim nəzərimdə sevimli etmişdir. Ac olan şəxs yemək yeyərək doyur, (susuz olan şəxs də su içərək sirab olur, lakin mən namazdan heç vaxt doymuram."(۶

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Namaz qılan şəxs namaza durub-۷ niyyət edəndə, "Həmd" və surəni oxuyanda, rüku və səcdəyə gedəndə, təşəhhüd və salam deyəndə bu namazla qabaqkı namazlar arasında gördüyü bütün günahları (bağışlanar."(۷



---

.Bəqərə" surəsi, ۴۵-ci ayə" [۳۵۲]-۱

.Biharul-ənvar", ۷-ci cild, səh. ۲۶۷" [۳۵۳]-۲

۳- [۳۵۴] Yenə orada.

۴- [۳۵۵] Yenə orada.

۵- [۳۵۶] “Tövbə” surəsi, ۱۱۲-ci ayə.

۶- [۳۵۷] “Biharul-ənvar”, ۸۲-ci cild, ۱-ci bölüm.

۷- [۳۵۸] Yenə orada.

۸- Allah-taala buyurmuşdur: “(Günahlardan, küfrdən) təmizlənən kimsə nicat tapacaqdır. O kimsə ki, Rəbbinin adını zikr edib namaz qılar!”(۱)

۹- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər namaz vaxtı bir mələk nida edib deyər: Ey Adəm övladları, namaza qalxın və (namaz vasitəsilə) öz əleyhinizə hazırladığınızı (cəhənnəm odunu) söndürün!”(۲)

۱۰- İmam Sadiq (ə) buyurmuşdur: “Namazı tərk edən şəxs İslamdan heç bir bəhrə görməz.”(۳)

۱۱- İmam Sadiq (ə) buyurmuşdur: “Bil ki, namaz Allahın yer üzündə olan səddidir. Hər kəs namazından nə qədər bəhrələndiyini bilmək istəsə, baxıb görsün ki, namazı onu çirkin və pis işlərdən nə qədər saxlayır.”(۴)

۱۲- Allah-taala buyurmuşdur: “Namazınızı qıldıqdan sonra ayaq üstə olanda da, uzananda da Allahı zikr edin, arxayınlığa çıxdıqda isə, namazı qılın. Çünki namaz möminlərə müəyyən vaxtlarda vacib edilmişdir.”(۵)

۱۳- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Namazlarınızda (son dərəcə) diqqətli olun, çünki dini qəbul etdikdən sonra, İslamın əsası namazdır.”(۶)

۱۴- İmam Əli (ə) buyurmuşdur: “Əgər namaz qılan şəxs Rəbbinin sonsuz rəhmətinin onun halına necə şamil olduğunu bilsəydi, heç vaxt başını səcdədən götürməzdi.”(۷)

۱۵- İmam Baqir (ə) buyurmuşdur: “Namaz qılan şəxs üzünü qibləyə tutanda tayı-bərabəri olmayan mərhəmətli Allah ona tərəf üz gətirər.”(۸)

۱۶- İmam Sadiq (ə) buyurmuşdur: “Hər bir şeyin çöhrəsi vardır, dinin çöhrəsi də namazdır.”(۹)

۱۷- Allah-taala buyurmuşdur: “İman gətirən, xeyirli işlər görən, namaz qılan və zəkat verən şəxslərin Rəbbi yanında mükafatları vardır. Onların heç bir qorxusu yoxdur və onlar qəm-qüssə görməzlər.”(۱۰)

۱۸- İmam Sadiq (ə) buyurmuşdur: “Allaha itaət etmək yer üzündə Ona xidmət etməkdir və Allaha olunan heç bir xidmət namazla bərabər ola bilməz.”(۱۱)

۲۰- Qurani-kərimdə həzrət İbrahim (ə)-ın belə dediyi buyurulmuşdur: “Ey Rəbbim! Məni də, nəslimdən olanları da namaz qılan et. Ey Rəbbim! Duamı qəbul et.”(۱۲)

۲۱- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Namazı yüngül sayanlar məndən deyil. Allaha and olsun ki, belə bir şəxs mənim yanıma (Kövsər hovuzuna) gələ bilməz.”(۱۳)

۲۲- İmam Sadiq (ə) buyurmuşdur: “Həqiqətən bizim şəfaətimiz namazı yüngül sayanlara çatmaz. (Onlar şəfaətimizdən məhrum olarlar.)”(۱۴)

۲۳- İmam Əli (ə) vəsiyyət etdi ki, üç əməl hacətlərin qəbul olunmasına səbəb olar: Soyuq havada kamil dəstəmaz almaq, gecə və gündüz namaz qılandan sonra intizar çəkmək və camaat namazı qılmaq üçün qədəm götürmək.

۲۴- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Öz namazlarınızda (son dərəcə) diqqətli olun, çünki Allah-taala qiyamət bərqərar olarkən bəndəni gətirər və ondan soruşduğu



---

۱- [۳۵۹] “Əla” surəsi, ۱۴-۱۵-ci ayələr.

۲- [۳۶۰] “Mizanul-hikmə”, ۲۲۷۵-ci bölüm.

۳- [۳۶۱] Yenə orada.

۴- [۳۶۲] Yenə orada.

۵- [۳۶۳] “Nisa” surəsi, ۱۰۳-cü ayə.

۶- [۳۶۴] “Müstədrəkül-vəsail”, ۳-cü cild, səh. ۱۰۲.

۷- [۳۶۵] “Biharul-ənvar”, ۸۲-ci cild, səh. ۲۲۷.

۸- [۳۶۶] Yenə orada.

۹- [۳۶۷] Yenə orada.

۱۰- [۳۶۸] “Bəqərə” surəsi, ۲۷۷-ci ayə.

۱۱- [۳۶۹] “Biharul-ənvar”, ۸۲-ci cild, səh. ۲۲۷.

۱۲- [۳۷۱] “İbrahim” surəsi, ۴۰-cı ayə.

۱۳- [۳۷۲] “Biharul-ənvar”, ۸۲-ci cild, ۱-ci bölüm.

۱۴- [۳۷۳] Yenə orada, ۸۳-cü cild, ۱-ci bölüm.

ilk şey namaz olar, əgər onu tamam-kamal yerinə yetirmiş olarsa, (bağışlanmış (insanlardan olar), əks halda cəhənnəmə atılar."(۱

Həzrət Fatimeyi-Zəhra (ə) buyurmuşdur: "Allah namazı təkəbbür və qürurdan-۲۵ paklanmağınız, zəkatı nəfsinizin saflaşması və ruzinizin artması, orucu ixlasınızın ".möhkəmlənməsi üçün vacib etdi

Allah-taala buyurmuşdur: "(İsa Məsih (ə) dedi: Allah) mənə diri olana qədər namaz-۲۶ (qılıb zəkat verməyi tövsiyə buyurdu."(۲

İmam Sadiq (ə) buyurmuşdur: "Allah beş namazı (günün) ən gözəl saatlarında vacib-۲۷ (etmişdir. Belə isə, vacibi namazlardan sonra dua edin!"(۳

İmam Əli (ə) buyurmuşdur: "Allahın Rəsulu (s) nə şam yeməyini, nə də başqa bir-۲۸ əməli namazdan üstün tutmurdu; namaz vaxtı çatanda, artıq nə ailə-uşaq tanıyırdı, nə (də dost."(۴

Allah-taala buyurmuşdur: "Namaz qıl, həqiqətən, namaz (insanı) çirkin və pis-۲۹ (əməllərdən çəkindirər. Allahı zikr etmək, şübhəsiz ki, daha böyükdür."(۵

Aşura günü günorta çağı, Əbu Sümamə Seydavi namazın vaxtının çatmasını imam-۳۰ Hüseyn (ə)-a xatırlatdıqda, o həzrət onun barəsində ən gözəl dua edib buyurdu: "Allah (səni namazı yad edənlərdən qərar versin!"(۶

İmam Sadiq (ə) buyurmuşdur: "Bizim şiələrimizi namaz vaxtında imtahan edin:-۳۱ (görün ki, vaxtında namaz qılmağa necə riayət edirlər."(۷

Allah-taala Qurani-kərimdə həzrət Loğman (ə)-ın öz oğluna nəsihətini belə bəyan-۳۲ edir: "Oğlum! Namaz qıl, (insanlara) yaxşı işlər görməyi əmr et, pis işlərdən çəkindir. ((Bu yolda) sənə üz verəcək müsibətlərə döz. Həqiqətən bu, vacibi əməllərdəndir."(۸

İmam Sadiq (ə) buyurmuşdur: "Namazın vaxtı çatanda, imam Səccad (ə)-ın-۳۳ bədəninin tükləri biz-biz olur, rəngi saralır və bədəni xurma ağacının quru budaqları (kimi əsirdi."(۹

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Üç əməli təxirə salmayın: Namazı,-۳۴

cənazəni götürməyi və dul qadını ərə verməyi.”(۱۰)

۳۵- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ya Əli! Namazı əvvəl vaxtından təxirə salma; çünki bu iş, Allahı qəzəbləndirir.”(۱۱)

۳۶- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Namazı elə halda qıl ki, sanki ömrünün axırıncı namazını qılırsan.”(۱۲)

۳۷- Allah-taala buyurmuşdur: “Sən isə Rəbbini tərifləyib şükr et, səcdə edənlərlə (namaz qılanlarla) birlikdə ol və ölənə qədər Rəbbinə ibadət et.”(۱۳)

۳۸- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ya Əli! Namazı kamil dəstəmaz almaqla əvvəl vaxtında qıl.”(۱۴)

۳۹- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “(Gündəlik) beş namazı riayət edən (vaxtında lazımınca qılan) şəxslərə, bu namazlar qiyamət günündə onun üçün nur və nicat vasitəsi olacaqdır.”(۱۵)

۴۰- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Asimanın rəhmət qapıları dörd yerdə açılır və dualar qəbul olunur: ۱-Allah yolunda cihad edənlərin görüşünə gedib onları görəndə. ۲-Yağış yağanda. ۳-Kəbəni görəndə. ۴-Namaz vaxtı.”

səh:۸۳

---

۱- [۳۷۴] Yenə orada, ۸۲-ci cild, səh. ۲۰۲.

۲- [۳۷۵] “Məryəm” surəsi, ۳۱-ci ayə.

۳- [۳۷۶] “Biharul-ənvar”, ۸۲-ci cild, səh. ۲۰۲.

۴- [۳۷۷] “Sünənün-Nəbi”, səh. ۱۴.

۵- [۳۷۸] “Ənkəbut” surəsi, ۴۵-ci ayə.

۶- [۳۷۹] “Məqtəli Hüseyn”, Müqərrəm.

۷- [۳۸۰] “Səfinətul-bihar”, ۷۲-ci cild.

۸- [۳۸۱] “Loğman” surəsi, ۱۷-ci ayə.

۹- [۳۸۲] “Biharul-ənvar”, ۸۴-cü cild, səh. ۲۴۷.

۱۰- [۳۸۳] “Nəhcül-fəsahə”, səh. ۲۶۲.

۱۱- [۳۸۴] “Səfinətul-bihar”, ۲-ci cild, səh. ۴۳.

۱۲- [۳۸۵] “Biharul-ənvar”, ۶۹-cu cild, səh. ۴۰۸.

۱۳- [۳۸۶] “Hicr” surəsi, ۹۸-۹۹-cu ayələr.

۱۴- [۳۸۷] “Səfinətul-bihar”, ۲-ci cild, səh. ۴۳.

۱۵- [۳۸۸] “Kənzül-ümmal”, ۷-ci cild.

## NAMAZ HAQQINDA QIRX İNCƏLİK

۱-Namaz behiştə gedənlərin tacıdır.

۲-Namaz qeyb aləminə açılmış bir pəncərədir.

۳-Namaz yerdən göy aləminə pərvaz etməkdir.

۴-Namaz insanın Allahın rəhmət süfrəsində oturmasına səbəb olur.

۵-Namaz dini abadlaşdırır.

۶-Namaz xoşbəxtlik iksiridir.

۷-Namaz insanı xilqətlə eyni ahəngdə edir.

۸-Namaz yerlə göy arasında bir körpüdür.

۹-Namaz Allahla dostluğu davam etdirməkdir.

۱۰-Namaz möminin simasındakı iman cilvəsidir.

۱۱-Namaz sonsuz ruzi verənə əl açmaqdır.

۱۲-Namaz bütləri sındırmaq və İlahi eşq odunda yanmaqdır.

۱۳-Namaz səma qapılarının yer üzündə yaşayanların üzünə açılmasıdır.

۱۴-Namaz ən pak iman aynasıdır.

۱۵-Namaz qəlbləri dirildən ətirdir (müşkdür).

۱۶-Namaz günah müqabilində bir qalxandır.

۱۷-Namaz günahlar zülmətində qəlbin işıqlanmasıdır.

۱۸-Namaz nur okeanında üzməkdir.

۱۹-Namaz canı duru və sərin bulaqdan sirab etməkdir.

.Namaz bütün yaxşılıqlar xəzinəsi və eşq fəryadıdır-۲۰

.Namaz çirkinliklərlə mübarizədir-۲۱

.Namaz imanı təkmilləşdirən və insanın meracıdır-۲۲

.Namaz Allaha eşqi izhar etməkdir-۲۳

.Namaz pərhizkarların və ariflərin yoldaşıdır-۲۴

.Namaz özünü yaddan çıxarıb, İlahi eşqə qovuşmaqdır-۲۵

.Namaz doğruluğun başlanğıcıdır-۲۶

.Namaz behiştin ətirli nəsimidir-۲۷

.Namaz günahlardan tövbə edib, İlahi fitrətə qayıtmaqdır-۲۸

Namaz bəndəlik nurunun həyatın şərqindən və übudiyyətin Sina dağından-۲۹
.saçmasıdır

.Namaz Allahla danışmaqdır-۳۰

Allah-taala “Nisa” surəsinin ۱۰۳-cü ayəsində buyurur: “Namaz qılın, çünki namaz-۳۱
”.möminlərə müəyyən vaxtlarda vacib edilmişdir

.Namaz qılanda qünutu və səcdələri uzatmaq insanı cəhənnəm əzabından saxlayır-۳۲

.Namaz İlahinin məhrəm yeri və varlıq kəbəsində qəlbin təvafıdır-۳۳

.Namaz müsəlmanların əməli əhdləridir-۳۴

.Namaz azadlığın yaşıl paltarı və Allaha doğru hicrət etməkdir-۳۵

.Namaz Allahı yad etməyi qəlbdə dirildir-۳۶

.Namaz qəlb əhlinin istəyi və Peyğəmbərin dostudur-۳۷

.Namaz Şeytanla mübarizə edib, Allahla əhd-peyman bağlamaqdır-۳۸

.Namaz məbudla ünsiyyətdə olmaq və ruhi yüksəlişdir-۳۹

.Namaz dini abad edib, şeytanları zəlil etməkdir-۴۰

## İMAM MƏHDİ (Ə)–IN ZÜHURUNUN ƏLAMƏTLƏRİ

İmam Məhdi (ə)-ın zühurunun iki əlaməti vardır: a) Qəti əlamətlər. b) Qəti olmayan .əlamətlər

:a) Qəti əlamətlər

Dəccalın meydana çıxması: O məlun Allahlıq iddiası edəcəkdir. Onun gəlişindən-١ sonra dünyada çoxlu qanlar töküləcək, fitnə-fəsad yaranacaqdır. Hədislərdən məlum olduğu kimi, onun gözünün biri silinmişdir və sol gözü alnının ortasındadır. O, çox böyük cüssəli və güclüdür, qəribə və qorxulu qiyafəsi vardır, sehrbazlıqda çox mahirdir. Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Möminlərdən hər kəs Dəccalı görsə, öz ağız suyunu onun üzünə atıb, onun sehrini batil etmək üçün "Həmd" surəsini oxusun." Nəhayət, Dəccal ilə imam Zaman (ə)-ın qoşunu arasında müharibə baş verər .və o, ya imam Zaman (ə), ya da həzrət İsa ibni Məryəm (ə)-ın əli ilə öldürülər

Süfyaninin qiyamı: Süfyani Məkkə ilə Şam arasında qiyam edəcəkdir. O, çirkin-٢ surətlidir, üzündə sızaq var, gözləri göy və Yezid ibni Müaviyənin övladlarındandır. O, beş böyük şəhəri və məntəqəni – Dəməşq, Həms, Fələstin, İordaniya və Qinnəsrini ələ keçirəcək və ətraf nahiyələrə ordu göndərəcəkdir. O, Mədinə və Bağdad şəhərlərində kütləvi qırğın törədəcək, Məkkəyə bir ordu göndərəcək və yol əsnasında imam Məhdi .(ə)-ın ordusu onları məğlub və həlak edəcəklər

Süfyaninin üç yüz min nəfərdən ibarət olan ordusu Allahın əmrilə Məkkə–Mədinə arasında yerə batacaqdır. Təkcə Bəşir və Nəzir adlı iki qardaş sağ qalacaq və bir mələk gəlib onların üzünü arxaya çevirəcəkdir. Bəşir Məkkəyə gəlib Süfyani ordusunun həlak olmasını İmama, Nəzir də Şama gedib bu xəbəri Süfyaniyə deyəcəkdir. Süfyani Şamda bu xəbəri eşitcək, Kufəyə doğru hərəkət edib, orada qətl və qarətlə məşğul olacaqdır. İmam Məhdi (ə)-ın Kufəyə daxil olması ilə Süfyani qaçacaqdır. O həzrətin ordusu onu təqib edib, Beytül-müqəddəsdəki Səxrə məscidinin yaxınlığında qətlə yetirəcəklər və .onun murdar başını kəsib çirkin ruhunu cəhənnəmə göndərəcəklər

Səmadan gələn bir səs: İmam Məhdi (ə) Məkkədə zühur edərkən səmadan belə bir-٣ səs eşidilər: "Ey məxluqlar, agah olun! Bu, Məhəmməd (s)-in övladı Məhdidir."

Dünyanın şərqindən qərbinədək bütün insanlar hər biri öz dilində bu səsi eşidib .Məkkəyə üz tutar, o həzrətin hüzuruna gedərlər

Nəfsi-Zəkiyyənin qətlə yetirilməsi: O, həzrət Peyğəmbər (s)-in nəslindəndir və Rükn-۴ .ilə Məqam arasında şəhid olacaqdır

Seyyid Həsəninin qiyamı: O, xoş üzlü bir cavandır ki, Deyləm və Qəzvin tərəfdən-۵ qiyam edib deyəcəkdir: “Sizdən kömək istəyən Peyğəmbər (s) övladının dadına çatın!” Çox güman ki, Seyyid Həsəni İmam Həsən (ə)-ın nəslindən və on iki imamçı şiədir O, din və haqq ardıcılı olub, batil bir iddia etməyəcəkdir. Onun danışığı və rəftarı həzrət Peyğəmbəri-Əkrəm (s)-in pak şəriətilə uyğun olacaq. Möminlərdən bir çoxu da zalımların zülmünü dəf etmək üçün ona kömək edəcəklər. O, Qəzvindən Kufəyədək olan əraziləri zülmkarlardan və kafirlərdən təmizləyəcək. Kufəyə daxil olduqda, İmam .Məhdi (ə)-ın zühur etdiyini eşidər və ordusu ilə birlikdə Həzrətə beyət edərlər

.Ramazan ayının ortancıl günündə günəşin, axırında isə ayın tutulması-۶

:b) Qəti olmayan əlamətlər

.Kufə məscidinin divarının uçulması-۷

.Fərat çayından bir qol ayrılaraq Kufə şəhərinin kücələrinə axması-۸

.Kufə şəhərinin darmadağın olunmasından sonra yenidən abadlaşması-۹

.Nəcəf gölünün su ilə dolması-۱۰

.Cüdey ulduzunun yaxınlığında quyruğu olan bir ulduzun görünməsi-۱۱

.İmam Məhdi (ə)-ın zühurundan öncə qıtlığın baş verməsi-۱۲

.Əksər şəhərlərdə zəlzələnin baş verməsi və taun xəstəliyinin yayılması-۱۳

.Məscidlərin boş qalması-۱۴

.Burasa məscidinin uçması-۱۵

Yer kürəsinin şərqindən od püskürərək üç, yaxud yeddi gün yer ilə göy arasında-۱۶
.alovlanması

.Xorasandan qara bayraqlıların hərəkəti-۱۷

səh:۸۵

Rəcəb və Cəmadiyus-sani aylarında misli-bərabəri görünməmiş leysan yağışlarının-۱۸
.yağması

Şərqdən ay kimi işıq sacan, iki tərəfi bir-birindən ayrı və parıltısı göz qamaşdıran bir-۱۹
.ulduzun çıxması

.Dünyanın fitnə-fəsadla dolması-۲۰

.İnsanların namaz qılmaması və şəhvətə qurşanması-۲۱

.cirkin işlərin yaxşı, yaxşı işlərin isə çirkin kimi qələmə verilməsi-۲۲

.Düz danışanların yalan, yalan danışanların isə düz danışanlar kimi qəbul edilməsi-۲۳

.Uşaqların (savadsızların) minbər üstündə əyləşməsi-۲۴

.Fəqirlərin təhqir edilməsi-۲۵

.Kişilərin kişilərlə və qadınların da qadınlarla cinsi əlaqədə olması-۲۶

.Kişilərin özlərini qadınlara və qadınların kişilərə oxşatması-۲۷

.Məscidlərin yəhudi məbədləri kimi qızılla bəzədilməsi-۲۸

.Quranların zinət sayılması-۲۹

.Kişilərin özlərini qızıl-gümüşlə bəzəməsi-۳۰

.Dinə həqarət, dünyaya isə əzəmət gözü ilə baxmaq-۳۱

.Təlaqın çoxalması-۳۲

.Kənizlərin xanəndə olması, musiqi alətlərinin və qumar oyunlarının çoxalması-۳۳

.Ticarət və riya məqsədilə həccə getmək-۳۴

.Quranın və elmin Allahdan qeyrisinə xatir öyrənilməsi-۳۵

.Zinadan olan övladların çoxalması-۳۶

.Bəzi müharibələrin səmada baş verməsi-۳۷

Camaatın bir-birlərini körmədikləri halda, çox uzaq yerlərdən bir-birləri ilə söhbət-۳۸ .etməsi

.Dünya elminin inkişafının son həddinə çatması və insanların səmalara səfər etməsi-۳۹

(Uşaqların əzab-əziyyətə məruz qalması və qadınların rəhbərlik etməsi.(۱-۴۰

## PEYĞƏMBƏRLƏR VƏ İMAMLARDAN QIRX MÖCÜZƏ VƏ KƏRAMƏT

:Həzrət İbrahim (ə)-ın möcüzəsi

.Allahın iznilə quşları diriltməsi-۱

.Atəşin ona soyuq olması-۲

İti bıçağın həzrət İsmail (ə)-ın başını kəsməməsi və onun əvəzinə asimandan-۳ .göndərilən bir qoyunun qurbanlıq edilməsi

:Həzrət Nuh (ə)-ın möcüzəsi

.Möminlərə nicat verən, kafirləri isə qərq edən gəmi-۴

:Həzrət Hud (ə)-ın möcüzəsi

.Güclü külək nəticəsində Hud qövmünün həlak olması-۵

:Həzrət Saleh (ə)-ın möcüzəsi

.Dağın içindən diri dəvənin çıxarılması-۶

:Həzrət Lut (ə)-ın möcüzəsi

.Səmadan Lut qövmünün üstünə kiçik daşların tökülməsi-۷

:Həzrət Musa (ə)-ın möcüzəsi

.Əsanın əjdəhaya çevrilməsi-۸

۹- Əlini qoltuğundan çıxartdıqda, onun işıq saçması.

səh:۸۶

---

۱- [۳۸۹] Bu fəsil Şeyx Abbas Qumminin “Müntəhəl-amal” kitabının “Sahibəz-Zəman (ə)-ın həyatı” bölümündən iqtibas edilmişdir.

.Fironçuların quraqlığa düçar olub, həlak olmaları-۱۰

.Firon qövmünün əkin sahələrinin bəlaya tutulması-۱۱

.Fironçuların Nil çayında qərq olması-۱۲

.Fironçuların başlarında bitlərin əmələ gəlməsi-۱۳

.Fironçuların qurbağa və ağcaqanadların bəlasına düçar olması-۱۴

.Fironçuların qana düçar olması-۱۵

:Həzrət Şüeyb (ə)-ın möcüzəsi

Allah tərəfindən asimani bir səsin göndərilib, həzrət Şüeyb (ə)-ın qövmünü həlak-۱۶ .etməsi

:Həzrət Yəqub (ə) və həzrət Yusif (ə)-ın möcüzəsi

Canavarın dil açıb danışması. Belə ki, o, Allahın iznilə demişdi: "Peyğəmbərləri-۱۷ ".yemək (bizə) haramdır

Həzrət Yəqub (ə)-ın gözlərinin – oğlu həzrət Yusif (ə)-ın köynəyini gözlərinə-۱۸ .sürtməklə – açılması

Körpənin beşikdə danışması; o, dil açıb demişdi: "Əgər köynək qabaq tərəfdən-۱۹ ".cırılıbsa, Züleyxa; yox əgər arxa tərəfdən cırılıbsa, Yusif (ə) düz deyir

.Kor qadının (Züleyxanın) gözlərinin Allahın iznilə açılıb, cavan olması-۲۰

:Həzrət Süleyman (ə)-ın möcüzəsi

.Heyvanların və quşların dilini başa düşmək-۲۱

.Quşların ona tabe olması-۲۲

.cinin bir göz qırpımından da tez bir zamanda Bilqeysin taxtını gətirməsi-۲۳

.Qızmış misi maye hala salması-۲۴

.cinlərin ona tabe olması-۲۵

:Həzrət İsa (ə)-ın möcüzəsi

.O həzrətin ata olmadan dünyaya gəlməsi-۲۶

.Beşikdə ikən dil açıb danışması-۲۷

.Palçıqdan bir quş surəti düzəldib, ona öz nəfəsini üfürməklə quşa çevirməsi-۲۸

.Allahın izni ilə anadangəlmə kor və xora xəstəliyinə tutulanlara şəfa vermək-۲۹

.Allahın iznilə ölüləri diriltmək-۳۰

.Camaatın evlərində yedikləri şeylərdən xəbər vermək-۳۱

.Öz qövmü üçün səmavi süfrə gətirmək-۳۲

:Həzrət Peyğəmbəri-Əkrəm (s)-in möcüzəsi

.Qurani-kərim-۳۳

.İmam Əli (ə)-ın əsr namazını qılması üçün günəşi geri qaytarması-۳۴

.(Ayı iki yerə bölmək (Şəqqül-qəmər-۳۵

:İmam Əli (ə)-ın kəraməti

.Canavar və qazlarla söhbət etməsi və günəşin o həzrətə salam verməsi-۳۶

.cinlərdən beyət alması-۳۷

.Fərat çayındakı balıqların o həzrətə salam verməsi-۳۸

:İmam Səccad (ə)-ın kəraməti

Həcərül-əsvədin (qara daşın) o həzrətin imamətinə şəhadət və daşın, ağacın ona-۳۹

.salam verməsi, onun əmrilə ağacın hərəkətə gəlməsi

.Ağacın qılınca çevrilməsi və kiçik daşların təsbih deməsi-۴۰

## PEYĞƏMBƏR (S)–İN NƏHY ETDİYİ VƏ MƏKRUH SAYDIĞI (BƏYƏNMƏDİYİ) QIRX ƏMƏL

Allah–taala “Həşr” surəsinin ۷–ci ayəsində buyurur: “Rəsulumuzun sizin üçün gətirdiyi hər bir şeyi qəbul edin və qadağan etdiyi bütün şeylərdən uzaq olun.”

۱–Qızıl və gümüş qabda xörək yemək..

۲–Heyvanı yandırmaq.

۳–cinsi əlaqə zamanı üzü qibləyə olmaq.

۴–Kişilərin ipək paltar geyinməsi..

۵–Kişilərin qızıl üzük taxması..

۶–Cadugərlərə müraciət etmək.

۷–Nərd oynamaq, tar və tənbur(۱) çalmaq.

۸–Qeybət etmək və ona qulaq asmaq.

۹–Xəbərçilik etmək və xəbərçi edənə qulaq asmaq.

۱۰–Günaha sövq edən məsələlər haqqında danışmaq.

۱۱–Sələm almaq və yalandan şəhadət vermək.

۱۲–Tualetdə üzü qibləyə oturmaq.

۱۳–Yuxunu nəql edərkən yalan danışmaq.

۱۴–Cənabətli halda məsciddə oturmaq.

۱۵–Qəzəblənmək və başqaları ilə əlaqəni kəsmək.

۱۶–Təkəbbürlə yol getmək.

۱۷–Qadının mehriyyəsi barəsində zülm etmək.

۱۸-Şəhadəti gizləmək.

۱۹-Qonşuya əzab-əziyyət vermək.

۲۰-Yoxsul bir müsəlmanı təhqir etmək.

۲۱-Naməhrəmə baxmaq.

۲۲-Əza məclislərində qadının növhə deməsi və ona qulaq asmaq.

۲۳-Fırıldaqçılıqla məşğul olmaq və insanları aldatmaq.

۲۴-Həyat yoldaşına əzab-əziyyət vermək.

۲۵-Pis işləri kiçik saymaq, nəzərə kiçik gəlsə də belə.

۲۶-Heyvanın ayaqlarını (çubuqla) vurmaq.

۲۷-Ev əşyalarını qonşudan əsirgəmək.

۲۸-Meyvəni yetişməmişdən qabaq satmaq.

۲۹-Cənabət halında yemək.

۳۰-Hamamda misvak vurmaq.

۳۱-Ağız və ya burun suyunu məscidə atmaq.

۳۲-Məscidi keçid yolu qərar vermək.

۳۳-Yola və barlı ağacın altına bövl etmək.

۳۴-Suya bövl etmək.

۳۵-Bal arısını öldürmək.

۳۶-Allahdan qeyrisinə and içmək.

۳۷-İmam cümənin xütbə oxuduğu vaxt söhbət etmək.

.Misdən, yaxud dəmirdən düzəldilmiş üzük taxmaq-۳۸

.Heyvanlar kimi su içmək-۳۹

.Yeyməyi isti-isti yemək-۴۰



---

.Simli şərq musiqi alətlərindən biridir [۳۹۰] -۱

## QEYBƏT VƏ EYB AXTARMAQ

۱- Şübhəsiz ki, qeybət böyük günahlardan biridir və böyük günahlara batmış şəxslərin yeri də cəhənnəmdir. İmam Sadiq (ə) bu barədə buyurmuşdur: “Böyük günahlar onlardır ki, Allah-taala cəhənnəm odunu onlar üçün vacib etmişdir.”(۱)

۲- Allah-taala Qurani-kərimdə buyurmuşdur: “Vay olsun, qeybət edib (üzdə) tənə vuran hər kəsin halına!”(۲)

۳- Allah-taala başqa bir ayədə belə buyurmuşdur: “(Bir-birinizin eybini, sirrini) arayıb axtarmayın, bir-birinizin qeybətini etməyin! Sizdən biriniz ölmüş qardaşının ətini yeməyə razı olarmı?! (Yəqin ki,) hamınız bu işdən ikrah edirsiniz.”(۳) (Deməli, bilin ki, qeybət etmək ölmüş din qardaşının ətini yemək kimidir. Ondan çəkinin!)

۴- Cabir ibni Abdullah və Əbu Səid Xudri həzrət Peyğəmbər (s)-in belə buyurduğunu nəql etmişlər: “Qeybətdən çəkinin, qeybət zinadan daha pisdir; çünki zinakarın tövbə edib günahının bağışlanması mümkündür, qeybət sahibindən halallıq alınmamış günahın bağışlanması isə qeyri-mümkündür.”(۴)

۵- İmam Sadiq (ə) buyurmuşdur: “Qeybət etmək hər bir müsəlmana haramdır. Alov odunu yandırıb kül etdiyi kimi, qeybət də insanın yaxşı əməllərini yandırıb kül edir.”(۵)

۶- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Qiyamət günü sizdən birinin əməllərinə baxmaq üçün məhşər səhnəsinə gətirib əməl dəftərini ona verərlər. O, özünün əməl dəftərinə baxanda yerinə yetirmiş olduğu xeyir əməllərdən heç birini orada görməyib deyər: “İlahi, bu mənim əməl dəftərim deyildir. Çünki yerinə yetirdiyim saleh əməllərdən və ibadətlərdən heç biri onda yazılmamışdır.” Ona deyilər: “Sənin Allahın səhvə düçar olmaz, heç bir şeyi unutmaz. Bu elə sənin əməl dəftərindir; lakin qeybət etdiyinə görə sənin yaxşı əməllərin pisliyinə danışıb qeybətini etdiyin şəxsin əməllərinə əlavə olunmuşdur.” Sonra başqa bir adamı gətirib əməl dəftərini ona verərlər. O, öz əməl dəftərinə baxarkən orada çoxlu yaxşı əməllərin və ibadətlərin yazıldığını görüb təəccüblə deyər: “İlahi, bu mənim əməl dəftərim deyildir! Mən burada yazılmış xeyir işləri və ibadətləri dünyada yerinə yetirməmişəm.” Ona deyilər: “Filankəs sənin qeybətini etdiyinə görə, onun xeyir əməlləri sənin əməl dəftərinə

(yazılmışdır."(۶

İmam Əli (ə) buyurmuşdur: "Ən pis adam odur ki, başqalarının eybini axtarsın, amma-۷ (öz eybini görməsin."(۷

İmam Sadiq (ə) buyurmuşdur: "Hər kim bir möminin abır-həyasını aparmaq və eybini-۸ axtarmaq, onu xalqın gözündən salmaq üçün onun əleyhinə danışarsa, Allah-taala belə bir şəxsi Öz himayəsindən çıxarıb Şeytanın himayəsinə atar, heç Şeytan da onu (qəbul etməz."(۸

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Qeybətin müsəlmanın dininə qoyduğu-۹ təsir, bədənindəki yaranın təsirindən (yaranın daha dərinə işləməsindən) daha (güclüdür."(۹

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "Xoş olsun o şəxsin halına ki, öz eybi-۱۰ "!onu başqalarının eybini axtarmaqdan saxlasın

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: "İnsandan bir hadisə baş-۱۱ verməyincəyə qədər məsciddə oturub, namazının vaxtını gözləmək ibadətdir." (Soruşdular: "O nə hadisədir?" Həzrət buyurdu: "Qeybət!"(۱۰

səh:۸۹

---

.Üsuli-kafi", ۲-ci cild, səh. ۲۷۶, hədis: ۱" [۳۹۱] -۱

.Hüməzə" surəsi, ۱-ci ayə" [۳۹۲] -۲

.Hücərat", surəsi, ۱۲-ci ayə" [۳۹۳] -۳

.Vəsailuş-şiə", ۸-ci cild, səh. ۶۰۱" [۳۹۴] -۴

.Məhəccətul-beyza", ۵-ci cild, səh. ۲۵۵" [۳۹۵] -۵

.Biharul-ənvar", (Beyrut çapı), ۷۲-ci cild, səh. ۲۵۸" [۳۹۶] -۶

.Qürərül-hikəm", səh. ۲۸۷, hədis: ۵۷۳۹" [۳۹۷] -۷

.Vəsailuş-şiə", ۸-ci, səh. ۵۰۸" [۳۹۸] -۸

.Cameus-səadət", ۲-ci cild, səh. ۳۰۴" [۳۹۹] -۹

.Üsuli-kafi", ۲-ci cild, səh. ۳۸۷" [۴۰۰] -۱۰

١٢- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Əməllərinin qoruqçusu olan məmurlar (mələklər) insanın günəş kimi nur sacan əməlini yuxarı apardıqda, əməlləri qəbul edib ən yüksək dərəcəyə çatdıran mələk deyər: “Bu əməli sahibinin başına çırpın, çünki Allah-taala tərəfindən mənə tapşırıq verilib ki, qeybət edənlərin yaxşı əməllərini geri qaytarıb Allah dərgahına aparılmasına mane olum.”(١)

١٣- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Behişt üç nəfərə haramdır: Sözgəzdirənə, qeybət edənə və həmişə şərab içənə.”(٢)

١۴- İmam Baqir (ə) Peyğəmbər (s)-in belə buyurduğunu nəql etmişdir: “Hər kimdə üç xislət və yaxud onlardan biri olarsa, Allahın lütf sayəsindən başqa bir sayənin olmadığı qiyamət günü İlahi ərşin sayəsində (kölgəsində) olar: Özünə rəva biləni başqalarına da rəva bilən, Allahın razılığını və ya qəzəbini bilmədən heç bir işə qol qoymayan və özündə olan eybi tərk etməmiş, başqalarında o eybi axtarmayan. Çünki hər kəs özündən bir eybi uzaqlaşdırarsa, şübhəsiz ki, özündə başqa bir eyb görəcəkdir. Hər kəsin başı özünə (öz eyblərinə) qarışarsa, başqalarında eyb axtarmağa macal tapmaz.”(٣)

١۵- Allah-taala Musa ibni İmrana belə vəhy göndərdi: “Qeybət edən şəxs əgər tövbə edərsə, behiştə daxil olan axırıncı; yox əgər tövbə etməzsə, cəhənnəmə daxil olan birinci şəxs olar.”(۴)

١۶- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Qeybət etməklə xalqın ətini yeyən şəxs halalzadə olduğunu yalandan deyir; çünki qeybət cəhənnəm itlərinin yemidir.”(۵)

١٧- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Ey dildə iman gətirib, qəlbi ilə iman gətirməyənlər! Müsəlmanların qeybətini edib gizli eyblərini aramayın. Çünki hər kim öz din qardaşının gizli eyblərini arayarsa, Allah-taala onun gizli sirlərini faş edib onu öz ailəsində rüsvay edər.”(۶)

١٨- Aişə deyir: “Bizim yanımıza bir qadın gəlmişdi, evdən çıxıb gedəndə əlimlə işarə etdim ki, boyu balacadır. Bu zaman Peyğəmbər (s) buyurdu: “Onun qeybətini etdin!”(٧)

١٩- İmam Sadiq (ə) buyurmuşdur: “Mənim ən sevimli və ən yaxşı dostum o şəxsdir ki,

eyblərimi mənə hədiyyə etsin, desin.”(۸)

۲۰- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Qeybətə qulaq asan şəxs qeybət edən iki nəfərdən biridir.”(۹) (Yəni qeybətə qulaq asan qeybət edən kimidir.)

۲۱- İmam Əli (ə) buyurmuşdur: “Qeybəti eşidən adam qeybət edən qədər günah qazanır.”(۱۰)

۲۲- İmam Sadiq (ə) buyurmuşdur: “Müsəlmanın qeybətini etmək küfr, ona qulaq asmaq isə şirkdir.”(۱۱)

۲۳- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Bir kəsin yanında din qardaşının qeybəti edilərsə və o, imkan daxilində onun köməyinə yetişərsə (onu himayə edərsə), Allah-taala dünya və axirətdə onun köməyinə yetişər.”(۱۲)

۲۵- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs öz müsəlman qardaşının ləyaqətini və abır-həyasını qoruyarsa, behişt ona vacib olar.”(۱۳)

səh:۹۰

---

۱- [۴۰۱] “Vəsailuş-şiə”, ۸-ci cild, səh. ۵۹۹.

۲- [۴۰۲] “Kəşfür-rəybə”, səh. ۶.

۳- [۴۰۳] “Xisal”, ۱-ci cild, səh. ۱۰۹, hədis: ۳.

۴- [۴۰۴] “Kəşfür-reybə”, səh. ۱۱.

۵- [۴۰۵] “Biharul-ənvar”, ۷۲-ci cild, səh. ۱۲۵۸.

۶- [۴۰۶] “Kəşfür-reybə”, səh. ۷.

۷- [۴۰۷] “Əl-müstətrif”, ۱-ci cild, səh. ۱۱۶.

۸- [۴۰۸] “Biharul-ənvar”, ۷۶-cı cild, səh. ۲۸۲.

۹- [۴۰۹] Yenə orada, ۷۲-ci cild, səh. ۲۲۶.

۱۰- [۴۱۰] “Qürərul-hikəm”, səh. ۳۰۷.

۱۱- [۴۱۱] “Müstədrəkül-vəsail”, ۲-ci cild, səh. ۱۰۸.

۱۲- [۴۱۲] “Səvabul-əmal”, səh. ۱۷۸.

۱۳- [۴۱۴] “Biharul-ənvar”.

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Bir kəsin yanında din qardaşının-۲۶ qeybəti olunarsa və o, imkanı olduğu halda onu müdafiə etməzsə, Allah-taala dünya (və axirətdə onu özbaşına buraxar (və onu xar edər).”(۱

Mərhum şeyx Səduq, həzrət Peyğəmbər (s)-in buyurduğu bir hədisi (imam Sadiq-۲۷ (ə)-dan) belə nəql etmişdir: “Hər kim imkanı olduğu halda din qardaşının qeybətini (inkar etməzsə, onun günahı qeybət edənin günahından yetmiş dəfə çoxdur.”(۲

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Üç nəfərin qeybətini etmək haram-۲۸ deyildir: Bihudə və batil fikirlərə malik olanın, açıq-aşkar və qəsdən günah edənin, bir (də zülmkar hakimin.”(۳

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Qəsdən və açıq-aşkar günah edənin-۲۹ (qeybəti haram deyildir.”(۴

İmam Sadiq (ə) buyurmuşdur: “Fasiq öz günahını açıq-aşkar göstərmək istəyərsə,-۳۰ (onun hörməti yoxdur, qeybəti isə caizdir.”(۵

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Hər kəs bir müsəlmanın qeybətini-۳۱ edərsə, qeybəti olunan şəxs onu bağışlamayınca, onun oruc və namazı Allah (dərgahında qırx gün qəbul olunmaz.”(۶

İmam Sadiq (ə) buyurmuşdur: “Qeybət etdiyin şəxs (bu işdən) xəbərdar olarsa,-۳۲ (onun yanına gedib halallıq al, əgər xəbərdar olmazsa, onun üçün istiğfar et.”(۷

İmam Musa ibni Cəfər (ə) buyurmuşdur: “Hər kim bir şəxsin arxasınca onun-۳۳ haqqında hamının bildiyi şeyi danışarsa, bu, qeybət deyildir. Hər kəs bir şəxsin arxasınca onun haqqında camaatın bilmədiyi şeyi danışarsa, bu qeybətdir. Hər kəs bir (şəxsin arxasınca onun etmədiyi bir şeyi danışarsa, bu böhtandır.”(۸

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Qeybət, insanın dinini puç etməkdə,-۳۴ (onun bədənində olan xora xəstəliyindən daha güclüdür.”(۹

Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Qeybəti tərk etmək Allah yanında on-۳۵ (min rükət müstəhəb namazdan daha əzizdir.”(۱۰

۳۶- Əbdül-mömin Ənsari deyir: İmam Musa ibni Cəfər (ə)-ın yanına getdim. Məhəmməd ibni Abdullah Cəfəri də onun yanında idi. Mən ona təbəssüm etdim. O dedi: “Onu sevirsənmi?” Dedim: “Bəli, mən onu yalnız sizin razılığınız üçün sevirəm.” Buyurdu: “O, sənin qardaşındır, mömin möminin ata-anası bir olan doğma qardaşı kimidir, baxmayaraq ki, ayrı-ayrı valideynlərin övladlarıdır. Öz din qardaşını müttəhim edən, mömin qardaşını aldadan, ona nəsihət verməyən və mömin qardaşının qeybətini edən şəxslər məlundur.”(۱۱)

۳۷- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Çobanın ağacı silkələyib yarpaqları tökdüyü kimi, qeybət də insanın imanını qolsuz-budaqsız edir.”(۱۲)

۳۸- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Merac gecəsi bir tayfa gördüm ki, öz sifətlərini dırnaqları ilə didirdilər. Cəbraildən soruşdum ki, bunlar kimdir?” Dedi: “Camaatın ardınca qeybət edib onların abır-həyasını tökənlər!”(۱۳)

۳۹- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Mömini söymək günah, onlarla döyüşmək küfr, ətini yemək (qeybətini etmək) haramdır və onun malının ehtiramı qanına ehtiramı kimidir.”(۱۴)

۴۰- Həzrət Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur: “Sələm yolu ilə qazanılan bir dirhəmin günahı Allah dərgahında otuz altı zinadan da böyükdür. Sələmdən daha böyük günah isə müsəlmanların abır-həyasını tökməkdir.”(۱۵)

səh:۹۱

---

۱- [۴۱۵] “Məkasibi-mühərrəmə”, səh. ۴۶.

۲- [۴۱۶] “Mən la yəhzuruhul-fəqih”, ۴-cü cild, səh. ۹.

۳- [۴۱۷] “Ehyau ülumid-din” (Qəzzali), ۳-cü cild, səh. ۱۵۳.

۴- [۴۱۸] “Kənzül-ümmal”, ۳-cü cild, səh. ۹۵۹.

۵- [۴۱۹] “Vəsailuş-şiə”, ۸-ci cild, səh. ۶۰۶.

۶- [۴۲۰] “Məkasibi-mühərrəmə”, səh. ۴۳.

۷- [۴۲۱] “Məhəccətül-beyza”, ۵-ci cild, səh. ۲۷۳.

۸- [۴۲۲] “Üsuli-kafi”, ۲-ci cild, səh. ۳۵۸, hədis: ۶.

۹- [۴۲۳] “Kafi”, ۲-ci cild, səh. ۳۵۷.

